İLHAM RƏHİMLİ

# ŞƏKİ TEATRI



Teatrın təşəkkülü və inkişaf yolu
(1879 – 1933)

Mirzə Ələkbər Sabir adına Nuxa Dövlət
Dram Teatrı (1933 – 1949)

Dram dərnəyi və xalq teatrı
(1949 – 1975)

Sabit Rəhman adına Şəki Dövlət
Dram Teatrı (1975 – 2015)




BAKI – 2016

Elmi redaktor: Ədalət Vəliyev,
sənətşünaslıq doktoru, professor

Elmi rəyçi: Məryəm Əlizadə,
sənətşünaslıq doktoru, professor

Redaktor: Füzuli Mustafayev,
filologiya üzrə fəlsəfə doktoru

Korrektor: Aysel Məmmədova

**İlham Rəhimli. ŞƏKİ TEATRI**
Bakı, Qanun Nəşriyyatı, 2016, 384 səh., 500 tiraj
Çapa imzalanmışdır: 27.05.2016

Qanun Nəşriyyatı
Bakı, AZ 1102, Tbilisi pros., 76
Tel: (+994 12) 431-16-62; 431-38-18
Mobil: (+994 55) 212 42 37
e-mail: info@qanun.az
www.qanun.az
www.fb.com/Qanunpublishing
www.instagram.com/Qanunpublishing

ISBN 978-9952-36-230-5



Professor İlham Rəhimlinin «Şəki teatrı» kitabı müəllifin «Azərbaycan teatrı» silsiləsindən növbəti monoqrafiyasıdır. Sənət ocağının yaradıcılıq salnaməsi «Teatrın təşəkkülü və inkişaf yolu (1879 – 1933)», «Mirzə Ələkbər Sabir adına Nuxa Dövlət Dram Teatrı (1933 – 1949)», «Dram dərnəyi və xalq teatrı (1949 – 1975)», «Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrı (1975 – 2015)» bölmələri üzrə işlənib. Kitabda Şəki teatrının inkişafında xidmətləri olan aktyorlar, rejissorlar, rəssamlar haqqında portret-oçerklər verilib.

# ŞƏKİ TEATR MÜHİTİ

Şəki XVIII əsrdə və XIX əsrin əvvəllərində eyniadlı xanlığın mərkəzi olduğu üçün şəhərdə maarifçilik və mədəniyyət ətraf bölgələrlə müqayisədə daha artıq inkişaf etmişdi. Burada mədrəsə təhsilinə, sonralar yeni tipli məktəb tədrisinə də maraq artıb. Maarifçilik prosesi tədricən genişlənib.

Pedaqoq, gələcəyin dramaturqu Rəşid bəy Əfəndizadə (Əfəndiyev) 1877-ci ildə Tiflisdə xəstə yatan Mirzə Fətəli Axundzadə ilə görüşüb. Mütəfəkkir-filosof bu yeniyetmə oğlana Şəkidə komediyalarından birinin oynanılmasını arzuladığını bildirib.

Sonralar təhsil aldığı müddətdə növbəti dəfə Şəkiyə gələn Rəşid bəy ilk növbədə şəhərdə yeni təhsil sisteminin qurulması ilə məşğul olub. Eyni zamanda dahi mütəfəkkirin istəyini də unutmayıb. Nəhayət, 1879-cu ildə onun rəhbərliyi ilə barama anbarında Mirzə Fətəlinin «Hacı Qara» komediyası oynanılıb. Hacı Qara rolunu Rəşid bəy Əfəndizadə özü ifa edib. Təəssüflər olsun ki, həmin dövrdə Axundzadə artıq həyatda yox idi və öz vətənində əsərinin tamaşaya qoyulmasını eşidib-görmədi.





Rəşid bəy Qori müəllimlər seminariyasında təhsilini başa vurub qayıdandan sonra pedaqoji fəaliyyətlə yanaşı, teatr mühitinin canlanmasında da səmərəli işlər görüb. Şəkinin teatr həvəskarları 1893 – 1900-cü illər arasında Mirzə Fətəli Axundzadənin «Hacı Qara», «Müsyö Jordan və dərviş Məstəli şah», İsgəndər bəy Məlikovun «Yaxşılığa yamanlıq», Nəcəf bəy Vəzirovun «Hacı Qənbər», «Ev tərbiyəsinin bir şəkli», Sultanməcid Qənizadənin «Xor-xor», «Dursunəli və ballıbadı» komediya və vodevillərini oynayıblar. Tamaşalar əsasən bayram günlərində və bəzən müəyyən maarifçilik məqsədilə keçirilən məclis və müsamirələrdə göstərilirdi. Tamaşaların oynanılmasından yığılan pullar məktəb şagirdlərinin qayğılarına xərclənirdi.

1900 – 1918-ci illərdə Şəkidə teatr prosesində dirçəliş artıb. Bu dövrdə şəhərdə yeni məktəblər açılıb. Xaricdə təhsil almış bir neçə ziyalı vətənə qayıdıb. Onlar burada öz ixtisasları üzrə işləməklə yanaşı, maarifçilik tədbirlərində, o cümlədən də teatr tamaşalarının göstərilməsində yaxından iştirak ediblər. A.Səlimbəyov, Mehdi Sadıqov, M.Məmmədov, Məmməd Əhmədov, Cəlil Şərifov, Kərim Əsgərov, Məbud Sərkarov, Ələsgər Nəcəfov, Haşım Məmmədov, M.Lütfəlibəyov, Lütfəli bəy Əmircanov daha fəallıqla çalışıblar.

Göstərdiyim illər ərzində dəfələrlə Mirzə Fətəlinin «Mürafiə vəkilləri»ndən başqa bütün komediyaları, Nəcəf bəy Vəzirovun «Müsibəti-Fəxrəddin», «Hacı Qən-

bər», Əbdürrəhim bəy Haqverdiyevin «Dağılan tifaq», «Bəxtsiz cavan», «Ağa Məhəmməd şah Qacar», Nəriman Nərimanovun «Nadir şah», «Dilin bəlası» («Şamdan bəy»), Namiq Kamalın «Vətən», Şəmsəddin Saminin «Dəmirçi Gavə» dramları, Sultanməcid Qənizadənin, Hüseynqulu Sarabskinin, Vasaq Mədətov-Nəzminin vodevilləri, təbdil olunmuş kiçik həcmli məsxərələr oynanılıb.

Bakı artistləri Hüseynqulu Sarabski, Əbülfət Vəli, Cəlil Bağdadbəyov Şəkiyə qastrola gələndə yerli həvəskarlarla tamaşalar oynamışlar. Tamaşalar Məşədi Yusif Həsənovun evində, «Cəmiyyət evin»də, məktəblərdə göstərilib. Teatr prosesinə şəhərdəki «Müştan» cəmiyyəti də köməklik göstərib. Onların həftədə bir dəfə keçirilən toplantılarında fəal teatr həvəskarları da iştirak ediblər. Bu cəmiyyət kiçik kitabxana da təşkil etmişdi. Kitabxana Bakıda nəşr olunan bir neçə qəzeti müntəzəm alırdı. Səhnə həvəskarları həmin mətbuat nümunələri ilə Bakının teatr prosesindən xəbərdar olur, tamaşaya qoymaq üçün yeni pyeslər seçmək imkanı qazanırdılar.

1920 – 1933-cü illərdə Şəkinin teatr mühitində canlanma və qaynarlıq daha da güclənib. Şəhərdə bir neçə mədəni-maarif müəssisəsi yaradılıb. Teatr həvəskarları həmin yerlərdə tamaşalar hazırlayaraq camaata göstəriblər. Tamaşaların hazırlanmasında, səhnə sənətinin təbliğində, dram dərnəyinə yeni həvəskar gənclərin cəlb edilməsində Baxşəli Axundov (Kazımlı) daha fəallıqla çalışıb. O, yerli müəllimlərin «Ümid çırağı», «Sən bildiyin qoy dursun, gör fələk nə göstərir», «Eşqin nəticəsi» didaktik pyeslərini tamaşaya hazırlayıb. Şəhər camaatının ehtiram əlaməti olaraq «Baxşəli Əfəndi» deyə müraciət etdikləri bu maarifpərvər insanın Şəkidə teatr sənətinin geniş yayılmasında əvəzsiz xidmətləri olub.





Fəhlə klubundan əlavə hərbi və qadınlar klublarında da dram dərnəkləri yaradılmışdı. Bu dərnəklərə Baxşəli Axundov və Cabbar Sadıqov rəhbərlik edirdilər. Bu üç kollektivin həvaskarları bir yerdə ilk dəfə Rəşid bəy Əfəndiyevin «Qan ocağı» dramını tamaşaya hazırlamışdılar.

Sonralar Gəncə Dövlət Dram Teatrının məşhur aktyorlarından olmuş Səməd Tağızadə də öz evində dram dərnəyi açmışdı. Səhnə həvəskarı Məmmədkəbir Hacıoğlunun da dram dərnəyi vardı. Bu iki həvəskar dəstə birləşərək fəaliyyətini davam etdirdi. Tədricən formalaşan kollektiv Mirzə Fətəli Axundzadənin, Nəcəf bəy Vəzirovun, Əbdürrəhim bəy Haqverdiyevin, Süleyman Sani Axundovun, Cəfər Cabbarlının, Jan Batist Molyerin əsərlərinə müraciət edib.

Həmin illərdə dram dərnəyində Zahid Məlikov, Yusif Bədəlov, Salman Bədəlov, Aişə Ələkbərova, Məhruzə Axundova, Suğra Həmidova, Muxtar Mahmud Cəbiyev, Babı Kərim, Həkim Hüseyn, Əbdülcabbar Əliyev, Səyyarə İsmayılova, Nailə İsmayılova, Şirəli İlyasov, Ələşrəf İlyasov, Nəzir Məmmədov, İsmayıl Nəbili, Səməd Tağızadə, Xədicə, Fanya kimi həvəskarlar çalışıblar.

1925-ci ildə Şəkidə Fəhlə fakültəsi klubu açılıb. Açılan gündən burada yeni dram cəmiyyəti yaranıb. «Şəki fəhləsi» qəzeti 1925-ci il 1 dekabr sayında şəhər dram cəmiyyətinin qış mövsümünün repertuarını təqdim edib: «Aydın», «Oqtay Eloğlu» (Cəfər Cabbarlı), «İblis», «Şeyx Sənan» (Hüseyn Cavid), «Ölülər» (Cəlil Məmmədquluzadə), «Leyli və Məcnun», «Əsli və Kərəm», «Arşın mal alan» (Üzeyir bəy Hacıbəyli), «Dəmirçi Gavə» (Şəmsəddin Sami), «Əmir Əbül Üla» (Hüseyn Bədrəddin və Məhəmməd Rüfət), «Eşq və intiqam» (Süleyman Sani Axundov), «Bir tel saçın qurbanı» (Rəşid bəy Əfəndizadə), «Zorən təbib» (Jan Batist Molyer).

Tamaşalar 1-ci, 2-ci və 3-cü hökumət zavodlarının klublarında, Fəhlə fakültəsi klubunda göstərilirdi. 1927 – 1928-ci illərdə Şəki qadınlar klubunda da dram həvəskarları tamaşalar oynayıblar. Daha fəal səhnə aşiqləri Baxşəli Axundov, Mehdi Sadıqov, Həsən Natiq, Əbdülcabbar Əliyev, Zahid Məlikov, Səməd Tağızadə, Mahi xanım, Məryəm xanım, Günəş xanım idi. Tamaşalar əsasən hər həftənin cümə günləri göstərilirdi.

SSRİ xalq artistləri İsmayıl Osmanlı, İsmayıl Dağıstanlı, Azərbaycanın xalq artistləri Məmməd Bürcəliyev, Lütfəli Abdullayev, Sədayə Mustafayeva sənətə ilk addımlarını Şəki dram dərnəyində atıblar.





* * *

*Baxşəli Kazım oğlu Axundov* (1898 – 1985) Şəkinin məşhur mədəniyyət xadimlərindəndir. Şəhərdəki yeni tipli məktəbdə təhsil alıb. Ərəb, fars, rus, fransız dillərini bilirdi. Paris Universitetinin tibb fakültəsində oxuyub. Lakin ailə vəziyyəti ilə bağlı təhsilini yarımçıq qoyub. 1920-ci ildə Şəkidə dram dərnəyi təşkil edib. «Darvaza» adlanan kollektivdə səmərəli fəaliyyət göstərib. Həyat yoldaşı Məhruzə xanım Axundova da dram dərnəyinin fəal üzvü olub. Gələcəyin bir sıra istedadlı aktyorları böyük sənətə Baxşəli Axundovun köməkliyi ilə qədəm basıb.

Mirzə Ələkbər Sabir adına Nuxa Dövlət Dram Teatrının 1933 – 1936-cı illərdə təşkilində, qısa fasilələrlə fəaliyyətinin formalaşmasında cəfakeş mədəniyyət xadimi fədakarlıqla çalışıb. 1937-ci ildə repressiyaya məruz qalaraq haqsız yerə tutulub və 1947-ci ilə kimi Sibirdə həbsdə olub. Həbsdən qayıtdıqdan sonra yenə mədəniyyət sahəsində çalışıb. 1956-cı ildə bəraət alan Baxşəli Axundov Şəki ibtidai musiqi məktəbinin, Şəki Musiqi Texnikumunun təşkilində səylə çalışıb. Şəki Dövlət Diyarşünaslıq Muzeyini yaradıb.

Baxşəli Axundov 1985-ci ildə Şəkidə vəfat edib.

«Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə. Tamaşadan səhnə. 1922-ci il



«Arşın mal alan», Üzeyir bəy Hacıbəyli. Süleyman – Zahid Məlikov. 1929-cu il



Baxşəli Axundov







Üzeyir bəy Hacıbəylinin «Arşın mal alan» operettasının tamaşasından sonra. 1924-cü il



Şəki dram dərnəyinin üzvləri müxtəlif geyimlərdə. 1928-ci il

## SƏNƏT OCAĞI DÖVLƏT TƏSİSATINDA

Son on iki ildə güclənib formalaşan Şəkinin teatr kollektivinə 1933-cü ildə dövlət statusu verildi. Həmin dövrdə şəhərin adı Nuxa idi. Buna görə də sənət ocağının rəsmi adı belə idi: Nuxa (Şəki) Dövlət Dram Teatrı. Teatra Mirzə Ələkbər Sabirin adı verildi. Bilal Əhmədov teatra direktor, Əlihüseyn Rzayev baş rejissor təyin edilmişdilər. Truppada yerli həvəskarlarla yanaşı, gələcəyin xalq artistləri Əli Zeynalov, Rəmziyyə Veysəlova, Məmməd Bürcəliyev, gələcəyin əməkdar artistləri Sadıq Saleh, Səməd Tağızadə də vardı.

Əlihüseyn Rzayev (1891 – 1936) Şəkiyə Akademik Milli Dram Teatrından dəvət olunmuşdu. Rejissor Bakı teatrında «Hacı Qara» (Mirzə Fətəli Axundzadə), «Pəri cadu» (Əbdürrəhim bəy Haqverdiyev), «Şeyx Sənan» (Hüseyn Cavid), «Müfəttiş» (Nikolay Qoqol), «Qaçaqlar» (Fridrix Şiller) tamaşalarına orijinal formalı quruluşlar vermişdi. O, Şəki teatrında Aleksandr Şirvanzadənin «Namus» əsərini hazırlayıb. Ancaq 1933-cü ilin qışında





ağır xəstələndiyinə görə Bakıya qayıtmalı olub. Kollektiv tamaşaçıların görüşünə Cəfər Cabbarlının «1905-ci ildə» dramının tamaşası ilə gəldi. Sonra «Namus» göstərildi.

Arada müəyyən yaradıcılıq çətinlikləri və texniki kasadlıq ucbatından teatr fəaliyyətini dayandırdı. Qısa fasilədən sonra Dövlət Dram Teatrı 1936-cı ildə fəaliyyətini bərpa etdi. Mirzə Fətəli Axundzadə adına Bakı Teatr Məktəbinin buraxılış kursunun tələbələri Şəki Dövlət Dram Teatrına göndərildilər. Kursun rəhbərləri, fədakar aktyor, rejissor və təşkilatçılar Cəlil Bağdadbəyov və pedaqoq, rejissor Həsən Əliyev də onlarla birgə Şəkiyə gəldilər.

Məktəbin Şəkiyə gələn müdavimləri bunlar idi: Yusif Vəliyev, Qafar Qafarov, Kamil Qubuşov, Məzahir Əmirov, Zahid Zeynallı, Əliməmməd Novruzov, Sərxan Mustafayev, Rza Sarabski, Hacıbaba Səlimov, Məmməd (Məhəmməd) Xalıqov, Abbas Hüseynov, Həsən Hüseynov, Məhərrəm Cavanşirov, Fərəc Cavanşirov, Böyükxanım Axundova (soyadı Qubuşova da yazılıb), Gülrux Zahidova, Xalidə Məmmədova, Xeyransa Şabayeva...

Yerli həvəskar aktyorlardan Baxşəli Axundov, Məmmədkəbir Hacıoğlu, Bilqeyis Ələsgərova, Əminə Poqosova başda olmaqla, bir qrup istedadlı səhnə aşiqi də truppaya qəbul edildilər. Kollektiv Cəfər Cabbarlının «Sevil», Aleksandr Korneyçukun «Polad Qartal» («Platon Kreçet». Təbdil edənlər Mustafa Mərdanov və Ülvi Rəcəb) dramlarını və Üzeyir bəy Hacıbəylinin «Arşın

mal alan» operettasını tamaşaya hazırladı. «Arşın mal alan» daha uğurlu alınmışdı.

Teatr açılışa çox ciddi hazırlaşmışdı. Rayonun mədəni həyatında böyük hadisə olan açılışı mətbuat yüksək qiymətləndirirdi. Açılışdan dörd gün əvvəl şəhər qəzeti teatrın fəaliyyətinin bərpa olunmasına qoşa səhifə həsr etmişdi (bax: Nuxa Dövlət Dram Teatrı açılışa hazırdır. – «Nuxa fəhləsi», 11 fevral 1937). Həmin səhifədə yaradıcı heyətin bəzi üzvlərinin ürək sözləri verilmişdi.

*Həsən Əliyev, teatrın direktoru və baş rejissoru:* «Mən əminəm ki, bu gənc aktyorlar kollektivindən ibarət olan Nuxa Dövlət Teatrosu partiya və hökumətin onlara bəslədiyi qayğını layiqi ilə doğruldacaqdır».

*Rza Sarabski, rejissor, aktyor:* «Biz Nuxaya yola düşən zaman mənə «Yağışdan çıxdıq, yağmura düşdük» tamaşasının laborantlığı və tərtibatı tapşırıldı. Mən həmin əsərin bütün dərinliklərinə varmaqla, əsərin müəllifi Vəzirov və onun mühiti ilə dərindən tanış olmağa çalışdım».

*Gülrux Zahidova, aktrisa:* «Mənim ta uşaqlıqdan arzuladığım və indi nail olduğum sənətimi var qüvvəmlə yüksəldəcək, oynayacağım bütün rolların üzərində ciddi çalışacağam».

*Kamil Qubuşov, aktyor:* «Çoxdan bəri arzuladığım məqsədimə çatmışam. Bu gün Sabir adına Nuxa Dövlət Dram Teatrosunda bir aktyor olmaqla daha çox sevinirəm».

*Böyükxanım Axundova, aktrisa:* «Mən bir türk qızı olaraq... xoşbəxt ölkədə öz sevincimə, arzuma nail olmuşam. O da bu gün Nuxa Dövlət Dram Teatrosunda çalışmaqdan ibarətdir».





*Məmməd Xalıqov, aktyor:* «Hökumətin məni 25 nəfər yoldaşımla birlikdə Nuxa teatrosuna göndərməyi mənə daha artıq yaradıcılıq inkişafı üçün imkan verdi. Zira mən 4 il təhsil aldığım müəllim və yoldaşlarımla birlikdəyəm».

*Həsən Hüseynov, aktyor:* «Leninqradda ali teatro təhsili almış müəllimim Həsən Əliyevin rejissorluğu altında teatro məktəbi proqramı üzrə aldığım bilik məni bu sahəyə daha da möhkəm bağladı. Mən bu il Nuxa teatrosuna gəlməyimə daha çox sevinirəm».

*Zahid Zeynallı, aktyor:*

«Sənət dedikləri gül bağçasından
Yaranmış köksümdə bir yeni gülşən.
Bu gülşən xalqıma ilk hədiyyədir,
Azad sənətimdən yeni busədir».

*Qafar Qafarov, rejissor assistenti:*

«Mən bu günəşli ölkədə müdam
Sənətimə qarşı böyük ehtiram
Edərək qoşuram əməldaşımla
Bir məqsəd ardınca hər an, sübhü-şam».

Teatr növbəti bərpadan sonra ilk pərdələrini 1937-ci il fevral ayının 15-də Nəcəf bəy Vəzirovun «Hacı Qənbər» komediyasının tamaşası ilə açdı. Şən və oynaq tamaşa alınmışdı.

Kollektivin ilk uğurlu tamaşalarından biri Cəfər Cabbarlının «Sevil» dramı idi. Əsər teatrın diqqətini ilk növbədə siyasi-ictimai aktuallığı ilə cəlb etmişdi. İdeya bir qədər çılpaq olsa da, «Sevil» tamaşası bədii cəhətdən cəlbedici, aktyor ifasına görə maraqlı idi. Tamaşanın tərtibatı yığcam alınmışdı, pərdələr arasında onları dəyişmək çox vaxt aparmırdı. Tamaşada müəyyən dinamika vardı. İdeya-bədii cəhətdən «Sevil» teatrın daha bitkin tamaşası idi.

«Sevil»də əsas personajları Gülrux Zahidova (Sevil), Yusif Vəliyev (Balaş), Gülüş Quliyeva (Gülüş), Böyükxanım Axundova (Dilbər), Abbas Hüseynov (Məmmədəli bəy), Sərxan Mustafayev (Əbdüləli bəy), Cəlil Bağdadbəyov və Həsən Hüseynov (Babakişi), Məmməd Xalıqov və Məmmədkəbir Hacıoğlu (Atakişi), Xeyransa Şabayeva (Tafta), Xeyrəddin Mehdiyev və Nazim (Gündüz) ifa edirdilər. Dramaturji dilin sadəliyi və aktyorların real ifaya ciddi maraq göstərmələri tamaşanın baxımlılığını artırmışdı.

Teatr 1937 – 1938-ci il teatr mövsümünü 1937-ci il noyabr ayının 7-də Cəfər Cabbarlının «1905-ci ildə» dramının tamaşası ilə açdı. İlk üç-dörd ildə Mirzə Fətəli Axundzadənin «Hacı Qara», Əbdürrəhim bəy Haqverdiyevin «Pəri cadu», Cəfər Cabbarlının «Almaz», Mirzə İbrahimovun «Həyat», Aleksandr Şirvanzadənin «Namus», Aleksandr Ostrovskinin «Günahsız müqəssirlər», Maksim Qorkinin «Həyatın dibində» əsərləri tamaşaya qoyuldu. Həmin müddətdə teatrın bədii rəhbəri Həsən





Əliyev idi. Oynanılan tamaşaların əksəriyyəti onun rejissorluğunda hazırlanmışdı. Həsən Əliyev quruluş verdiyi əsərləri aktyor tamaşaları kimi təqdim etməyə daha çox səy göstərirdi. Bunun da nəticəsində aktyor münasibətlərində ansambl birliyinə nail olmaq vərdişləri güclənirdi.

Kollektivin müəyyən yaradıcılıq uğurlarına baxmayaraq, teatrın forma-məzmun axtarışlarında uğursuzluqlar da özünü göstərirdi. Aktyor ifalarında nəzərə çarpan nailiyyətlərlə müqayisədə teatrın forma tapmaq səylərində müasirlikdən geri qaldığı hiss olunurdu. Təbii ki, tərtibatların primitivliyi həm tamaşanın bədii-estetik səviyyəsinə pis təsir göstərir, həm də aktyorların səhnədə sərbəst davranışlarına, hərəkət plastikasının emosional təsir bağışlamasına mane olurdu.



Premyerası 1937-ci il noyabrın 7-də göstərilən «1905-ci ildə» dramının tamaşasında əsas rolları Zahid Zeynallı (Baxşı), Böyükxanım Axundova (Sona), Xalidə Məmmədova və Səriyyə Həsənova (Gülsüm), Xeyransa Şabayeva (Nabat), Kamil Qubuşov (Eyvaz), Yusif Vəliyev (General-qubernator), Fatma Kərimova (Mariya Timofeyevna), Əli Mənsur (Allahverdi), Cəlil Bağdadbəyov (İmamverdi və Məhkəmə sədri), Məmməd Xalıqov və Həsən Hüseynov (Əmiraslan bəy Salamov), Sərxan Mustafayev (Bahadır bəy), Məmmədkəbir Hacıoğlu və Müslüm Məmmədov (Ağamyan), Yunis Qarabağlı-Məmmədov (Usta Muxan), Məzahir Əmirov (Volodin və Prokuror) oynayırdılar. Siyasi-ictimai motiv güclü olduğu

üçün aktyor ifalarında açıq publisistika üstünlük təşkil edirdi. Həmin janr estetikası dairəsində aktyorların ifası məqbul baxılırdı.

Bununla belə, mətnində müəyyən zəruri görünməyən hissələrdə ixtisar aparılmayan «1905-ci ildə» tamaşası uzun çəkirdi. Bunun da əsas səbəbi o idi ki, dekorlarda ağırlıq vardı və onları pərdələr arasında dəyişmək çox vaxt aparırdı. Tamaşanın sürət-ritmindəki süstlük də ümumi gedişata süstlük gətirirdi. Lakin siyasi-ictimai mövzusuna görə tamaşa repertuarda saxlanılırdı.

Həsən Əliyev 1937-ci il noyabr ayının 12-də «Arşın mal alan»ı yeni quruluşda təqdim etdi. Rejissor köməkçisi Sərxan Mustafayev, rəssam Ələsgər Nağıyev idi. Ələsgər Nağıyev Bakı milyonçusu Musa Nağıyevin varisi idi və sovet dönəmində onun adını çəkmək olmurdu. Buna görə Ələsgər müxtəlif rayon teatrlarında Fərəc və Ələsgər adları ilə aktyor, rəssam, rejissor assistenti kimi fəaliyyət göstərib.

«Arşın mal alan»ın məşqləri «1905-ci ildə» ilə paralel aparılmışdı. İfaçılar operetta üzərində daha məhsuldar işləmişdilər. Ruhən şən ovqatlı «Arşın mal alan» tamaşasında əsas rolları Məmmədkəbir Hacıoğlu (Əsgər), Məmməd Xalıqov (Soltan bəy), Böyükxanım Axundova-Qubuşova (Gülçöhrə), Xalidə Məmmədova (Telli), Həsən Hüseynov (Vəli) oynayırdılar. Tamaşaçılar Telli–Vəli duetini alqışlarla qarşılayırdılar.

Yeri gəlmişkən, qeyd edim ki, teatrın musiqi kollektivində çox az ifaçı vardı. Müxtəlif çalğı alətlərinin sayı





da kifayət qədər deyildi. Buna görə də «Arşın mal alan» və digər musiqili komediyaların partiturası bütün canlılığı və cazibədarlığı ilə səslənmirdi. Bu qüsuru müəyyən mənada ifadəli aktyor oyunları ört-basdır edirdi.

Haqqında söhbət gedən mövsümdə «Sevil» tamaşası, əsas ifaçılar qalmaqla, bir qədər işlənib yenidən repertuara daxil edildi. Tamaşanın ümumi ruhunda elə bir yenilik nəzərə çarpmırdı. Teatr bu addımı sırf ideoloji mövqeyini bir daha nəzərə çatdırmaq üçün atmışdı. Belə səmərəsiz cəhdlər teatr 1949-cu ildə fəaliyyətini dayandırana qədər müxtəlif şəkillərdə özünü göstərirdi.

Teatrın müasir mövzu axtarışlarında tərcümə əsərlərinə də maraq göstərilirdi. Bu baxımdan «Polad Qartal» (bəzi afişa və proqramlarda «Qartal Polad» kimi də yazılıb) nisbətən uğurlu tamaşa idi. Sosial dram janrında hazırlanan tamaşada Yusif Vəliyevin, Məzahir Əmirovun və Sərxan Mustafayevin (Nəsir), Kamil Qubuşovun və Yusif Vəliyevin (Polad Qartal), Müslüm Məmmədovun və Abbas Hüseynovun (Əliş), Məmməd Xalıqovun (Mirzə Loğman), Böyükxanım Axundovanın və Tamara Kərimovanın (Nərgiz), Xalidə Məmmədovanın və Böyükxanım Axundovanın (Şəfiqə) oyunları daha diqqətçəkən idi.

Rejissor bu tamaşada ümumi aktyor ansamblının bütövlüyünə xüsusi cəhd göstərmişdi. Epizod rollarda Xeyransa Şabayeva və Gülrux Zahidova (Nisə), Əlisəttar Yusifzadə və Cəlil Bağdadbəyov (Ələkbər), Tamara Kərimova və S.Qolustova (Leyla), Əliməmməd Novruzov

və Məmmədkəbir Hacıoğlu (Məhəmməd), Zahid Zeynallı (Partkom), Abdulla Əliyev və Yusif Bağırov (Nəim və Assistent), Mahmud Məmmədov (Məsul işçi) inam və səylə oynayırdılar. Əsas ifaçılarla epizod rollarda çıxış edənlərin oyunlarında bağlılıq və estetik tamlıq duyulurdu.

Şəki tamaşaçıları komediyaya daha çox maraq göstərdikləri üçün teatr da bu janrlı tamaşalara üstünlük verirdi. Hətta operettalar da əsasən dramatik komediya kimi oynanılırdı. Nəcəf bəy Vəzirovun «Yağışdan çıxdıq, yağmura düşdük» («Hacı Qənbər») komediyası repertuarda daha çox qaldı. Premyera teatrın qış mövsümünün açılışında, 15 fevralda oldu. Tamaşanın quruluşçu rejissoru Həsən Əliyev, rəssamı Rza Sarabski və rejissor assistenti Qafar Qafarlı idi. Tamaşa əsasən sosial məişət komediyası kimi təqdim edilmişdi. Bununla belə, tamaşanın az da olsa qabarıq görünən ictimai motivləri də vardı.

Qeyd edim ki, 1936 – 1945-ci illərdə Şəki teatrı lüzumsuz yerə repertuarını tez-tez dəyişirdi. Dəyişmənin əsas səbəbi bu idi ki, tamaşaların bir qismi o qədər də uğurlu alınmırdı. Hətta hansısa komediya bir mövsümdə iki müxtəlif quruluşda göstərilirdi. Bu baxımdan «Hacı Qənbər» tamaşasını teatrın uğuru saymaq olardı. Əsər ilk dəfə 1936 – 1937-ci il teatr mövsümündə göstərilib. Ancaq əsaslı bərpa ilə bir neçə mövsümdə də repertuara daxil edilib.





«Hacı Qənbər» tamaşasında teatrın aparıcı aktyorları Məmməd Xalıqov və Sərxan Mustafayev (Hacı Qənbər və Hacı Salman), Xeyransa Şabayeva (Dilbər xanım), Gülrux Zahidova və Xalidə Məmmədova (Cəvahir xanım), Böyükxanım Axundova (Yetər), Əlisəttar Yusifzadə və Əliməmməd Novruzov (Cəbi), Yusif Vəliyev və Həsən Hüseynov (Əşrəf bəy və Qıdı kirvə), Zahid Zeynallı və Əliməmməd Novruzov (Mahmud), Sərxan Mustafayev və Cəlil Bağdadbəyov (Hacı Salman), Abdulla Əliyev (Aşıq Vəli), Müslüm Məmmədov və Abdulla Əliyev (Mayor), Məmməd Məmmədov (Molla Səfi), Məzahir Əliyev və Yusif Bağırov (İmamqulu) çıxış edirdilər.

Dahi rus klassiki Aleksandr Puşkinin ölümünün 100 illiyi münasibətilə teatr bədii kompozisiya hazırlamışdı. Ədibin «Qaraçılar», «Boris Qodunov», «Bağçasaray fontanı», «Yevgeni Onegin» əsərlərindən parçalar oynanıldı, şeirlərindən qiraət söylənildi. Tədbirə musiqi nömrələri də daxil edilmişdi. Sevindirici hal o idi ki, musiqi ifaçıları teatrın aktyorlarından seçilmişdi.

1930-cu illərdə Hüseyn Cavidin pyesləri əsasən Milli Dram Teatrının repertuarında, həmçinin digər sənət ocaqlarında mühüm yer tuturdu. Dramaturqun «Şeyx Sənan» və «İblis» faciələri daha tez-tez yeni quruluşlarda oynanılırdı. Şəki teatrı da Cavid dramaturgiyasına biganə qalmamışdı. Həsən Əliyevin rejissorluğu ilə şair-dramaturqun «Şeyx Sənan» mənzum faciəsi üzərində qızğın iş aparılırdı. Kamil Qubuşov və Sərxan Mustafayev Şeyx Sənan, Böyükxanım Axundova Xu-

mar, Yusif Vəliyev Platon rollarını məşq edirdilər. Qəzet səhifələrində çap olunan kiçik yazılardan, çox sonralar – 1970-ci illərin ortalarında müxtəlif vaxtlarda adını çəkdiyim aktyorlarla söhbətlərimdən belə nəticəyə gəlmək olur ki, «Şeyx Sənan» poetik teatr janrında hazırlanan romantik-monumental tamaşa olub. Hətta bir dəfə tamaşaya daxili baxış olub və müzakirələrdə bəzi qüsurlar göstərilib. Buna görə əsər üzərində əlavə bir neçə məşq aparılması qərarlaşdırılıb. Elə bu ərəfədə Cavidi «xalq düşməni» damğası ilə qanunsuz olaraq həbs etdilər. «Şeyx Sənan» tamaşası hazır olsa da, oynanılmadı. Beləliklə, teatrın böyük bir yaradıcılıq uğuru, neçə-neçə aktyorun sənətkarlıq nailiyyəti tamaşaçılara çatdırılmadı.

1930-cu illərdə müasir həyatdan götürülmüş mövzuları əsasən Cəfər Cabbarlı yazırdı. Onun vaxtsız ölümündən sonra teatrlar çağdaş əsərlər sarıdan müəyyən qıtlıq çəkirdilər. Mirzə İbrahimovun kənd həyatından qələmə aldığı «Həyat» dramı 1937-ci ildə Milli Dram Teatrında göstəriləndən sonra digər sənət ocaqları da bu əsəri öz repertuarlarına daxil etdilər. Şəki teatrında əsərə quruluşu Həsən Əliyev vermişdi (9 mart 1938). «Həyat» həm ideya-bədii dürüstlüyü, həm mövzuya yanaşmanın müasirliyi, həm də bədii kompozisiya tamlığı ilə maraq doğururdu.

Tamaşada maraqlı aktyor ansamblı vardı. Belə bir ansambl tamlığı tamaşanın əsas uğurunu təminatlandırmışdı. Böyükxanım Axundova və Səriyyə Həsənovanın (Həyat), Yusif Vəliyev və Kamil Qubuşovun (Süleyman), Tamara Kərimovanın (Atlas), Sərxan Mustafayevin (Heydərqulu), Əliməmməd Novruzov və Həsən Hüseynovun (Pardon Qurbanəli), Cəlil Bağdadbəyovun (Məşədi Hüseyn), Məzahir Əmirovun (Abbas), Əli Mənsur və Həsən Hüseynovun (Həsənov) ifalarında yüksək peşəkarlıq özünü göstərirdi. Yusif Vəliyevin ifadə vasitələri dolğunluğu və kolorit zənginliyi, Sərxan Mustafayevin obrazı tipik səciyyəsi, Cəlil Bağdadbəyovun oyunu psixoloji dürüstlüyü, Tamara xanımın ifası plastik zərifliyi, Əliməmməd Novruzovun rolu səmimi reallığı ilə könül oxşayırdı.

Epizod rollarda Məmmədkəbir Hacıoğlu (Qurban kişi), Abbas Hüseynov (Akif), Şirəli Allahyarov (Xəlil), Mahmud Məmmədov (Musa və Komandir), Xeyransa Şabayeva (Tərlan), F.Mustafayeva və Gülüş Quliyeva (Rəxşəndə), Zahid Zeynallı (Rauf), Əlisəttar Yusifzadə və Abdulla Əliyev (Zeynal), Bilqeyis Ələsgərova (Xanım xala və Atlasın anası), Yunis Qarabağlı (Doktor), Əbdülcabbar Əliyev və Məmməd Xalıqov (Tamada), Nurəhməd Hümmətov (Cəlal), Bəkir Məmmədov və Əliməmməd Novruzov (Tofiq), T.Məmmədova (Şəfqət bacısı) maraqlı oyun nümayiş etdirirdilər.

Əksər ifaçıların oyununu bəyənən tənqid qüsurlu aktyor işlərini də nəzərdən qaçırmayıb. «Abbas rolunda Məzahir Əmirov, Məşədi Hüseyn rolunda Cəlil Bağdadbəyov, Pardon Qurbanəli rolunda Əliməmməd Novruzov, Qurban kişi rolunda Məmmədkəbir Hacıoğlu

yoldaşları xüsusi qeyd etmək lazımdır. Onlar öz rolları üzərində diqqətlə çalışdıqlarından böyük bir enerji ilə oynayırlar və bu tiplərin bütün xüsusiyyətlərini ustalıqla göstərirlər...

Həyat rolunda səhnəyə çıxan Səriyyə Həsənova yoldaş Həyatın bütün xüsusiyyət və xarakterini hələ lazımınca mənimsəyə bilməmişdir... Həsənov rolunu Əli Mənsur yoldaş o qədər də yaxşı oynamır, həddindən artıq hərəkətlər göstərir, uyğunsuz yerə çığır-bağır edir, yersiz olaraq tullanıb-düşür, artıq dərəcədə yüngüllük göstərir. Bu da o tipin xarakter və xüsusiyyətlərini itirmiş olur» (1).

Teatr 1939-cu il noyabr ayının 7-də «Həyat»ı yeni quruluşda oynadı. Tamaşanın quruluşçu rejissoru Əsəd Cəfərov (Talışoğlu), rəssamı Ələsgər Bağırov, rejissor assistenti Məmməd Xalıqov, texniki rejissoru İbrahim Azəri idi. Yeni quruluşda əsas rolları Məmmədkəbir Hacıoğlu və İbrahim Azəri (Süleyman), Yusif Vəliyev (Abbas), Qulam Qoşqarlı (Həsənov), Əyyub Məmmədov (Rauf), Məmməd Xalıqov (Məşədi Hüseyn), Tamara Kərimova (Atlas), Bəkir Məmmədov (Akif), Səriyyə Həsənova və S.Şahbazova (Həyat), T.Cəfərova (Atlas), Heybət Hümbətov (Cəlal) oynayırdılar. Bu quruluşda Məmmədkəbir Hacıoğlu daha uğurlu aktyor ifası nümayiş etdirirdi (bax: 2).

Dram və komediyalarla bərabər, teatr melodrama xarakterli əsərlərə də maraq göstərirdi. «Namus» dramı 1937 – 1938-ci il teatr mövsümündə Ələsgər





Nağıyevin (rejissor assistenti Hacıbaba Səlimov), 1938 – 1939-cu il mövsümündə Əziz Ərşi və Məmməd Xalıqovun (rəssamlar Əziz Ərşi və Ələkbər Bağırov) quruluşlarında repertuara daxil edilib. Birinci quruluşda Yusif Vəliyev və Kamil Qubuşov (Seyran), Məmmədkəbir Hacıoğlu (Rüstəm), Böyükxanım Axundova və Tamara Kərimova (Süsən), Cəlil Bağdadbəyov (Barxudar), Sədayə Mustafayeva (Süsənbər), Bilqeyis Ələsgərova (Sənəm və Məryəm), Xeyransa Şabayeva (Gülnaz), Xalidə Məmmədova (Şpanik), Mahmud Məmmədov və Səttar İsmayılov (Cahangir), Sərxan Mustafayev (Ağabəy) çıxış edirdilər.

Bakıdan gələn görkəmli aktyor Sidqi Ruhulla Şəki teatrının «Namus» tamaşasında bir neçə dəfə Rüstəm rolunda oynayıb. Gəncə Dövlət Dram Teatrının aktyoru Səməd Tağızadə də Şəkiyə gələrək Uilyam Şekspirin «Otello» (Otello) və Səməd Vurğunun «Vaqif» (Vaqif və Qacar) tamaşalarında yerli aktyorlarla çıxış edib. Belə yaradıcılıq mübadiləsi aktyor ansamblına ruh coşqunluğu verir, məsuliyyət hissini gücləndirirdi.

«Namus»un ikinci quruluşu formaca bir qədər dəyişilmişdi. Bəzi tərtibatlar əvvəldə olduğu kimi saxlanılsa da, əsasən yeni dekorlar işlənmişdi. Tərtibatda yenilik cəhdi maraq doğururdu, lakin quruluşun tərtibat ağırlığı aktyorların ifalarına mane olurdu. Yusif Vəliyev, Bilqeyis Ələsgərova, Mahmud Məmmədov, Sərxan Mustafayev, Xeyransa Şabayeva, Tamara Kərimova, Məmmədkəbir Hacıoğlu öz rollarında qalmışdılar. Rejissorlar ona yaxın

epizod personajı əsərdən çıxarmışdılar. Epizodlarda Yunis Qarabağlı (Sərkis), Şirəli Allahyarov (Yeqor) daha inamla oynayırdılar.

Kollektiv Mirzə Fətəli Axundzadənin anadan olmasının 125 illiyinə xeyli müddət hazırlaşdı. Yubiley üçün dramaturqun «Hacı Qara» komediyası seçilmişdi. Kollektiv tamaşa üzərində səylə çalışmışdı. Premyerası 1938-ci il iyul ayının sonlarında göstərilən tamaşanın quruluşçu rejissoru Hacıbaba Səlimov, rəssamı Ələsgər Nağıyev, rejissor assistenti Məmməd Xalıqov idi. Əsas rolları Məmməd Xalıqov və Cəlil Bağdadbəyov (Hacı Qara), Sərxan Mustafayev və Məzahir Əmirov (Heydər bəy), Əziz Ərşi, Zahid Zeynallı və Bəkir Məmmədov (Səfər bəy), Qulam Qoşqarlı və Əli Mənsur (Əsgər bəy), Tamara Kərimova (Sona xanım), Xeyransa Şabayeva və Z.Abdullayeva (Tükəz), Xeyransa Şabayeva, Bilqeyis Ələsgərova və Z.Abdullayeva (Teybə), Məmmədkəbir Hacıoğlu (Kərəməli) oynayırdılar. Epizod personajlarda Yusif Vəliyev (Ohan yüzbaşı), Şirəli Allahyarov (Xəlil yüzbaşı və Karapet), Yunis Qarabağlı (Dərviş), Əbdülcabbar Əliyev (Murov), Əli Sadıqov (Xudaverdi), Abdulla Əliyev (Mkrtıç), Nurəhməd Hümmətov (Arakel) çıxış edirdilər.

Rejissor tamaşaya Dərviş, Birinci aşıq və İkinci aşıq obrazlarını daxil etmişdi. Onun bu «əlavəsi» ideya ilə bağlı deyildi, lakin tamaşada müəyyən şən ovqat yaradırdı.





«Hacı Qara» tamaşası ümumən maraqlı qarşılansa da, komediyanın rejissor həllində və bəzi ifaçıların oyunlarında qüsurlar da vardı (bax: 3). Resenziya müəllifi Hacı Qaranın çaya düşməsi səhnəsinin işlənməsinə, Tamara Kərimovanın, Zahid Zeynallının və Məzahir Əmirovun oyunlarına daha çox irad tutub.

«Arşın mal alan», «Hacı Qara», «Hacı Qənbər» komediyaları ilə yanaşı, kollektiv Üzeyir bəy Hacıbəylinin «O olmasın, bu olsun» («Məşədi İbad») operettasını da repertuara daxil etdi. Məişət komediyası kimi oynanılan tamaşanın səhnə və tərtibat quruluşlarını Ələsgər Nağıyev vermişdi. Tamaşanın bədii rəhbəri Həsən Əliyev, musiqi rəhbəri İbad Rəhmətullayev, rejissor assistenti Hacıbaba Səlimov idi.

«O olmasın, bu olsun» tamaşasında əsas partiyaları Yunis Qarabağlı və Əli Mənsur (Sərvər), Tamara Kərimova (Gülnaz) oxuyurdular. Məşədi İbad rolunu Məmməd Xalıqov, Məmmədkəbir Hacıoğlu və Sərxan Mustafayev oynayırdılar. Hacıoğlunun duzlu və şirəli ifası Üzeyir bəyin ruhuna daha yaxın idi. Qalan obrazları Həsən Hüseynov (Rüstəm bəy), Cəlil Bağdadbəyov və Məzahir Əmirov (İntiligent Həsən), Yusif Vəliyev (Həsənqulu bəy), Kamil Qubuşov və Həsən Hüseynov (Qoçu Əsgər), Zahid Zeynallı və Bəkir Məmmədov (Rza bəy), Xeyransa Şabayeva və Gülüş Quliyeva (Sənəm), Sərxan Mustafayev və Əliməmməd Novruzov (Hambal), Mahmud Məmmədov və Əliməmməd Novruzov (Məşədi Qəzənfər), Əbdülcabbar Əliyev və Ab-

dulla Əliyev (Usta Məhərrəm), Bəkir Məmmədov və Nurəhməd Hümmətov (Kəblə Nəsib) oynayırdılar.

Üzeyir bəyin «Arşın mal alan» operettası 1938-ci ildə iki quruluşda oynanıldı. Həmin dövrün deyimi ilə yanaşsaq, tamaşa yaz və qış mövsümlərində tamaşaya qoyuldu. İfaçılar, demək olar, dəyişməmişdilər. Birinci quruluşda müəyyən qüsurlar vardı. Hətta Əsgərin ifa etdiyi qəzəl «Arşın mal alan» operettasının yaranmasından çox-çox sonralar yazılmışdı (bax: 4). Tamaşada aktyor ifalarında da qüsurlar vardı. Teatrın operetta oynamaq cəhdi nə qədər maraqlı olsa da, kollektivin yaradıcılıq imkanları bu istəyə tam cavab verə bilmirdi.

Şəki aktyorlarının vokal baxımından səs imkanları Üzeyir bəyin obrazlarına, xüsusən Əsgər, Gülçöhrə və Asya personajlarının mürəkkəb ariya və duetlərinin peşəkarlıqla ifa olunmasına uyğun gəlmirdi. Tamaşaya resenziya yazan M.Süleymanlı da bunu xüsusi qeyd edirdi (bax: 5). Bununla yanaşı, müəllif göstərir ki, teatr, ümumiyyətlə «Arşın mal alan» operettası üzərində ciddiyyətlə işləyib, onun maraqlı olmasını təmin edə bilib.

«Arşın mal alan» və «Məşədi İbad» teatrın daha tez-tez oynadığı tamaşalardan idi. Teatr uşaqlar üçün «Sayıqlıq» (Tahirov) və «Azad günəş» (Ağasəlim Manaflı) tamaşalarını hazırlamışdı. 1938-ci ildə teatr Georgi Mdivaninin sərhəd kəndində yaşayan insanların vətən məhəbbətindən, əsgərlərin rəşadətindən bəhs edən «Vətən namusu» (tərcümə edəni Süleyman Rüstəm) dramını repertuara daxil etdi. Aktyorlardan Qulam Qoşqarlının (Yaqor), Məmmədkəbir Hacıoğlunun (Saridon), Yusif Vəliyevin (Nadir), Novruz İbrahimovun (Dato), Məmməd Xalıqovun (Almazxan), Əlisəttar Yusifzadə və Əhməd Mustafayevin (Arçel), Vasilqinanın (Natella) iştirak etdikləri tamaşa repertuarda bir mövsüm qaldı. «Vətən namusu» haqqında yazılan resenziyada aktyorlara maraqlı sənət tövsiyələri edilir, qüsurlar və uğurlar inandırıcılıqla verilir (bax: 6).





Digər rayon teatrlarında olduğu kimi, Şəkidə də baş rejissorlar tez-tez dəyişirdilər. 1938-ci ilin payızında Həsən Əliyev baş rejissorluqdan getdi və onun yerinə İsmayıl Quliyev təyin edildi.

Mətbuat yazırdı ki, Şəki teatrı 1938-ci ildə Tur qardaşlarının «Üzləşdirmə», Fridrix Şillerin «Qaçaqlar», Mirzə İbrahimovun «Madrid» dramlarını tamaşaya hazırlayacaq (bax: 7). Ancaq bu əsərlərin heç biri teatrın repertuarında yer almadı.

Peterburqda sənət təhsili almış istedadlı rejissor Yusif Yulduz Cəfər Cabbarlının «Od gəlini» dramını Tiflis, İrəvan, Naxçıvan, Gəncə və digər rayon teatrlarında tamaşaya hazırlamışdı. Rejissor çox sevdiyi bu qəhrəmanlıq dramını 1939 – 1940-cı ilin teatr mövsümündə Şəkidə tamaşaya qoydu. Bədii tərtibat R.Rüstəmin idi. Aktyorlar Yusif Vəliyev və Məmməd Xalıqov tamaşada rol oynamaqla yanaşı, rejissor assistenti kimi də çalışmışdılar.

«Od gəlini» tamaşasında sanballı aktyor ansamblı vardı. Teatrın bütün aparıcı aktyorları bu səhnə əsərində iştirak edirdilər. Əsas qəhrəman olan Elxanın rolunu Yu-

sif Vəliyevlə bərabər Yusif Yulduz da oynayırdı. Tamaşada Əyyub Məmmədov (Qorxmaz), Qasım Vəliyev (Altay), Aleksandr Lalayev (Toğrul), Mustafa Əhmədzadə (Dönməz), İsmayıl Quliyev (İldırım), Bilqeyis Ələsgərova və Səriyyə Həsənova (Gülgün), Məmmədkəbir Hacıoğlu (Altunbay), Tamara Kərimova, Sara Canıyeva və Əminə Poqosova (Solmaz), Şirəli Allahyarov (Toğrut), Abdulla Əliyev (Sönməz), Yunis Qarabağlı (Yanardağ), Heybət Abbasov, Nurəhməd Hümmətov və Heybət Cəfərov (Əbu Übeyd), Məmməd Xalıqov və Heybət Cəfərov (Oddamdı), İbrahim Azəri və Heybət Cəfərov (Aqşin), Mahmud Məmmədov (Rəbi), Müseyib Əbdülhüseynov (Dustaqçı), Şirəli Allahyarov (Elçi) maraqlı oyun nümayiş etdirdilər.

Tamaşada vətənpərvərlik ideyaları ikinci plana çəkilmişdi, əvəzində «Allah yoxdur» fikrinə haqq qazandıran epizodlar məntiqsiz müdaxilələrlə bir qədər də qabardılmışdı. Yusif Vəliyevin Elxanı digər ifaçı ilə müqayisədə daha mübariz və çılğın ehtiraslı, əqidəsində qətiyyətli və dönməz təsir oyadırdı. Aktyor Aqşinlə olan epizodda ifasının psixoloji dərinliyini daha da artırırdı. Vaxtilə Bakı teatrında müəyyən sənət təcrübəsi toplamış İbrahim Azərinin oyununda realist boyalar üstünlük təşkil edirdi. Yusif Vəliyev isə öz obrazını romantik boyalarla daha cazibəli canlandırırdı.

Mürəkkəb dramaturji personaj olan Altunbay Məmmədkəbir Hacıoğlunun təbii ifasında daha real görünürdü. Əbu Übeyd rolunda Heybət Abbasov, Rəbi obrazında Mahmud Məmmədov, Oddamdı surətində Məmməd Xalıqov romantik dram janrının estetik prinsiplərinə əsaslanmaqla ifalarının səmimiliyini artırırdılar. Bilqeyis Ələsgərova Gülgün rolunda emosional zərifliyə üstünlük verməklə yanaşı, obrazın mübarizlik ruhunu da qabarıq canlandırırdı.





Kollektiv «Arşın mal alan» operettasını 1939-cu ilin iyul ayında yeni quruluşda tamaşaçılara göstərdi. Rejissor Hacıbaba Səlimovun və rəssam Ələsgər Bağırovun, rejissor assistenti Məmməd Xalıqovun hazırladıqları tamaşa oktyabr ayının 17-də və 18-də yenə premyera kimi oynanıldı. Tamaşanın bədii rəhbəri Əsəd Cəfərov idi. «Arşın mal alan»da rolları Məmməd Xalıqov və İbrahim Azəri (Soltan bəy), Bilqeyis Ələsgərova (Gülçöhrə), Məmmədkəbir Hacıoğlu (Əsgər), Rzabala Rzayev və İbrahim Azəri (Süleyman), Sara Canıyeva və S.Səmədova (Asya), Xeyransa İbayeva (Cahan xala), Tamara Kərimova (Telli), Yusif Vəliyev (Vəli) ifa edirdilər.

Tamaşada Gülçöhrə ilə Əsgərin klassik vokal ariya və duetlərində səs tonallığı aşağı salınmışdı. Çünki ifaçıların potensial imkanları Üzeyir bəyin musiqisini bütün lətafəti ilə səsləndirməyə imkan vermirdi. Bunun müqabilində Vəli və Telli dueti daha canlı alınmışdı. Yusif Vəliyev və Tamara Kərimova sırf milli karnaval estetikasına əsaslanan canlı tip-personajlar təqdim edirdilər. Cahan xala obrazını aktrisa Xeyransa İbayeva xüsusi şövqlə, tipik-səciyyəvi koloritlə oynayırdı. Onların işti-

rak etdikləri səhnələrdə tamaşaçı salonunda daha gur canlanma olurdu.

SSRİ dövlətinin rəhbəri Stalinin anadan olmasının 60 illiyi münasibətilə teatr 22 dekabr 1939-cu ildə Abdulla Şaiqin «Xasay» dramını tamaşaya hazırladı. Tamaşaya quruluşu Hacıbaba Səlimov, səhnə tərtibatını Ələsgər Bağırov, musiqi tərtibatını Əlipaşa Daşdəmirov vermişdilər. «Xasay»ın səhnə təfsirindəki məntiqsiz təbliğat tamaşaya müəyyən quruluq gətirmişdi.

Şəki teatrı, demək olar, hər il Milli Dram Teatrının repertuarından bir əsəri seçib oynayırdı. Ümumiyyətlə, həmin illərdə rayon teatrlarının repertuarları mərkəzdən idarə edilirdi. Əksər hallarda hansı əsərin tamaşaya qoyulacağını Xalq Maarif Komissarlığı nəzdindəki İncəsənət İşçiləri İdarəsi diktə edirdi. Belə «mərkəzdən idarə etmək»də uğursuzluqlar tez-tez olurdu. Bununla belə, uğurlu cəhdlər də yox deyildi.

1939-cu ilin ikinci yarısında və 1940-cı ildə teatrın bədii rəhbəri Hacıbaba Səlimov, rejissoru Əsəd Cəfərov, rəssamı Ələkbər Bağırov, direktoru Vahid İbrahimov idi. Qeyd edim ki, 1940-ci illərdə rayon teatrlarında rəhbərlər, baş rejissorlar, rejissorlar tez-tez dəyişirdilər. O cümlədən də Şəki teatrı belə yerli-yersiz dəyişmələrə məruz qalırdı.

Sabit Rəhmanın «Xoşbəxtlər» komediyası 22 yanvar 1941-ci ildə Ədil İsgəndərov və Şəmsi Bədəlbəylinin quruluşlarında Milli Dram Teatrında oynanıldı. Mirzağa Əliyevin, Mustafa Mərdanovun, Ağasadıq Gəraybəylinin, Möhsün Sənaninin, Barat Şəkinskayanın, Hökümə Qurbanovanın, Əminə Sultanova-Nağıyevanın, Kazım Ziyanın ilhamla oynadıqları tamaşa böyük uğur qazandı, teatrın sənət qələbəsinə çevrildi. Həmin ilin yazında Şəki teatrı da «Xoşbəxtlər»ə müraciət etdi. Tamaşa Şəki teatrının müasirlik axtarışlarında uğurlu mərhələ oldu.





«Xoşbəxtlər» komediyasının quruluşçu rejissoru Hacıbaba Səlimovun hazırladığı (rəssam R.Rüstəmov, rejissor assistenti Məmməd Xalıqov) tamaşa beşpərdəli idi. Tamaşanın daha koloritli aktyor ifası Bilqeyis Ələsgərova (Maral) və Məmmədkəbir Hacıoğlu (Bərbərzadə) dueti idi. Yunis Qarabağlı ilə Həsən Möhsümovun ifalarında Usta Segah obrazı koloritli və təbii yumorlu təsir bağışlayırdı. Mənəviyyatsız və riyakar Mirzə Qərənfil obrazını ifa edən Məmməd Xalıqovun oyununda satirik boyalar üstünlük təşkil edirdi. Mürşüd (Əyyub Məmmədov) – Gülər (Asya İsmayılova və Sara Canıyeva) və Sadıq (Yusif Vəliyev) – İnci (Tamara Kərimova və Səriyyə Həsənova) duetləri tamaşanın lirik ahənginə xüsusi məlahət və cazibə verirdi. Nəzir Məmmədov (Nəsirov), H.Şükürova (Sənubər), Xeyransa Əliyeva (Həlimə), İsmayıl Quliyev (Birinci işçi), Hüseyn Harunov (İkinci işçi) tamaşanın dramatik xəttinin zərif yumor aşılanmış daşıyıcıları idilər.

Teatr bəzən kollektivin yaradıcılıq və texniki imkanlarını, səhnənin miqyas ölçülərini nəzərə almadan da repertuar qurmağa çalışırdı. Səməd Vurğunun «Vaqif» mənzum dramının Bakıdakı möhtəşəm uğuru Şəki te-

atrının kollektivində bu əsəri oynamağa maraq doğurdu. Tamaşada rolları Rzabala Rzayev və Yusif Vəliyev (Vaqif), Tamara Kərimova (Xuraman), Aleksandr Lalayev (Əli bəy), Asya İsmayılova (Gülnar), Xeyransa Şabayeva (Əminə xala), Nurəhməd Hümmətov və Məmməd Xalıqov (Vidadi), Xeyransa Əliyeva və Xeyransa Şabayeva (Xuraman), Nəzir Məmmədov (İbrahim xan), Məmməd Xalıqov və Nurəhməd Hümmətov (Şeyx Alı), Mehbəli Rəhimov (Təlxək və Qasım), Məmmədkəbir Hacıoğlu (Ağa Məhəmməd şah Qacar), Həsən Möhsümov (Vəzir), Məmməd Tahirov (Zülfüqar), Xeyransa Əliyeva (Tamara), Yunis Qarabağlı (Şaliko), Ənvər Pənahov (Şalikonun qardaşı), Mahmud Məmmədov (Eldar), Cəlil Bağdadbəyov (Qurban kişi), Hüseyn Harunov (Arşaq və Qurban kişi), Əyyub Məmmədov (Kürd Musa), Şirəli Allahyarov (Qoca kəndli), Bilqeyis Ələsgərova (Yengə), İsmayıl Quliyev (İlyas və Əhməd kişi), Şirəli Allahyarov və Ənvər Pənahov (elçilər), Zülfüqar Mikayılov (Sərkərdə), D.Davudov (Murad), Yəhya Məmmədov (Xanəndə) ifa edirdilər.

Mətbuat teatrı öz binasından əlavə, ipək fabrikində, kəndlərdə açıq səhnələrdə də tamaşalar oynamağa çağırırdı. (bax: 8). Qeyd edilirdi ki, belə bir təşəbbüs tamaşaçıların teatra kütləvi maraqlarına səbəb olar.

Teatrın yaradıcı kollektivi Sabit Rəhmanın «Toy» komediyası üzərində böyük şövq və yaradıcılıq ehtirası ilə işləyirdi. Hətta mətbuat tamaşanın premyerası ərəfəsində «Toy»un hazırlığı haqqında xüsusi səhifə ver-





mişdi (bax: 9). Səhifədə tamaşanın quruluşçu rejissoru, aparıcı aktyorlar komediya üzərindəki yaradıcılıq axtarışlarından bəhs etmişdilər.

«Toy»un premyerası 1940-cı il fevral ayının sonlarında göstərildi. Sənət ocağına uğur gətirən bu tamaşanın quruluşunu rejissor Hacıbaba Səlimov, bədii tərtibatını rəssam Ələkbər Bağırov vermişdilər. Əsas rolları Məmmədkəbir Hacıoğlu (Kərəmov), Məmməd Xalıqov (Mirzə Hüseyn), Yusif Vəliyev (Surxay), İbrahim Azəri (Dəmirçi Musa), Tamara Kərimova (Zinyət), Bilqeyis Ələsgərova (Zalxa) ifa edirdilər. Quruluşçu rejissor bəzi epizod və personajları əsərdən çıxarmaqla dinamikanı artırmağa çalışmışdı. Tamaşanın rəssamı yazırdı ki, «mən rejissorun traktovkasına əsasən tərtibat üzərində işləyərkən hadisənin Nuxa kəndlərindən birinə köçürülməsini daha əlverişli bildim». Rəssamın belə bir cəhdi o dövr üçün maraqlı sayıla bilərdi. Tamaşaçılar doğma məkanı daha hərarətlə qarşılayırdılar.

Tamaşanın daha uğurlu aktyor ifası Məmmədkəbir Hacıoğluna mənsub idi. Aktyor lovğa, təkəbbürlü, «mənəm-mənəm» azarına tutulmuş, bir qədər əbləh Kərəmovu həm də sadəlövh təsərrüfat başçısı kimi ifa etməklə obraza duzlu kolorit və təbii reallıq aşılamışdı. Hacıoğlunun plastikası obrazın daxili ritmi ilə həmahəng idi və aktyorun obraza ədalı danışıq tərzi tapması Kərəmova bədii personaj kimi xüsusi canlılıq vermişdi.

Bilqeyis xanımın şən, bir qədər cığal, bir qədər də hay-küyçü, daxilən saf və səmimi Zalxası gülüşün təbiiliyi

baxımından Kərəmovla tən gəlirdi. Aktrisa obraza çox maraqlı yeriş, baxış və danışıq tərzi tapmışdı. Onun sözsüz, lakin mənalı ədaları da tamaşaçılarda səmimi gülüş doğururdu.

İbrahim Azərinin Dəmirçi Musa obrazı üçün istifadə etdiyi yumor dramatik olduğu qədər də məzəli və cazibəli idi. Obrazın xüsusən Zinyət ilə qarşılaşdığı səhnələrdə aktyorun ciddi davranışının ikinci planında qəribə yumor vardı. Bu yumor xarakterə müəyyən zavallılıq görkəmi verirdi. Aktyorun aramla və xüsusi vurğuyla ucadan danışması, təkəbbürlü görkəm alması Dəmirçi Musaya kolorit təbiiliyi aşılayırdı. İbrahim Azəri bütün səhnələrdə personajın səmimiliyini və işgüzarlığını saxlayırdı.

Teatr «Toy»un ardınca mart ayında Mirzə Fətəli Axundzadənin «Molla İbrahimxəlil kimyagər» komediyasını, iyun ayında Cəfər Cabbarlının «Od gəlini», iyul ayında Hacıbaba Səlimovun quruluşunda «Aydın» dramını repertuara daxil etdi. «Molla İbrahimxəlil kimyagər» tamaşasının quruluşunu aktyor Məmməd Xalıqov, bədii tərtibatını Ələsgər Bağırov vermişdilər. Əsas rollarda Yusif Vəliyev (Molla İbrahimxəlil), Qulam Qoşqarlı (Dərviş Abbas), Əbdülcabbar Əliyev (Hacı Kərim), İbrahim Azəri (Hacı Nuru) çıxış edirdilər. «Aydın»ın bu quruluşunda baş rolları Yusif Vəliyev (Aydın), Heybət Cəfərov (Dövlət bəy), Tamara Kərimova və Asya İsmayılova (Gültəkin) oynayırdılar.





Kollektivin aparıcı rejissorlarından olan Hacıbaba Səlimov bir müddət teatrın bədii rəhbəri işlədi. Bədii rəhbər kimi onun ilk işi Səttar Axundovun «Çətin dərə» dramının tamaşası oldu. Tamaşada rolları Məmməd Xalıqov (Hüseyn), Bilqeyis Ələsgərova (Pərnisə), Sədayə Mustafayeva (Nübar), Yəhya Xəlilov (Əli), Xanım Rəfiyeva (Nərgiz), Məmmədkəbir Hacıoğlu (Nekrasov), Aleksandr Lalayev (İvanov), Tamara Kərimova (Firəngiz), Məmməd Tahirov (Murad), Ə.Hüseynov (Alyoşa), Heybət Cəfərov (Qoca), İbrahim Azəri və Əzizağa Məmmədov (Qulu), Rzabala Rzayev (Döyüşçü), Sima Hidayətzadə (Nina), Nəzir Məmmədov (Zabit), İsabala Mustafayev (Bayram), Şaid Bağbanlı (Aqşin) oynayırdılar.

Repertuarda çağdaş mövzulu pyes qıtlığı çəkən teatr 1941-ci ilin ilk günündə Cəfər Cabbarlının «1905-ci ildə» dramını yeni quruluşda təhvil verdi. Əsəri tamaşaya teatrın istedadlı aktyoru Heybət Cəfərov hazırlamışdı. Əsas rolları Yusif Vəliyev (General-qubernator), Heybət Cəfərov (Salamov), Şirəli Allahyarov (Bahadır bəy), Məmmədkəbir Hacıoğlu (Ağamyan), Tamara Kərimova (Sona), Rzabala Rzayev (Eyvaz) oynayırdılar.

Tənqid yazırdı ki, yeni quruluşun əsas nailiyyəti aktyor ansamblının düzgün seçilməsində və ifaçıların səylə oynamasındadır. Aktyorlar obrazların psixoloji mürəkkəbliyini, bədii xüsusiyyətlərini canlı, ifadəli, mənalı canlandırmağa çalışırlar (bax: 10).

Aktyorlar haqqında tərifli sözlər ilk növbədə Yusif Vəliyevə, Heybət Cəfərova və Məmmədkəbir Hacıoğlu-

na aid idi. Cəfərovun ifasında Salamov daxilən qayır-qayır qaynayan, loğva, cırtqoz, hay-küyçü, pulun havasına özündən aşağılara meydan sulayan koloritli neftxuda idi. Aktyorun az qala qışqıra-qışqıra danışması, Mariya Timofeyevnanı görəndə əriyib muma dönməsi, General-qubernatorun önündə ikiqat əyilməsi tamaşaçılarda bu obraza qarşı ikrah doğururdu. Salamovun Ağamyanla kəskin mübahisə etdiyi səhnədə aktyor əsl Bakı qoçusu ifa edirdi.

Yusif Vəliyev psixoloji oyun üslubunu seçmişdi. O, General-qubernatoru üç planda oynayırdı: çar Rusiyasının yürütdüyü mənfur imperiya siyasətinin sadiq xidmətçisi; iblisanə niyyətlərini riyakarlıqla gizlədib maskalanan məmur; millətlər arasında nifaq salan, ayrı-ayrılıqda hər iki tərəfə «çarın səmimi məhəbbətini» izhar edən, hətta yeri gələndə həm Salamova, həm də Ağamyana medal verən maskalı qatil. Personajın hər üç xüsusiyyəti üçün Yusif Vəliyev bir-birindən fərqli xarakterik ifadə vasitələri, hərəkət plastikası və danışıq tərzi tapmışdı. Bu tapıntılardan məharətlə istifadə edən aktyor tamaşadakı ayrı-ayrı epizodların məzmun xarakterinə uyğun sürət-ritmlə oynayırdı. Bununla da General-qubernatorun mürəkkəb və qorxunc obrazı tamaşaçılara daha güclü təsir bağışlayırdı.

Vasili Şkvarkinin «Özgə uşağı» komediyası 27 mart 1934-cü ildə Bakıda Milli Dram Teatrında uğurla tamaşaya qoyulmuşdu. Əsəri Mustafa Mərdanov və Rza Təhmasib tərcümə etmişdilər. Tamaşaya quruluşu Rza





Təhmasib vermişdi. Sonralar rayon teatrlarının əksəriyyəti bu məişət komediyasına müraciət etdilər. Şəki teatrının kollektivi «Özgə uşağı»nı 1941 – 1942-ci il teatr mövsümündə hazırladı. Tamaşanın quruluşunu teatrın baş rejissoru Mikayıl Ağayev vermişdi. Aktyor Heybət Cəfərov rejissor assistenti kimi də çıxış etmişdi.

«Özgə uşağı» məzəli məişət komediyası janrında hazırlanmışdı, şən və maraqlı tamaşa idi. Rejissor işində elə bir qabarıq nəzərə çarpan uğur, forma orijinallığı yox idi. Lakin o, ifaçılarla səylə işləmişdi və nəticədə əsl aktyor tamaşası alınmışdı. Rolları Məmməd Xalıqov və İbrahim Azəri (Qaraulov), Bilqeyis Ələsgərova (Liza), Tamara Kərimova (Manya), Heybət Cəfərov (Seniçka), Əyyub Məmmədov (Kostya), Yunis Qarabağlı (Yusif), Cəlil Bağdadbəyov (Andreyev), Hökümə İsmayılova (Raya), Xeyransa Əliyeva (Zina), Fatma Şabayeva və Sima Hidayətzadə (Marfa), H.Məmmədov (Mironov), Məmməd Tahirov (Revkənd), Mehbalı Rəhimov (Poçtalyon), Z.Hüseynov (Dost) ifa edirdilər.

Dramaturq Məmməd Səid Ordubadinin və bəstəkar Səid Rüstəmovun «Beş manatlıq gəlin» operettası və Cəfər Cabbarlının «1905-ci ildə» dramları 1941-ci ilin yanvar və fevral aylarında yeni quruluşlarda göstərilib. Hər iki tamaşaya quruluşu Heybət Cəfərov verib. Əsas rolları «Beş manatlıq gəlin»də Bilqeyis Ələsgərova (Səlbi), Tamara Kərimova (Naznaz), Məmmədkəbir Hacıoğlu (Kəblə Hüseynəli), Əyyub Məmmədov (Qiyas), «1905-ci ildə»də Rzabala Rzayev (Eyvaz), Yusif Vəliyev (Ge-

neral-qubernator), Heybət Cəfərov (Salamov), Şirəli Allahyarov (Bahadır bəy), Tamara Kərimova (Sona), Məmmədkəbir Hacıoğlu (Ağamyan) ifa ediblər. Mətbuat «1905-ci ildə» tamaşasının yeni quruluşunun bədii məziyyətlərini müəyyən mənada qeyd etmişdi (bax: 11).

Məmmədhüseyn Təhmasibin «Bahar» dramı Bakı və Gəncə teatrlarında oynanılandan az sonra Şəki kollektivinin də repertuarına daxil edildi. Bu teatrda əsəri tamaşaya 1941-ci ilin əvvəllərində Hacıbaba Səlimov hazırladı. Rzabala Rzayev və Əyyub Məmmədov onun assistenti oldular. Tamaşa mənəvi-əxlaqi dəyərlərdən bəhs edirdi, bir qədər detektiv janrın prinsipləri əsasında işlənmişdi. Süjetdə müəyyən primitivlik (Tərlan, Qaya, Qüdrət və Bahar xəttində) vardı. Ancaq əsərin ideya gücü və aktyorların cəsarətli cəhdləri tamaşaya cazibədarlıq gətirmişdi. Didaktik pafosuna baxmayaraq, «Bahar» böyük tamaşaçı marağına səbəb oldu.

«Bahar» tamaşasında baş rolları Asya İsmayılova (Bahar), Rzabala Rzayev (Qaya), Yusif Vəliyev (Tərlan), Fatma Şabayeva (Laçın) ifa edirdilər. Məmməd Xalıqov, Nəzir Məmmədov və Heybət Cəfərovun (Veysəl), Sara Canıyevanın (Qumru), Nurəhməd Hümmətovun (Kərim kişi) oyunlarında incə yumor vardı. Digər personajlarda Əyyub Məmmədov və Aleksandr Lalayev (Qüdrət), Məmməd Tahirov (Vəli və Professor), Mahmud Məmmədov (Ədhəm), Xeyransa Şabayeva və Bilqeyis Ələsgərova (Növbətçi qadın), Hüseyn Harunov





(Qızıl əsgər), Mikayıl Kərimov (Milis), Mehbəli Rəhimov (Oğru) çıxış edirdilər.

Tərlan ziyalı ailədə doğulmuş, lakin müharibədə itkin düşmüşdür. O, cinayətkar oğrunun girinə keçmiş, «atan-anan Vətən xaini kimi həbs olunublar, adını desən, səni də tutacaqlar» yalanı ilə onu da çirkin əməllərə cəlb etmişdir. Tərlan oğurluq vaxtı öz bacısını və gənc bəstəkar Baharı beşbarmaq zərbəsi ilə vurmuşdur. Baharın gözləri tutulub. Başda Qaya və Qüdrət olmaqla milis işçiləri əsas cinayətkarı tutmaq üçün Tərlandan sürücü kimi istifadə edirlər. Baharla Tərlanın arasında isti münasibət yaranır. Sonda hər şey aydınlaşır, həmçinin Tərlan anasını və bacısını tapır.

«Bahar» tamaşası, dediyim kimi, psixoloji detektiv janrında səhnəyə qoyulmuşdu. Aktyorlar, xüsusən Yusif Vəliyev və Rzabala Rzayev bu janrın estetik prinsiplərinə həssaslıqla və yaradıcı təxəyyüllə əməl edirdilər. Dramatik konflikt tamaşaçıları sona qədər maraqlı intizarda saxlayırdı. Tamaşanın mənəvi-əxlaqi ruhu güclü idi və aktyor ifalarının təbiiliyi əsərin ideya kəsərini daha da artırırdı.

Böyük Vətən müharibəsi başlayanda aktyorların bir qismi səhnəni döyüş meydanı ilə əvəz etməli oldu. Sıralarının seyrəlməsinə baxmayaraq, teatr yaradıcılığından qalmadı, ağır illərin hər cür məşəqqətlərinə, məişət çətinliklərinə fədakarlıqla sinə gərərək fəaliyyətini davam etdirirdi. Müharibə illərində repertuarda «Müsibəti-Fəxrəddin» Nəcəf bəy Vəzirov), «Oqtay Eloğlu»

(Cəfər Cabbarlı), «Bəxtsiz cavan» (Əbdürrəhim bəy Haqverdiyev), «Fərhad və Şirin», «Ər və arvad» (Üzeyir bəy Hacıbəyli), «Qaçaq Nəbi» (Süleyman Rüstəm) kimi əsərlər vardı. Sərxan Mustafayev müharibədə vuruşmuş, yaralanaraq ciddi zədə alıb tərxis olunandan sonra Bakıya qayıtmışdır. Gənc Tamaşaçılar Teatrında, Azərbaycan Dövlət Opera və Balet Teatrında baş inzibatçı, Azərbaycan Teatr Cəmiyyətində sədr müavini işləmişdir.

Aktyorlar Məmməd Xalıqov və Rzabala Rzayev 1942-ci ildə Üzeyir bəy Hacıbəylinin «Məşədi İbad» operettasını yeni quruluşda tamaşaya hazırladılar. Tamaşanın bədii tərtibatını rəssam F.Mustafayev vermişdi. Baş rol olan Məşədi İbadı aktyorlardan Məmmədkəbir Hacıoğlu və Məmməd Xalıqov oynayırdılar. Sərvərlə Gülnazın partiyalarını Yunis Qarabağlı və Tamara Kərimova ifa edirdilər. Digər rolları Zəhra Mirzəyeva (Sənəm), Aleksandr Lalayev (Həsənqulu bəy), Əyyub Məmmədov (Rza bəy), Nəzir Məmmədov (Həsən bəy), Əbdülcabbar Əliyev və Rzabala Rzayev (Məşədi Qəzənfər), Z.Hüseynov (Usta Məhərrəm), Heybət Cəfərov (Hambal) oynayırdılar.

Mehdi Hüseynin «Şöhrət» dramının tamaşası teatrın uğursuz işlərindən oldu. Bunun da əsas səbəbi pyesdə hərəkət dinamikasının zəif olması, obrazların qeyri-təbiiliyi, hadisələrin məntiqsizliyi, ideyanın çılpaqlığı idi.

Müharibə ilə bağlı teatr qəhrəmanlıq və vətənpərvərlik mövzulu tamaşaların hazırlanmasına da xüsusi





maraq göstərirdi. Süleyman Rüstəmin «Qaçaq Nəbi» dramının tamaşasını bu istiqamətdə uğurlu axtarış cəhdi kimi dəyərləndirmək olar. Əsərə səhnə quruluşunu rejissor Mikayıl Ağayev vermişdi. Rəssam R.Rüstəm və rejissor assistenti Məmməd Xalıqov idi. Nəbi rolunu Məmməd Tahirov tək oynayırdı. «Qaçaq Nəbi» tamaşası teatrın az-az işlərindən idi ki, aktyorlar öz rollarını roldaşsız (dublyorsuz) oynayırdılar. Yalnız Çimnaz rolunu iki aktrisa – Fatma Şabayeva və Sədayə Mustafayeva ifa edirdilər.

«Qaçaq Nəbi» tamaşasında obrazlar üç qütbə bölünmüşdü: zülmə qarşı mübarizə aparanlar, camaata əzab verənlərin təmsilçiləri və sadə, zavallı kəndlilər. Birinci qütbü Nəbi, Mehdi (Aleksandr Lalayev), Həcər (Tamara Kərimova), Qəhrəman (D.Davudov), Vəli (Şaid Bağbanlı), Qurd Kərim (Z.Hüseynov), Şahməmməd (Nəzir Məmmədov) təmsil edirdilər.

İkinci qütbə Təhmas bəy (Yunis Qarabağlı), Səlim bəy (Məmmədkəbir Hacıoğlu), Cümşüd bəy (Aleksandr Lalayev), Koxa Məmməd (Məmməd Xalıqov), Savçinski (Heybət Cəfərov), Xəlil (Yəhya Xəlilov), Leyla (Bilqeyis Ələsgərova), Gözətçi (İ.Sadıqov) daxil idilər.

Üçüncü qütbə Alı kişi (Ə.Tağıyev), Gülbacı və Fatma (Bilqeyis Ələsgərova), Səfər kişi və Musa (Əbdülcabbar Əliyev), Güllü xala (Fatma Şabayeva), Qasım (Şaid Bağbanlı), Yəhya Xəlilov (Kəndli), Xanəndə (İsabala Mustafayev) daxil idilər.

Mənfi personajların təqdimatında rejissor və aktyorlar müəyyən jarja yol vermişdilər. Buna baxmayaraq, «Qaçaq Nəbi» tamaşasında dramatik sürət-ritm vardı və hadisələrin inkişaf xəttindəki dinamizm sona qədər gözlənilirdi.

Məmmədhüseyn Təhmasibin «Aslan yatağı» pyesinin tamaşası da vətənpərvərlik ruhunda idi. Mövzu Böyük Vətən müharibəsindən götürülmüşdü. Əsərə səhnə quruluşunu Mikayıl Ağayev və Hacıbaba Səlimov vermişdilər. Aktyor ansamblı bu aktyorlardan ibarət idi: Məmməd Xalıqov (Mehdi), Nəzir Məmmədov (Şahmar), Aleksandr Lalayev (Elmar), Tamara Kərimova (Sədaqət), Bilqeyis Ələsgərova (Nigar), Sədayə Mustafayeva (Lena), Əyyub Məmmədov (İvanov), Fatma Şabayeva (Əsli), Məmmədkəbir Hacıoğlu (Baba), Yunis Qarabağlı (İzzətullayev), Şabay Bağbanlı (Nurullayev), Heybət Cəfərov (Polkovnik), Məmməd Tahirov (General), Ələkbər («SS» zabiti), D.Davudov (Zabit), Ə.Əsədov (Qurban və Əsgər), İ. Sadıqov (Mitin), Tofiq Səfərov (Partizan və Qızıl əsgər), Xanım Əliyeva (Operator), Qurban (Telefonçu).

Teatrın növbəti tamaşası da vətənpərvərlik, qəhrəmanlıq, torpağa, xalqa bağlılıq ideyalarını təbliğ edirdi. Həmin tamaşa «Vətən oğlu» adlanırdı. Bir sıra teatrlarda «Bizim şəhərli oğlan» adı ilə oynanılan dramın müəllifi Konstantin Simonov idi. SSRİ teatrlarında məşhur olan əsəri Mehdi Hüseyn tərcümə etmişdi. Tamaşanın quruluşçu rejissoru Hacıbaba Səlimov, rejissor assistenti Heybət Cəfərov idi.





«Vətən oğlu» tamaşasında rolları Məmməd Tahirov (Sergey), Heybət Cəfərov (Arkadi), Hidayət İsmayılov (Variya), Nəzir Məmmədov (Quliaşvili), Fərrux İsmayılov (Sevastyanov), Bilqeyis Ələsgərova (Anna İvanovna), Fatma Şabayeva (Polina), Xanım Əliyeva (Jenya), Yunis Qarabağlı (Safonov), Hüseyn Harunov (Volodya və Telefonçu), Məmməd Xalıqov (Zabit), Əbdülcabbar Əliyev (Tərcüməçi), Şabay Bağbanlı (Komandir), Z.Hüseynov (Petka və Həkim), İ.Sadıqov (Qızıl əsgər və Tankçı), Ə.Əsədov (Motosikletçi) oynayırdılar.

Əvvəlki baş rejissorlarla müqayisədə Hacıbala Səlimov daha coşqun enerji və şövqlə işləyirdi. O, repertuarın əlvanlığına da səylə çalışırdı. Rejissorun həmin istiqamətdə diqqəti cəlb edən yaradıcılıq işlərindən biri də «Xasay» (Abdulla Şaiq) tamaşası oldu. Tamaşanın bədii tərtibatını rəssam Ələsgər Bağırov, musiqi tərtibatını isə Əbdülrəsul Daşdəmirov vermişdilər.

Yeniyetmələr və gənclər üçün nəzərdə tutulmuş «Xasay» tamaşasında aktyorlardan Aleksandr Lalayev (Xasay), Əyyub Məmmədov və Bəkir Məmmədov (Kamil), Səriyyə Həsənova (Badam), Məmməd Xalıqov (Mirzə Rəhim), Qoşqar Qoşqarlı və Əbdülcabbar Əliyev (Rəsul), Nurəhməd Hümmətov (Rəcəb), Tamara Kərimova və Hava Qafarova (Zinyət), Xeyransa Şabayeva (Qızyetər), Bilqeyis Ələsgərova (Züleyxa), Şirəli Allahyarov (Müdir),

Hacı Abdullayev (Rayon Maarif Şöbəsinin müdiri), Fatma Şabayeva (Zümrüd), Mustafa Əhmədzadə (Mürsəl), Sara Canıyeva (Sara), Əyyub Məmmədov (Əsgər), Fatma İbrahimova (Nataşa), Möhübbəli Rəhimov (Rəşid) çıxış edirdilər.

Böyük Vətən müharibəsinin başlanması dahi Nizami Gəncəvinin təntənəli yubileyini təxirə saldı. Buna baxmayaraq, bəzi teatrlar dörd illik müharibə dövründə Mehdi Hüseynin «Nizami» əsərini oynadılar. Milli ədəbiyyatımızın klassikinə opera həsr edildi. Şəki teatrında «Nizami» dramına quruluşu kollektivə yenidən baş rejissor təyin edilmiş Mikayıl Ağayev verdi. Tamaşaya bədii tərtibatı işləmək üçün Bakıdan təcrübəli rəssam Sadıq Şərifzadə dəvət edilmişdi. Məmməd Xalıqov tamaşada rejissor assistenti kimi çalışmışdı. «Nizami» tamaşası forma-məzmun ahəngdarlığına, mənalı rəssam işinə və maraqlı aktyor ifalarına görə 1942-ci ilin uğurlu sənət hadisələrindən oldu.

Romantik monumentallığa cəhd göstərilən tamaşada şair Nizaminin rolunu Rzabala Rzayev, qardaşı Qivaminin obrazını Məmməd Xalıqov, şairin sevgilisi Afaqın surətini Mərziyə Rəsulzadə, qələm dostu və məsləkdaşı Məhsəti Gəncəvini Zəhra Mirzəyeva ifa edirdilər. Mürəkkəb kompozisiyalı, bir qədər ağır ritmli tamaşada digər rolları Bilqeyis Ələsgərova (Xədicə), Əyyub Məmmədov (Əbdək) Aleksandr Lalayev (Toğrul), Xanım Rəfiyeva (Dəstəgül), Ə.Tağıyev (Çingiz), Yunis Qarabağlı (Yusif), Məmmədkəbir Hacıoğlu (Şah), Heybət Cəfərov (Vəzir),





Nəzir Məmmədov (Vəli), Məmməd Tahirov (Munis), Şaid Bağbanlı (Qoca cəngavər və Qasid), İ. Sadıqov (Cavan şəhərli), İ.Mustafayev (Birinci xəzri), Sertak Seyranov (İkinci xəzri və Mühafizəçi) oynayırdılar.

Rejissor çatışmazlığına görə teatrın qabaqcıl aktyorları da tamaşalar hazırlamağa cəhd göstərirdilər. Belə bir təşəbbüsə teatrın aktyoru Heybət Cəfərov da maraq göstərdi. O, dramaturq Cəfər Cabbarlının «Almaz» dramını tamaşaya hazırladı. Bədii tərtibatı H.İsmayılzadə verdi. «Almaz»ın mövzusu həmin dövrdə Şəki üçün də xarakterik idi. Bunu nəzərə alan kollektiv əsərdəki yenilik, quruculuq, maarifləndirmə ruhunu bir qədər də qabarıq verməyə cəhd göstərmişdi. Rejissor işində müəyyən yeniliklər vardı. Əsas məsələ onda idi ki, teatr tamaşanın ideoloji gücünün mahiyyətini düzgün realizə etmişdi, maarifçilik ruhu qabarıq idi.

«Almaz» tamaşasında aktyor ansamblına Məryəm Məmmədova və Sima Hidayətzadə (Almaz), Bəyimə Əliyeva (Xanımnaz), Zəhra Mirzəyeva və Sima Hidayətzadə (Yaxşı), Bilqeyis Ələsgərova (Kəblə Fatmanisə), Rzabala Rzayev və İbrahim Azəri (Hacı Əhməd), Əyyub Məmmədov (Baloğlan), Yusif Vəliyev və Heybət Cəfərov (İbad), Ə.Tağızadə (Balarza), Məmməd Xalıqov (Mirzə Səməndər), Yunis Qarabağlı (Ocaqqulu), Əbdülcabbar Əliyev (Aftil), Tofiq Səfərov (Barat), Sertak Seyranov (Fuad), İ.Sadıqov (Camal), Əlikram Hüseynov (Temur-

taş), Məmməd Rəhimov (Gülverdi), Sədayə Mustafayeva (Sürmə), Nadir İbrahimov (Arabaçı) daxil idilər.

Tamaşa mübariz ruhlu dram janrında hazırlanmışdı. Bununla belə, Məmməd Xalıqov kənd müəllimi Mirzə Səməndər, Yunis Qarabağlı qolçomaq ünsürü Ocaqqulu rollarında incə yumordan, şux gülüşdən ustalıqla istifadə etməklə koloritli komediya personajları oynayırdılar. Rzabala Rzayevin psixoloji, dramatik oyunu Hacı Əhməd obrazının mürəkkəb daxili aləmini mərhələ-mərhələ açırdı. Aktyor yeri gələndə qroteskli satira elementlərindən də bacarıqla bəhrələnirdi. Aktyor mürəkkəb psixoloji epizodlarda pauzaları cazibəli hərəkət plastikası ilə oynayırdı. Yusif Vəliyev mürəkkəb daxili təzadlı, siyasətdə burnundan uzağı görməyən, qolunun zoru ilə qürrələnən İbad obrazını xüsusi daxili ehtirasla, orijinal səhnə çılğınlığı ilə oynayırdı. Onun iştirak etdiyi epizodlarda dramatik gərginlik tamaşaya canlılıq gətirirdi. Məryəm Məmmədova ilə müqayisədə Sima Hidayətzadə Almaz rolunda daha mübariz, başladığı işi uğurla sona çatdırmaqda daha qətiyyətli təsir bağışlayırdı.

Mikayıl Ağayev 1943–1944-cü ilin teatr mövsümündə, baş rejissor işlədiyi sonrakı illərdə dramaturq Mirzə İbrahimovun «Məhəbbət» (rejissor assistenti Heybət Cəfərov), Cəfər Cabbarlının «Aydın», «Oqtay Eloğlu» dramlarına, Süleyman Sani Axundovun «Eşq və intiqam», Əbdürrəhim bəy Haqverdiyevin «Dağılan tifaq» faciələrinə, Rəsul Rzanın «Vəfa», Konstantin Simonovun «Praqanın şabalıd ağacları altında» pyeslərinə müraciət etdi. «Aydın»da Yusif Vəliyev və Rzabala Rzayev (Aydın), Sima Hidayətzadə (Gültəkin), Şirin Cəfərova (Böyükxanım), «Vəfa»da Sima Hidayətzadə və Tamara Kərimova (Vəfa), Yusif Vəliyev və Rzabala Rzayev (Bahadır), Məmmədkəbir Hacıoğlu (Xasay), Bilqeyis Ələsgərova (Vəsfiyyə), Şirin Cəfərova (Firuzə), Məmməd Xalıqov (Zeynəboğlu), «Eşq və intiqam»da Məmmədkəbir Hacıoğlu (Şahbaz bəy), Xədicə xanım və Şirin Cəfərova (Həcər), Yusif Vəliyev (Çingiz), İbrahim Azəri (Əlimərdan), Məmməd Xalıqov (Piri baba), Bəyim Əliyeva (Yasəmən), Sədayə Mustafayeva (Qəmər), «Dağılan tifaq»da Yusif Vəliyev (Nəcəf bəy), Tamara Kərimova və Sima Hidayətzadə (Sona), Şirin Cəfərova (Nazlı), Rzabala Rzayev (Süleyman bəy), İbrahim Azəri (Aslan bəy), «Oqtay Eloğlu»da Türhüd Qasımov (Oqtay), Sədayə Mustafayeva (Sevər), Məmmədkəbir Hacıoğlu (Xosməmməd) maraqlı oyun nümayiş etdirirdilər.

Bu ərəfədə teatr Mirzə Fətəli Axundzadənin «Müsyö Jordan və dərviş Məstəli şah» komediyasını, Səməd Vurğunun «Vaqif» qəhrəmanlıq dramını, Mehdi Hüseynin «Nizami» tarixi əsərini, Süleyman Rüstəmin «Qaçaq Nəbi» pyesini, dramaturq Məmməd Səid Ordubadinin və bəstəkar Fikrət Əmirovun «Ürəkçalanlar» operettasını da yeni quruluşlarda oynayıb.

Rejissor Mikayıl Ağayev «Məhəbbət» tamaşasında müəyyən dramatik hadisələrə psixologizm aşılamaq

cəhdi ilə diqqəti çəkirdi. Aktyorlar da öz oyunlarında bu prinsipi qorumağa çalışmışdılar.

«Məhəbbət» tamaşasında Sima Hidayətzadə (Məhəbbət), Yusif Vəliyev (Mahir), Nəzir Məmmədov (Məşədi Qulamhüseyn), Bilqeyis Ələsgərova (Fatmanisə), Rzabala Rzayev (Yusif), N.Cəlilov (Aslan), Aleksandr Lalayev (Kərim), Məmmədkəbir Hacıoğlu və Heybət Cəfərov (Qəşəm Məmişov), Xanım Rəfiyeva (Zeynəb), Xanım Rəfiyeva və Məryəm Məmmədova (Zəhra), Məmməd Xalıqov (Əhməd Biqəm), Yunis Qarabağlı (İsgəndər), Məmməd Tahirov (Murtuz ağa), Sədayə Mustafayeva (Töhfə), Setrak Seyranov (Heydərov), Əbdülcabbar Əliyev (Doktor), Tacəddin Səfərov (Şamil), İ.Sadıqov (İşçi) oynayırdılar.

Kollektiv, demək olar, hər teatr mövsümündə mütləq komediya janrlı əsərə müraciət edirdi. Teatr 1943-cü ildə də ənənəsinə sadiq qalaraq Mirzə Fətəli Axundzadənin «Müsyö Jordan və dərviş Məstəli şah» komediyasını rejissor Mikayıl Ağayevin quruluşunda öz repertuarına daxil etdi. Tamaşaçılarda şən ovqat doğuran komediyada rolları Əyyub Məmmədov və Məmməd Tahirov (Müsyö Jordan), Nəzir Məmmədov (Hatəmxan ağa), Zəhra Mirzəyeva və Sədayə Mustafayeva (Şərəfnisə), Məryəm Məmmədova (Gülçöhrə), Fatma Şabayeva və Xanım Rəfiyeva (Xanpəri), Aleksandr Lalayev (Şahbaz bəy), Məmməd Xalıqov (Məstəli şah), Heybət Cəfərov (Qulaməli) oynayırdılar.





Axundzadənin komediyası ilə müqayisədə Sabit Rəhmanın «Toy» əsərinin tamaşası daha sanballı və daha təbii alınmışdı. Komediyaya səhnə quruluşunu teatrın sevimli aktyoru Məmmədkəbir Hacıoğlu vermişdi. Tamaşa bir növ Hacıoğlunun benefisi idi. O, əsərin qəhrəmanı Kərəmovu çox maraqlı və şirəli, koloritli və real bir şəkildə canlandırırdı. Digər rollarda Nəzir Məmmədov (Salmanov), Heybət Cəfərov (Mirzə Hüseyn), Rzabala Rzayev (Dəmirçi Musa), Ziyafət Mirzəyeva və Bilqeyis Ələsgərova (Zalxa), Əyyub Məmmədov (Surxay), Məmməd Tahirov və Aleksandr Lalayev (Şeyda), Məryəm Məmmədova (Kamilə), Şabay Bağbanlı (Mehralı), Mehbalı Rəhimov (Şirəli), Ə.Tağıyev və Yunis Qarabağlı (Birinci kolxozçu), İ.Sadıqov və Setrak Seyranov (İkinci kolxozçu), Əbdülcabbar Əliyev (Üçüncü kolxozçu), Ə.Hüseynov (Dördüncü kolxozçu) iştirak edirdilər.

Süleyman Rüstəmin «Qaçaq Nəbi» qəhrəmanlıq dramı və Üzeyir bəy Hacıbəylinin «Əsli və Kərəm» operası təkrar quruluşda oynanıldı. Bu tamaşalar əvvəlki quruluşlardan heç bir yeni məziyyəti ilə seçilmirdi. 1943 və 1944-cü illərin cari repertuarında «Eşq və intiqam» (Süleyman Sani Axundov), «Aydın», «Almaz» (Cəfər Cabbarlı), «Fərhad və Şirin» (Səməd Vurğun), «Məhəbbət» (Mirzə İbrahimov), «Otello» (Uilyam Şekspir), «Toy» (Sabit Rəhman), «El oğlu» (Abdulla Şaiq) tamaşaları da vardı. Teatrın yaradıcı kollektivi nə qədər səy göstərsə də, repertuar seçimində təkrardan qaça bilmirdi. «Otello» tamaşasında İbrahim Azəri (Otello), Məmmədkəbir Ha-

cıoğlu və Yusif Vəliyev (Yaqo), Cəlil Bağdadbəyov (Senator), Heybət Cəfərov (Rodriqo), Sima Hidayətzadə (Dezdemona), Oqtay Xəlilov (Kassio), Bilqeyis Ələsgərova (Emiliya) öz ifalarında Şekspir ruhuna daha yaxın idilər.

1945 - 1946-cı il teatr mövsümündə kollektivin bir neçə uğurlu yaradıcılıq axtarışları oldu. Sabit Rəhmanın «Aşnalar» komediyasını aktyor Oqtay Xəlilov tamaşaya hazırladı. Premyera 1946-cı ilin başlanğıcında oldu. Əsas rolları Nəzir Məmmədov (Gülümov), Zahid Məlikov (Səməndərli), Əbdülcabbar Əliyev (Əlikişi), Mustafa Əhmədzadə (Anbar Hüseyn), Sədayə Mustafayeva və Məryəm Məmmədova (Rəhilə), Hökümə İsmayılova (Qumru), Zahid Zeynallı (Ağazadə), Səttar İsmayılov (Qənbər), Məmməd Tahirov (Murad), Yəhya Xəlilov (Qurbanov) ifa etdilər.

Tənqid aktyor çıxışlarını ümumən bəyənir, bəzi ifaçıların oyunlarındakı qüsurları da göstərirdi. Resenziya müəllifi «Aşnalar»ın səhnə təfsirindən bəhs edəndə yazır ki, «əsəri gənc rejissor Oqtay Xəlilov hazırlamışdır. O, ümumiyyətlə, istər rollar bölgüsündə və istərsə də quruluşun verilməsində müvəffəqiyyət qazana bilmişdir. Lakin ikinci və dördüncü şəkillərdə gediş-gəliş yolunun yalnız bir yerdən verilməsi və bu yoldan hamının girib-çıxması düzgün deyildir» (12).

1945-ci ilin payız mövsümü yenicə açılanda teatr «İntizar» (Mehdi Hüseyn və İlyas Əfəndiyev) tamaşasını təhvil verdi. Tamaşanın quruluşçu rejissoru Mikayıl





Ağayev idi. Əsas rolları Məmməd Tahirov (Qambay), Sədayə Mustafayeva və Hökümə İsmayılova (Gülyaz), Şirin Cəfərova (Sürəyya), Yusif Vəliyev (Alxas bəy), Oqtay Xəlilov (Tofiq), Məmməd Xalıqov (Zeyniş), Ə. Tağıyev (Cəfər) oynayırdılar.

Mərkəzi mətbuat «İntizar» tamaşası haqqında akademik Məmməd Arifin resenziyasını çap etmişdi. Müəllif yazırdı ki, «Bu teatrda üç şey diqqəti cəlb edir: səhnə vəhdəti, oyunun çətinliyi və dil təmizliyi.

Aktyorların oyununa tamaşa edərkən bütün səhnələrin, hətta bütün əsərin yekparə, vahid bir tam təşkil etdiyini görürsən. Parçalar, səhnələr, əda və hərəkətlər, mükalimələr arasında bədii bir uyğunluq, bir intizam mövcuddur... Nuxa teatrında aktyorların olduqca düzgün ədəbi bir dildə danışması, azacıq belə olsa şivə və ləhcə qarışıqlığına yol verilməməsi teatrın böyük qələbələrindəndir.

Bütün bunlar göstərir ki, teatrın aktyor heyəti doğru bir yaradıcılıq yolu ilə inkişaf edir, səhnəyə böyük bir sənət məktəbi kimi baxır, tamaşaçıları tərbiyə etdiyi kimi özü də burada tərbiyələnir, böyüyür və inkişaf edir...

Alxas bəy rolunda Yusif Vəliyevin oyunu təqdirəlayiqdir, təbii və öz ölçüsündən kənara çıxmayan bir temperamentlə o aktyor canlı və təsirli bir surət yaradır. Alxas bəyin bir bədii surət olaraq məziyyətini bu istedadlı artistin oyununda daha parlaq görür və hiss edirik.

Nuxa teatrının çalışqan və həvəsli aktyor heyətinə kömək edərkən çalışmaq lazımdır ki, o, əldə etdiyi və teatr üçün ənənə şəklinə saldığı yaxşı cəhətləri daha da möhkəmləndirsin, həmişə qabaqcıl teatrların yaxşı təcrübələrinə arxalansın, sənətin yeni yaradıcılıq sirrlərinə bələd olsun» (13).

Elə buradaca qeyd etmək lazımdır ki, həmin dövrdə əksər rayon teatrlarında kollektivlərin səhnə danışıqlarında ciddi qüsurlar mövcud idi. Göründüyü kimi, Şəki teatrının yaradıcılığında bu məsələ sənətkarlıqla formalaşmışdı.

Teatrın yaradıcılıq uğurlarından yazan digər müəllif öz məqaləsində göstərirdi ki, «respublikamızın əməkdar artisti Məmmədkəbir Hacıoğlu, aktyor Yusif Vəliyev, aktrisalardan Şirin Cəfərova (aktrisanın adı bəzi proqramlarda Şirinbacı, soyadı Cəfərzadə yazılıb – *İ.R.*), Hökümə İsmayılova, Bilqeyis Ələsgərova kimi gənc səhnə ustaları ilə Nuxa teatrı böyük, mürəkkəb əsərlərin öhdəsindən gəlir...

Nuxa teatrı yaradıcı heyətinin yaxşı cəhətlərindən biri də artistlərin hər bir tamaşada əsərlərin mətninə düzgün riayət etmələri və bir kəlmə də olsa əsərdən kənara çıxmamalarıdır» (14).

Mətbuat onu da qeyd edirdi ki, teatrın tamaşaçı salonu cəmi 200 nəfərlikdir, bir sıra texniki imkanlar primitivdir. Bu çatışmazlıqlar müasir tamaşaçıların artan tələbatını ödəmirdi. Xüsusən maraqlı tamaşalarda xeyli sənət pərəstişkarı yerin azlığından bayırda qalmalı olurdu. Buna baxmayaraq, teatr özünün yaradıcılıq üslubunun formalaşması üzərində səy və inamla çalışırdı.





Mikayıl Ağayev dramaturq Rza Şahvələdin «Qız qalası» (rəssam Ağa Tahirov) dramına maraqlı forma-kompozisiyada quruluş verdi. Vətənpərvərlik ruhu aşılayan, bir qədər romantik xarakterli tamaşada rollarda Yusif Vəliyev və Məmmədkəbir Hacıoğlu (Xan), Hökümə İsmayılova (Durna), Nəzir Məmmədov (Vəzir), Yunis Qarabağlı (Xanəndə), Mustafa Əhmədzadə (Aşıq), Zahid Məlikov (Murad), Əbdülcabbar Əliyev (Gözətçi), Səttar İsmayılov (Çingiz), Bilqeyis Ələsgərova (Yengə), Yəhya Xəlilov (Kəndbaşı), Bəyim Əliyeva (Anaqız. Aktrisanın adı bəzi proqramlarda Bəyimə yazılıb), Şirin Cəfərova (Səhərbənd), Sədayə Mustafayeva (Gülyaz) çıxış edirdilər.

«Qız qalası» tamaşasına resenziya yazan müəllif dörd aktyorun ifasına daha yüksək qiymət verir: «Xan rolunu respublikanın əməkdar artisti Məmmədkəbir Hacıoğlu və istedadlı artist Yusif Vəliyev yoldaşlar oynayırlar. Biz hər şeydən əvvəl bunu qeyd etməliyik ki, bu mürəkkəb və çətin obrazı hər iki artist müvəffəqiyyətlə yarada bilmişlər. Lakin onların yaratmış olduqları Xan obrazları arasında çox böyük fərq olduğunu demədən keçmək olmaz. Hacıoğlu yoldaş Xanı mülayim xasiyyətli, lakin həyəcanlı, gülər üzlü, lakin bədbin, kəskin düşüncəli bir obraz kimi verir. Yusif Vəliyev isə Xan rolu ilə dərin düşüncəli, coşqun xasiyyətli (bu coşqunluq onun danışıq və hərəkətlərində deyil, qəlbindədir), lirik, sevginin amansız pəncəsində çırpınan bir obraz yaradır. Lakin bunlarla bərabər, yenə qeyd etməliyik ki, hər iki artistin

yaratdığı obraz diqqətə şayandır və əsərin əsas ruhu ilə uyğun gəlir.

Xalq qəhrəmanı Gündüz rolunda çıxış edən Məmməd Tahirov yaratdığı obrazı başa düşmüşdür. Buna görə də o, xalq qəhrəmanının cəngavərliyini və vətənpərvərliyini yaxşı ifa edir, obrazın qarşısında duran vəzifəni tamaşaçılara lazımınca çatdırır.

Səhərbənd rolunu ifa edən Şirin Cəfərova obrazın ən kiçik nöqtələrini belə gözündən qaçırmamışdır. İldırım qədər sürətli, aslanlar qədər cəsarətli, sərin bahar səhərinin xəfif küləkləri qədər mülayim xasiyyətlərə malik olan Səhərbənd öz varlığını Şirin Cəfərovada tapa bilmişdir» (15). Bu resenziyada rəssam Ağa Tahirovun tamaşaya verdiyi bədii tərtibatın cazibədarlığı xüsusi qeyd edilir.

1947-ci ildə teatr dalbadal iki musiqili komediya hazırladı. Aprel ayının əvvəlində quruluşçu rejissor Mikayıl Ağayev və rəssam Ağa Tahirov dramaturq Məhərrəm Əlizadə ilə bəstəkar Fikrət Əmirovun «Gözün aydın» operettasını təhvil verdilər. Tamaşada Hökümə İsmayılova (Sevgili), Şirin Cəfərova (Mehparə), Mustafa Əhmədzadə (Fantanov), Türhüd Qasımov və Əmir Qasımov (Səlyanski), Məmmədkəbir Hacıoğlu və Cəfər Seyidzadə (Qəhrəman), Bilqeyis Ələsgərova (Nargilə), Yunis Qarabağlı və Ənvər Mahmudov (Alay), Səyyarə İsmayılova (Leyla xala), Bəyim Əliyeva (Gülərüz) təbii və şirəli obrazlar təqdim edirdilər.

«Nuxa fəhləsi» qəzeti yazırdı ki, «teatrın bədii rəhbəri Mikayıl Ağayev yoldaş əsərin hazırlanmasında, onun





bədii boyalarla nümayiş etdirilməsində, mizanların, xüsusən rəqslərin yerli-yerində verilməsində səmərəli əmək sərf etmişdir.

Sevgili rolunda aktrisa Hökümə İsmayılova səmimidir. Onun dörd il müharibə zamanı bütün ürək çırpıntıları və həyəcanları bir məqsəd üçün – arxa cəbhədə əmək nailiyyətləri göstərməklə düşmən üzərində qələbəni təmin etmək üçündür. Səhnədə Sevgilinin sovet qızlarına xas olan bu xüsusiyyətləri aydın surətdə əks etdirilir. Şıltaq və tənbəl, həyatda hələ də yerini tapmaqda aciz olan Mehparə surətini aktrisa Şirin Cəfərova tamaşaçılara lazımınca çatdıra bilir» (16).

İyun ayının ilk günlərində teatr rejissor Mikayıl Ağayevin quruluşunda dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmovun «Durna» musiqili komediyasını tamaşaçılara göstərib. Şən ovqat, təbii yumor üzərində qurulmuş tamaşada musiqi partiturada olduğundan zəif səslənirdi. Ancaq aktyorlar komediya janrının prinsiplərinə bacarıqla əməl etməyə çalışırdılar. Şirin Cəfərova və Hökümə İsmayılova (Durna), Yunis Qarabağlı və Ənvər Mahmudov (Aşıq Murad), Bilqeyis Ələsgərova (Lalə), Mustafa Əhmədzadə və Türhüd Qasımov (Dursun), Zahid Məlikov (Kərim), Səyyarə İsmayılova və Lena Cəfərova (Nisə xala), Səttar İsmayılov (Nəcəf), Bəyim Əliyeva (Şərəf), Setrak Seyranov (Hilal), Sabir Məmmədov (Surxay) cazibəli oyunları ilə tamaşaçıların rəğbətini qazana bilirdilər.

Operetta tamaşalarını teatrın yığcam ansamblı müşayiət edirdi. Çalğıçıların azlığı və teatrın binasındakı orkestr çökəyinin darısqallığı mürəkkəb nömrələrin tam şəkildə ifalarına imkan vermirdi. Buna görə operettaların uvertüraları, xor nömrələri tamaşadan çıxarılırdı. Gülçöhrə, Əsgər, Sərvər, Gülnaz kimi obrazların mürəkkəb ariyaları sadələşdirilir, səs tonu aşağı salınırdı. Bütün bunlara baxmayaraq, tamaşaçılar musiqili komediyalara daha böyük maraq göstərirdilər.

Fəaliyyətinin son iki-üç ilində teatrın uşaq və məktəblilər üçün hazırladığı tamaşalar da olub. Kollektiv «Qırmızı qalstuk», «Dostlar», «Bayram günü», «El oğlu» tamaşalarını da oynayıb. «Qırmızı qalstuk» nisbətən istisna olmaqla, həmin tamaşalar həm ideya-bədii, həm də teatrallıq baxımından qüsurlu idi. Siyasi mövzuda «Bizim seçkilər» (Zahid Zeynallı) kimi primitiv əsərlər də repertuara yol tapırdı.

Bu tamaşaların içərisində Sergey Mixalkovun «Qırmızı qalstuk» pyesinin tamaşası nisbətən uğurlu alınmışdı. Tamaşanın quruluşçu rejissoru teatrın aktyoru Yusif Vəliyev, rəssamı Ağa Tahirov idi. Açıq təbliğatın, pafoslu didaktikanın ağırlıq gətirdiyi tamaşada aktyorlar Zahid Zeynallı (Vişnyakov), Şirin Cəfərova (Nadejda İvanovna), Türhüd Qasımov (Valeri), Hökümə İsmayılova (Marina), Aleksandr Lalayev (Şura), Bilqeyis Ələsgərova (Nənə), Mustafa Əhmədzadə (Çaşkin), Nəzir Məmmədov və Əmir Qasımov (Müəllim) öz rollarına səylə çalışmışdılar.





Yeri gəlmişkən, qeyd etmək istəyirəm ki, teatrın qabaqcıl aktyorları Yusif Vəliyev, Məmməd Xalıqov, Rzabala Rzayev rejissor qıtlığına görə müəyyən tamaşalara quruluşlar veriblər. Onların bu istiqamətdə də müəyyən yaradıcılıq nailiyyətləri olub. Ən əsası bu idi ki, teatrın aparıcı sənətkarlarının quruluş verdikləri tamaşalarda aktyor ansamblı dəqiq seçilirdi.

1947 – 1948-ci il teatr mövsümündə kollektiv Cəfər Cabbarlının «Aydın» dramını əsaslı bərpada repertuara daxil etdi. Əsas rolları Yusif Vəliyev (Aydın), Şirin Cəfərova (Gültəkin) və Bilqeyis Ələsgərova (Böyükxanım) ifa edirdilər.

Salyan və Sabirabad teatrlarında baş rejissor işləmiş Cahangir Məmmədov (Aslanoğlu) 1948-ci ildə Şəki teatrına bədii rəhbər təyin edildi. Həmin ildən teatr bağlanana, yəni 1949-cu ilin yazına qədər kollektivin repertuarında Cəfər Cabbarlının «Solğun çiçəklər», «Aydın», Əyyub Abbasovun «Məlik Məmməd», Üzeyir bəy Hacıbəylinin «Arşın mal alan», Səttar Axundovun «Dostlar» və «Bayram günü», dramaturq Məhərrəm Əlizadənin və bəstəkar Ağası Məşədibəyovun «Toy kimindir?», Tələt Əyyubovun «Laçın», İlyas Əfəndiyevin «Bahar suları» əsərlərinin tamaşaları vardı.

Teatrın bədii rəhbəri kimi Cahangir Aslanoğlunun daha maraqlı işi «Bayram günü» (Səttar Axundov) tamaşası idi. Səhnə əsərinə bədii tərtibatı Ağa Tahirov vermişdi. Rollarda Hökümə İsmayılova (Zərif), Şirin Cəfərova (Narxanım), Türhüd Qasımov (Cəmil), Məmmədkəbir

Hacıoğlu (Bəndalı), Səttar İsmayılov (Həsən kişi), Bilqeyis Ələsgərova (Püstə xala), Zahid Məlikov (Qurban), Ramiz Sadıqov (Əli) çıxış edirdilər. Hadisələr faşist Almaniyası üzərində 1945-ci il 9 may qələbəsindən sonra bir kolxozda baş verir.

Tamaşaya resenziya yazan müəllif əsasən üç aktyorun oyununu daha yüksək qiymətləndirir. «Əsərdəki surətləri ifa edən artistlərin yaradıcılığında da müvəffəqiyyətlər vardır. Hökümə İsmayılova traktorçu qız Zərifin daxili həyəcanlarını, onun müqəddəs sevgisini, çalışqanlığını məharətlə göstərir. Şirin Cəfərzadənin hərəkətlərində də Narxanımın əvvəlki vüqarı, getdikcə həyatı dərk edib təvazökarlığı, daha sonra nəcib duyğuları və sevgisi doğru-düzgün boyalarla əks etdirilir. Hər iki aktrisa bu surətlərin səciyyəvi cəhətlərini yaxşı hiss edir və tamaşaçılara çatdırırlar.

Artist Türhüd Qasımovun yaratdığı cavan kolxozçu Cəmil surəti də maraqlıdır. Onun traktorçuluğu öyrənməyə olan həvəsi bütün əsər boyu qabarıq boyalarla təsvir edilir. Cəmil texnikaya sahib olmaq arzusu ilə yaşayan minlərlə kəndli gənclərimizin qabaqcıl nümayəndəsi kimi tamaşaçıların hüsn-rəğbətini qazanır» (17).

Cahangir Aslanoğlunun quruluş verdiyi Cəfər Cabbarlının «Solğun çiçəklər» (rəssam V.Hüseynov) melodraması 1949-cu ilin mart ayında göstərildi. Bu tamaşa kollektivin son yaradıcılıq işi idi və cəmi beş dəfə oynanıldı.





Rəğbətlə qarşılanan tamaşada rolları Hökümə İsmayılova (Sara), Türhüd Qasımov (Bəhram), Bəyim Əliyeva (Pəri), Ramiz Sadıqov (Əbdül), Bilqeyis Ələsgərova (Gülnisə) ifa edirdilər.

* * *

Respublikanın görkəmli səhnə xadimləri Şəki Dövlət Dram Teatrının dəvəti ilə buraya fərdi qastrollara gəlirdilər. Onların gəlişləri aktyorlar üçün böyük məktəb, tamaşaçılar üçün isə əsl sənət bayramı olurdu. Musiqili Komediya Teatrının aparıcı sənətkarlarından olan Lütfəli Abdullayev 1948-ci ildə Şəkiyə gələrək yerli aktyorlarla «Arşın mal alan» (Vəli), «Gözün aydın» (Qəhrəman), «Məşədi İbad» (Hambal), Milli Dram Teatrının aktyorları Ələsgər Ələkbərov, Sidqi Ruhulla, Əli Qurbanov və Mirvari Novruzova «Vaqif» (Vaqif, Qacar, Vidadi, Gülnar), Mirzağa Əliyev «Toy» (Kərəmov), Rza Əfqanlı «Oqtay Eloğlu» (Oqtay), Ağasadıq Gəraybəyli «Xoşbəxtlər» (Nəsirov), İsmayıl Dağıstanlı 1949-cu ildə «Otello» (Otello) və «Solğun çiçəklər» (Bəhram) tamaşalarında oynayıblar.

Teatrın bir sıra tamaşaları uğurlu aktyor oyunları ilə diqqəti cəlb edirdi. Uzun müddət tamaşaçıların yaddaşında qalan rollar oynamış aktyorların əsas səhnə obrazlarını xatırladıram.

Cəlil Bağdadbəyov: Hacı Qara («Hacı Qara»), Məşədi Hüseyn («Həyat»), İmamverdi («1905-ci ildə»), Qurban kişi («Vaqif»).

İbrahim Azəri: Əlimərdan («Eşq və intiqam»), Hacı Əhməd («Almaz»), Soltan bəy («Arşın mal alan»), Dəmirçi Musa («Toy»).

Məmmədkəbir Hacıoğlu: Kərəmov («Toy»), Altunbay («Od gəlini»), Bərbərzadə («Xoşbəxtlər»), Əsgər («Arşın mal alan»).

Yusif Vəliyev: Aydın («Aydın»), Alxas bəy («İntizar»), General-qubernator («1905-ci ildə), Vaqif («Vaqif»).

Kamil Qubuşov: Polad Qartal («Polad Qartal»), Balaş («Sevil»), Qoçu Əsgər («Məşədi İbad»), Süleyman («Həyat»).

Sərxan Mustafayev: Bahadır bəy («1905-ci ildə»), Əbdüləli bəy («Sevil»), Hacı Qənbər («Hacı Qənbər»), Heydər bəy («Hacı Qara»).

Əliməmməd Novruzov: Pardon Qurbanəli («Həyat»), Vəli («Arşın mal alan»), Cəbi («Hacı Qənbər»), Məşədi Qəzənfər («Məşədi İbad»).

Məmməd Xalıqov: Atakişi («Sevil»), Əmiraslan bəy Salamov («1905-ci ildə»); Soltan bəy («Arşın mal alan»), Oddamdı («Od gəlini»).

Rzabala Rzayev: Vaqif («Vaqif»), Hacı Əhməd («Almaz»), Qaya («Bahar»), Süleyman («Həyat»).

Məzahir Abbasov: Nəsir («Polad Qartal»), Abbas («Həyat»), Heydər bəy («Hacı Qara»), Surxay («Toy»).

Həsən Hüseynov: Babakişi («Sevil»), Qıdı kirvə («Hacı Qənbər»), Qoçu Əsgər («Məşədi İbad»), Həsənov («Həyat»).





Zahid Zeynallı: Baxşı («1905-ci ildə»), Mahmud («Hacı Qənbər»), Rza bəy («Məşədi İbad»), Ağazadə («Aşnalar»).

Yunis Qarabağlı (Məmmədov): Usta Segah («Xoşbəxtlər»), Sərvər («Məşədi İbad»), Ocaqqulu («Almaz»), Süleyman («Arşın mal alan»).

Mustafa Əhmədzadə: Səlim («Aydın»), Ambar Hüseyn («Aşnalar»), Aşıq («Qız qalası»), Dursun («Durna»).

Aleksandr Lalayev: Əli bəy («Vaqif»), İvanov («Çətin dərə»), Qüdrət («Bahar»), Həsənqulu bəy («Məşədi İbad»).

Nurəhməd Hümmətov: Cəlal («Həyat»), İntiligent Həsən («Məşədi İbad»), Əbu Übeyd («Od gəlini»), Şeyx Alı («Vaqif»).

Əyyub Məmmədov: Mürşüd («Xoşbəxtlər»), Müsyö Jordan («Müsyö Jordan və dərviş Məstəli şah»), Əsgər («Xasay»), Əbdək («Nizami»).

Heybət Cəfərov: Oddamdı («Od gəlini»), Veysəl Mirzə («Bahar»), Savçinski («Qaçaq Nəbi»), Qəşəm Məmişov («Məhəbbət»).

Əbdülcabbar Əliyev: Tamada («Həyat»), Məşədi Qəzənfər («Məşədi İbad»), Musa («Qaçaq Nəbi»), Rəsul («Xasay»).

Abbas Hüseynov: Əliş («Polad Qartal»), Akif («Həyat»), Zülfüqar («Vaqif»), Məmmədəli bəy («Aydın»).

Mahmud Məmmədov: Musa («Həyat»), Eldar («Vaqif»), Rəbi («Od gəlini»), Məşədi Qəzənfər («Məşədi İbad»).

Şirəli Allahyarov: Toğrul («Od gəlini»), Xəlil («Həyat»), Yeqor («Namus»), Xəlil Yüzbaşı («Hacı Qara»).

Əlisəttar Yusifzadə: Ələkbər («Polad Qartal»), Cəbi («Hacı Qənbər»), Zeynal («Həyat»), Arçel («Vətən namusu»).

Türhüd Qasımov: Oqtay («Oqtay Eloğlu»), Cəmil («Bahar suları»), Səlyanski («Gözün aydın»), Dursun («Durna»).

Qulam Qoşqarlı: Rəsul («Xasay»), Dərviş Abbas («Molla İbrahimxəlil kimyagər»), Yaqor («Vətən namusu»), Həsənov («Həyat»).

Şabay Bağbanlı: Mehralı («Toy»), Mühafizəçi («Nizami»), Komandir («Vətən oğlu»), Nurullayev («Aslan yatağı»).

Yəhya Xəlilov: Kəndbaşı («Qız qalası»), Qurbanov («Aşnalar»), Xəlil («Qaçaq Nəbi»), Əli («Çətin dərə»).

Nəzir Məmmədov: Vəzir («Qız qalası»), Salmanov («Toy»), Şahmar («Aslan yatağı»), Vəli («Nizami»).

Səttar İsmayılov: Qənbər («Aşnalar»), Nəcəf («Durna»), Çingiz («Qız qalası»), Cahangir («Namus»).

Məmməd Tahirov: Murad («Aşnalar»), Şeyda («Toy»), Munis («Nizami»), Müsyö Jordan («Müsyö Jordan və dərviş Məstəli şah»).

Bilqeyis Ələsgərova: Zalxa («Toy»), Maral («Xoşbəxtlər»), Böyükxanım («Aydın»), Gülçöhrə («Arşın mal alan»).

Hökümə İsmayılova (Qasımova): Gültəkin («Aydın»), Raya («Özgə uşağı»), Məryəm («Fərhad və Şirin»), Yaqut («Məlik Məmməd»).







Şəkidə ilk teatr tamaşası 1879-cu ildə barama anbarı olan bu binada göstərilib.



Teatrın ilk aktyor truppası. 1933-cü il



Teatrın yaradıcı heyəti. 1938-ci il



Teatrın geyim, butafor və rekvizit sexlərinin işçiləri. 1938-ci il





Teatrın bədii şura üzvləri. 1939-cu il



Teatrın kollektivinin bir qrupu. 1945-ci il

«Od gəlini»,
Cəfər Cabbarlı. 1939-cu il



Elxan – Yusif Vəliyev



Oddamdı – Məmməd Xalıqov



Tamaşadan səhnə



Solmaz – Tamara Kərimova



Rəbi – Mahmud Məmmədov



Altunbay –
Məmmədkəbir Hacıoğlu



Aqşin –
Heybət Cəfərov



Yanardağ – Yunis Məmmədov



Qorxmaz – Əyyub Məmmədov



Tamaşadan səhnə

«Toy»,
Sabit Rəhman. 1940-cı il



Surxay –
Yusif Vəliyev



«Toy»,
Sabit Rəhman. 1940-cu il



Musa – Rzabala Rzayev



Zinyət – Tamara Kərimova



Kərəmov –
Məmmədkəbir Hacıoğlu



Zalxa –
Bilqeyis Ələsgərova



Mirzə Hüseyn –
Məmməd Xalıqov



Kəmalə –
Asya İsmayılova



Tamaşadan səhnə



Tamara Kərimova: Mariya Timofeyevna («1905-ci ildə»), Süsən («Namus»), Nərgiz («Polad Qartal»), Atlas («Həyat»).

Böyükxanım Axundova (Qubuşova): Dilbər («Sevil»), Həyat («Həyat»), Gülçöhrə («Arşın mal alan»), Yetər («Hacı Qənbər»).

Xalidə Məmmədova: Gülüş («Sevil»), Telli («Arşın mal alan»), Cəvahir xanım («Hacı Qənbər»), Gülsüm («1905-ci ildə»).

Sədayə Mustafayeva: Nübar («Çətin dərə»), Şərəfnisə («Müsyö Jordan və dərviş Məstəli şah»), Çimnaz («Qaçaq Nəbi»), Sürmə («Almaz»).

Gülrux Zahidova: Cəvahir xanım («Hacı Qənbər»), Sevil («Sevil»), Nisə («Polad Qartal»), Tamara («Vaqif»).

Xeyransa Şabayeva: Nabat («1905-ci ildə»), Dilbər xanım («Hacı Qənbər»), Tükəz («Hacı Qara»), Xuraman («Vaqif»).

Fatma Şabayeva: Laçın («Bahar»), Marfa («Özgə uşağı»), Polina («Vətən oğlu»), Xanpəri («Məhəbbət»).

Sara Canıyeva: Gülər («Xoşbəxtlər»), Sara («Xasay»), Solmaz («Od gəlini»), Asya («Arşın mal alan»).

Səriyyə Həsənova: Gülgün («Od gəlini»), İnci («Xoşbəxtlər»), Badam («Xasay»), Həyat («Həyat»).

Sima Hidayətzadə: Dezdemona («Otello»), Sona («Dağılan tifaq»), Almaz («Almaz»), Vəfa («Vəfa»).

Şirin Cəfərova (Şirinbacı Cəfərzadə): Böyükxanım («Aydın»), Həcər («Eşq və intiqam»), Firəngiz («Oqtay Eloğlu»), Firuzə («Vəfa»).

Bəyim Əliyeva: Pəri («Solğun çiçəklər»), Anaqız («Qız qalası»), Xanımnaz («Almaz»), Yasəmən («Eşq və intiqam»).

Məryəm Məmmədova: Gülçöhrə («Müsyö Jordan və dərviş Məstəli şah»), Zəhra («Məhəbbət»), Kamilə («Toy»), Nərgiz («Çətin dərə»).

Xanım Rəfiyeva: Xanpəri («Müsyö Jordan və dərviş Məstəli şah»), Zeynəb («Məhəbbət»), Dəstəgül («Nizami»), Rəhilə («Aşnalar»).

Zəhra Mirzəyeva: Yaxşı («Almaz»), Məhsəti Gəncəvi («Nizami»), Sənəm («Məşədi İbad»), Xanımnaz («Həyat»).

Asya İsmayılova: Bahar («Bahar»), Gülnar («Vaqif»), Gülər («Xoşbəxtlər»), Asya («Arşın mal alan»).

Səyyarə İsmayılova: Leyla xala («Gözün aydın»), Naznaz («Beş manatlıq gəlin»), Nisə xala («Durna), Qumru («Bahar»).

Mikayil Ağayevin quruluş verdiyi əsas tamaşalar: «Otello» (Uilyam Şekspir), «Məhəbbət» (Mirzə İbrahimov), «Eşq və intiqam» (Süleyman Sani Axundov), «Dağılan tifaq» (Əbdürrəhim bəy Haqverdiyev), «Qız qalası» (Rza Şahvələd), «Oqtay Eloğlu» (Cəfər Cabbarlı), «Durna» (dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmov).

Hacıbaba Səlimovun quruluş verdiyi əsas tamaşalar: «Hacı Qara» (Mirzə Fətəli Axundzadə), «Xasay» (Abdulla Şaiq), «Arşın mal alan» (Üzeyir bəy Hacıbəyli),





«Aydın» (Cəfər Cabbarlı), «Bahar» (Məmmədhüseyn Təhmasib).

Heybət Cəfərovun quruluş verdiyi əsas tamaşalar: «1905-ci ildə» (Cəfər Cabbarlı), «Beş manatlıq gəlin» (dramaturq Məmməd Səid Ordubadi və bəstəkar Səid Rüstəmov), «Məlik Məmməd» (Əyyub Abbasov).

Əsəd Cəfərovun quruluş verdiyi əsas tamaşalar: «Həyat» (Mirzə İbrahimov), «Vətən namusu» (Georgi Mdivani), «Qaçaq Nəbi» (Süleyman Rüstəm).

Şəki Dövlət Dram Teatrının aktyorlarından Məmmədkəbir Hacıoğlu 23 fevral 1940-cı ildə və Bilqeyis Ələsgərova 1 iyun 1956-cı ildə (xalq teatrında fəaliyyət göstərəndə) Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif ediliblər.

Kollektiv öz səhnəsində çıxış etməklə yanaşı, müəssisələrdə, təsərrüfatlarda səyyar tamaşalar göstərir, qonşu rayonlara qastrol səfərlərinə gedirdi. Respublika paytaxtının tamaşaçıları ilə görüşmək ona nəsib olmadı. Bununla belə, teatr Bakı mühitindən heç də təcrid edilməmişdi. Yazıçılar, teatrşünaslığa maraq göstərən filoloqlar, sənətsevərlər ayrı-ayrı tamaşaların sorağı ilə Şəkiyə gəlirdilər. Onlar həm tamaşalara baxır, həm də həmin əsərləri kollektivlə müzakirə edirdilər. Bəzi rəylər yerli mətbuatda, az qisim isə respublika qəzetlərində dərc edilirdi.

* * *

1948-ci ildə SSRİ Nazirlər Sovetinin qərarı ilə bütün teatrlar özünü maliyyələşdirmə sisteminə keçib. Maddi çətinliklərlə qarşılaşan Şəki teatrı 1949-cu ilin birinci yarısında ştatda xeyli ixtisarlar edib. Payızda isə fəaliyyətini tam dayandırıb. Teatrın əmlakı şəhər mədəniyyət evinə verilib. Yusif Vəliyev əvvəl Azərbaycan Dövlət Rus Dram Teatrına, az sonra Gənc Tamaşaçılar Teatrına, Hökümə Qasımova (İsmayılova), Böyükxanım Axundova (Qubuşova) və Kamil Qubuşov Milli Dram Teatrına, Sədayə Mustafayeva Ağdaşa (sonra Gəncə teatrına), Əbdülcabbar Əliyev «Azərbaycanfilm» kinostudiyasına (o vaxt «Bakı studiyası» adlanırdı) gəliblər. Abbas Hüseynov və Xalidə Hüseynova-Məmmədova Bakıda estradada fəaliyyət göstərmişlər.



Tamaşadan sonra. 1938-ci il





# XALQ TEATRI

Teatr bağlananda onun vəsaiti, texniki avadanlığı, geyim, butafor, dekorasiya ehtiyatı şəhər mədəniyyət evinə verildi. Tezliklə burada dram dərnəyi yaradıldı. Səhnə həvəskarlarından ibarət kollektiv Azərbaycan Respublikasının Əməkdar artisti, dövlət teatrının aktyoru olmuş Məmmədkəbir Hacıoğlunun rəhbərliyi ilə fəaliyyətə başladı. Dram dərnəyi Mirzə Fətəli Axundzadənin «Hacı Qara», Nəcəf bəy Vəzirovun «Hacı Qənbər», Əbdürrəhim bəy Haqverdiyevin «Bəxtsiz cavan», Cəfər Cabbarlının «Solğun çiçəklər» əsərlərini tamaşaya hazırladı.

1959-cu ilin sentyabrında Azərbaycan Nazirlər Soveti yerlərdə özfəaliyyət dram dərnəklərini və xalq teatrlarının fəaliyyətlərini gücləndirmək üçün xüsusi qərar qəbul etdi. Bu qərara əsasən respublikanın dövlət teatrları müxtəlif rayonlarda səhnə sənətinin inkişafına məsul edildilər. Bugünkü Akademik Milli Dram Teatrı Şəki şəhərinə təhkim olundu. Qədim sənət ocağının

qayğı və yardımı, yerli həvəskarların coşqun səhnə ehtirası ilə səmərəli fəaliyyət göstərən dram dərnəyinə 1959-cu ilin oktyabrında xalq teatrı adı verildi. Şəkililər Azərbaycanın xalq teatrı adına layiq görülmüş 9 özfəaliyyət kollektivindən biri idi.

Xalq teatrı tamaşaçıların görüşünə Səttar Axundovun «Məhəbbət nişanəsi» dramının tamaşası ilə gəldi. Tamaşanın premyerası 1960-cı il yanvar ayının əvvəllərində oldu. Tamaşanın quruluşçu rejissoru Məmmədkəbir Hacıoğlu idi. Əsas rolları Zahid Mustafayev (Şahid), Ziyəddin Əliyev (Kamal), Xanımzər Ərəbova (Mehriban), Rəhilə Kərimova (Yasəmən), Ələddin Məmmədov (Briqadir) ifa edirdilər (bax: 18).

Şəki xalq teatrı Zaqatala, Qax, Oğuz, Şəmkir, Gədəbəy, Kəlbəcər, Yevlax, Mingəçevir, Gəncə və Bakı rayon və şəhərlərində qastrollarda olub. Hətta Gürcüstan Respublikasının Azərbaycan türkləri yaşayan bölgələrinə də qastrol səfəri edib. Kollektivdə ilk illər Xanımzər Ərəbova (xalçaçı), Niyazi Mustafayev (fəhlə), Zoya Teryaqova (aqronom), Rəhilə Kərimova (toxucu), Ziyəddin Əliyev (tokar), həmçinin müxtəlif peşə sahibləri Zahid Mustafayev, Əşrəf Orucov, Nazim Bilalov, Fərhad Əliyev kimi həvəskar aktyorlar fəaliyyət göstərirdilər.

Kollektiv 1962 və 1965-ci illərdə xalq teatrlarına birinci və ikinci respublika baxışlarında, 1967-ci ildə keçirilən respublika özfəaliyyət incəsənəti festivalında, Bakıda keçirilən Şəki günlərində (1970), «Teatr Baharı – 1972» festivalında, Azərbaycan milli peşəkar teatrının 100 illiyi





ilə bağlı respublikanın incəsənət bayramlarında uğurla çıxış edib.

1962-ci ildə Bakıda keçirilən xalq teatrlarına baxış müsabiqəsində Şəki kollektivi Əbdürrəhim bəy Haqverdiyevin «Bəxtsiz cavan» tamaşası ilə iştirak edərək üçüncü yerə layiq görülmüşdür.

«Teatr Baharı – 1972»də kollektiv Mirzə Fətəli Axundzadənin «Molla İbrahimxəlil kimyagər» komediyası ilə çıxış edib. İkinci mükafata layiq görülən bu tamaşa Akademik Milli Dram teatrının səhnəsində göstərilib. Kollektiv bu teatrın səhnəsində «Hacı Qara» tamaşasını da oynayıb.

Məmmədkəbir Hacıoğlu Şəki mədəniyyət evinin dram dərnəyində, xalq teatrında rejissor, bədii rəhbər (1950 – 1953 və 1959 – 1973) işləyib. Dram dərnəyinin və xalq teatrının fəal üzvlərindən Bilqeyis Ələsgərova da aktrisalıqla yanaşı, bir müddət kollektivin rəhbəri olub. Əsas rejissorluğu Məmmədkəbir Hacıoğlu edib. Zahid Mustafayev, Nazim Bilalov və Vaqif Kərimov da tamaşalar hazırlayıblar.

Şəki xalq teatrının repertuarında «Molla İbrahimxəlil kimyagər» və «Hacı Qara» (Mirzə Fətəli Axundzadə), «Hacı Qənbər» (Nəcəf bəy Vəzirov), «Bəxtsiz cavan» (Əbdürrəhim bəy Haqverdiyev), «Laçın yuvası» (Süleyman Sani Axundov), «Ölülər» (Cəlil Məmmədquluzadə), «Yaşar», «Aydın» və «Solğun çiçəklər» (Cəfər Cabbarlı), «Fərhad və Şirin» (Səməd Vurğun), «Əcəb işə düşdük» və «Olmadı elə, oldu belə» (Şıxəli Qurbanov), «Alov»

(Mehdi Hüseyn), «Məşədi İbad», «Leyli və Məcnun» və «Əsli və Kərəm» (Üzeyir bəy Hacıbəyli), «Xoşbəxtlər» (Sabit Rəhman), «Həmyerlilər» (Altay Məmmədov), «Qız atası» (Əfqan), «Söz yarası» (Qeybulla Rəsulov), «Azad çoban» və «Fərman və ya ədalət» (Məmmədiyyə Yusifzadə), «Quruyevin aqibəti» (Rüfət Zəbioğlu), «Şirinbala bal yığır» (Salam Qədirzadə), «Günəşi söndürmək olmaz» (Mirzağa Ataş), «Bağışla məni, əzizim» (Lütfəli Həsənov və Hüseyn Rəsulov), «Polad Qartal» (Aleksandr Korneyçuk), «Namus» (Aleksandr Şirvanzadə), «Beş manatlıq gəlin» (dramaturq Məmməd Səid Ordubadi, bəstəkar Səid Rüstəmov), «Durna» (dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmov) tamaşaları vardı. Əksər tamaşaların səhnə tərtibatını şəhərin tanınmış rəssamları Amil Salamov və Ağa Tahirov vermişlər.

Məmmədkəbir Hacıoğlunun rejissor və Yunis Qarabağlının rəssam olduğu «Fərhad və Şirin» tamaşası respublika səviyyəsində uğurla qarşılanmışdı. Tamaşada rolları Şirəli İlyasov (Azər baba), Zahid Mustafayev (Fərhad), Nazim Bilalov və Aleksandr Lalayev (Xosrov), Rəhilə Kərimova (Şirin), İsa Əlimov və Qurban Yusifov (Şapur), Niyazi Əhmədov (Şiruyə), Bilqeyis Ələsgərova (Məhinbanu), Emma Qriqorova (Məryəm), Xanım Rəfiyeva (Fitnə), Rafiq Yunusov və Vaqif Kərimov (Vəzir), İslam Mustafayev (Topal), Nəbi Nəbiyev (Məsləhətçi), Abdulrəşid Məcidov (Ozan), Ramiz Məmmədov (Bizans sərkərdəsi) ifa ediblər.





Xalq teatrının nəzdində Yunis Qarabağlı, Vaqif Kərimov, Nazim Bilalov, Zahid Mustafayev, Fərhad Zeynalov, Ziyəddin Əliyev, Ələddin Xibiyev, Şirəli İlyasov, İsa Əlimov, Adil Əzizov, Ramiz Hacıyev, Əhmədiyyə Mustafayev, Abdulrəşid Məcidov, Lütfəli Məmmədov, Şahid Əbdülkərimov, Şahid Məmmədkərimov, Niyazi Əhmədov, Aydın Əlibalayev, Oqtay Əhmədov, Rafiq Yunusov, Ramiz Məmmədov, Bilqeyis Ələsgərova, Rəhilə Kərimova, Xanımzər Ərəbova, Xanım Rəfiyeva, Sovqat Əhmədova səmərəli yaradıcılıq fəaliyyəti göstəriblər.

Sonralar Bilqeyis Ələsgərova, Şirəli İlyasov, İsa Əlimov Mərziyə Davudova adına Mingəçevir Dövlət Dram Teatrında, Niyazi Əhmədov Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrında işlədilər. Şəki Dövlət Dram Teatrı bərpa olunanda Rafiq Yunusov, Aydın Əlibalayev, Oqtay Əhmədov, Sovqat Əhmədova truppaya aktyor, Yunis Qarabağlı butafor götürüldülər. Nazim Bilalov teatra direktor təyin edildi.

Xalq teatrının peşəkarlıq yönümündə formalaşmasında rejissor və aktyor Məmmədkəbir Hacıoğlunun xüsusi xidməti var. Vaqif Kərimov və Zahid Mustafayev aktyor potensialının əsas aparıcı qüvvələri olmuşlar.

* * *

*Nazim Bilalov (25.4.1929 – 25.1.2001).* Taleyi mədəniyyətlə sıx bağlı olan Nazim Məmməd oğlu Bilalov Şəki şəhərində fəhlə ailəsində doğulmuşdur. 1935 – 1945-ci



illərdə 6 saylı şəhər orta məktəbində oxumuşdur. Şəki Tibb Texnikumunda təhsil alaraq feldşer ixtisasına yiyələnmişdir (1946 – 1949). Bakı şəhər səhiyyə şöbəsində 1952-ci ilədək feldşer, 1953-cü ildən Azərbaycan dəmir yolunda sanitar-epidemoloji qatarın rəisi vəzifəsində çalışmışdır.

Feldşer işlədiyi müddətdə Bakıda tibb işçiləri mədəniyyət evində, Şəki şəhər xalq teatrında aktyorluq etmişdir. Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun mədəni-maarif fakültəsində qiyabi təhsil almışdır (1962 – 1968). 1957-ci ildən 1966-cı ilədək şəhər klubunda müdir, Mirzə Fətəli Axundzadə adına şəhər mədəniyyət evində bədii rəhbər, direktor, Cəfər Cabbarlı adına mədəniyyət evində direktor işləmişdir (1969 – 1975). Onun rəhbərlik etdiyi mədəniyyət evinin özfəaliyyət kollektivi dəfələrlə respublika və ümumittifaq festivallarının qalibi olmuşdur.

Nazim Bilalovun xalq teatrında ifa etdiyi əsas rollar: İbrahimxəlil, Hacı Qara («Molla İbrahimxəlil kimyagər» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Hacı Qənbər («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), Aydın, Əbdül əmi («Aydın» və «Solğun çiçəklər», Cəfər Cabbarlı), Səməd ağa («Laçın yuvası», Süleyman Sani Axundov), Sərvər, Vəli («Məşədi İbad» və «Arşın mal alan», Üzeyir bəy Hacıbəyli), Bərbərzadə («Xoşbəxtlər», Sabit Rəhman), Abış Surxayeviç («Əcəb işə düşdük» və «Olmadı elə,





oldu belə», Şıxəli Qurbanov), Əşrəf («Şirinbala bal yığır», Salam Qədirzadə).

1975-ci ildə fəaliyyəti bərpa edilən Şəki Dövlət Dram Teatrına direktor təyin olunmuşdur. Fədakar mədəniyyət işçisi 26 may 1993-cü ilə qədər bu vəzifədə çalışmışdır. Nazim Bilalov 2001-ci il yanvar ayının 25-də Şəkidə vəfat etmişdir.



*Zahid Mustafayev (27.3.1938 – 16.6.2015).* Mədəniyyət fədaisi Zahid Nəzir oğlu Mustafayev Şəki şəhərində anadan olmuşdur.

1948 – 1958-ci illərdə 10 saylı orta məktəbdə təhsil almışdır. 1971-ci ildə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun mədəni-maarif fakültəsini bitirmişdir. Əmək fəaliyyətinə 1957-ci ildən başlamışdır. Tamamilə mədəniyyət sahəsi ilə bağlı olan Zahid Mustafayev klub müdiri, metodist, bədii rəhbər, aktyor, ədəbihissə müdiri, mədəniyyət evinin direktoru, mədəniyyət və istirahət parkının direktoru, tarix-diyarşünaslıq muzeyinin direktoru vəzifələrində işləmişdir. 1978 – 1984-cü illərdə Şəki rayon mədəniyyət şöbəsinin müdiri olmuşdur. 1959-cu ildən Şəkidə fəaliyyətə başlayan xalq teatrının qabaqcıl aktyor və rejissorlarından biri idi. Dəfələrlə xalq teatrlarına respublika baxışlarında diplom, fəxri fərman və hədiyyələrlə mükafatlandırılmışdır.

vin «Duel», Altay Məmmədovun «Dəli Domrul», Anarın «Təhminə və Zaur», Şahbaz Rəsulun quruluşunda Mirzə Fətəli Axundzadənin «Molla İbrahimxəlil kimyagər» əsərlərinin tamaşalarının adını çəkə bilərəm.

Dünya dramaturgiyasından «Mahir aradüzəldənlər» (Xose Eçeqaray), «Oyuncaq ev» (Henrik İbsen), «Dəmir qadın» (Şərəf Başbəyov), «Napoleon» (Ferdinand Brukner), «Çox gülməli faciə» (Əziz Nesin), «Avtobus» (Stanislav Stratiyev), «Tələ» (Rober Toma), «Əsrə bərabər gün» (Çingiz Aytmatov), «Lunin və Jakın ölümü» (Edvard Radzinski), «Teymurləng» (Kristafor Marlo), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Pələng və kaftar» (Şandor Petefi), «Kürən yabı» (İon Drutse), «Bir insan ömrü» («Köhnə Arbatın nağılı». Aleksey Arbuzov), «Ay tutulan gecə» (Mustay Kərim), «Halallıq» (Valentin Rasputin), «Ustad və Marqarita» (Mixail Bulqakov), «Xoşbəxt hadisə» (Slavomir Mrojek), «Dərviş və ölüm» (Meşa Səlimoviç), «Ruhlar» (Eduardo de Filippo), «...Və dəyirman dönərdi» (Haldun Taner) kimi məşhur pyesləri Azərbaycan teatr məkanında ilk dəfə Şəki teatrı tamaşaya hazırlayıb. Özü də bu əsərlər zahiri təmtəraq naminə deyil, aktyor truppasının potensial yaradıcılıq imkanlarının yeni müstəvidə açılması üçün repertuara daxil edilib. Həmin tamaşaların hər birində maraqlı rejissor həlli, ifadəli aktyor oyunları vardır.





# QASTROLLAR

*1976-cı il, 16 oktyabr.* Bakı şəhəri. Göstərilən tamaşa: «Adamın adamı» (Anar).

*1977-ci il, 23 – 26 yanvar.* Bakı şəhəri. Göstərilən tamaşalar: «Nişanlı qız» (Sabit Rəhman), «Adamın adamı» (Anar), «Əks-səda» (Nəbi Xəzri).

*1979-cu il, 1 – 16 iyul.* Gürcüstan Respublikası, Borçalı mahalı. Göstərilən tamaşa: «Pələng və kaftar» (Şandor Petefi).

*1979-cu il, 12 noyabr.* Bakı şəhəri. Göstərilən tamaşa: «Pələng və kaftar» (Şandor Petefi).

*1980-ci il, 27 mart.* Bakı şəhəri. Göstərilən tamaşa: «Nişanlı qız» (Sabit Rəhman).

*1981-ci il, 10 mart.* Bakı şəhəri. Göstərilən tamaşa: «Xırs quldurbasan» (Mirzə Fətəli Axundzadə).

*1981-ci il, 7 – 15 sentyabr.* Bakı şəhəri. Göstərilən tamaşalar: «Hekayəti-xırs-quldurbasan» (Mirzə Fətəli Axundzadə), «Aşnalar» (Sabit Rəhman), «Kəndimizin narları» (Rəhman Əlizadə), «Uca dağ başında» (Vaqif

Səmədoğlu), «Hərənin bir ulduzu» (Əli Səmədli), «Vəzifə» (Əkrəm Əylisli), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Pələng və kaftar» (Şandor Petefi), «Meteor» (Fridrix Dürrenmatt).

*1982-ci il, 30 mart.* Gürcüstan Respublikası, Tiflis şəhəri. Göstərilən tamaşa: «Arturo Uinin karyerası», Bertolt Brext.

*1984-cü il, iyun və iyul ayları.* Rusiya Federasiyası, Moskva şəhəri. Göstərilən tamaşalar: «Lənkəran xanının vəziri» (Mirzə Fətəli Axundzadə), «Sizi deyib gəlmişəm» (Anar), «Kəndimizin narları» (Rəhman Əlizadə), «Romeo və Cülyetta» (Uilyam Şekspir), «Meteor» (Fridrix Dürrenmatt), «Teymurləng» (Kristafor Marlo), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Ağ bayraqlar» (Nodar Dumbadze).

*1985-ci il, 22 aprel.* Bakı şəhəri. Göstərilən tamaşa: «Tapşırığa gedirəm», Hüseynağa Atakişiyev.

*1987-ci il, 16 – 30 iyun.* Tatarıstan Respublikası, Kazan şəhəri. Göstərilən tamaşalar: «Müsyö Jordan və dərviş Məstəli şah» və «Lənkəran xanının vəziri» (Mirzə Fətəli Axundzadə), «Xoşbəxtlər» (Sabit Rəhman), «Ağ bayraqlar» (Nodar Dumbadze), «Çinari manifesti» (Aleksandr Çxeidze), «Tələ» (Rober Toma), «İstintaq» (Rüstəm İbrahimbəyov).

*1988-ci il, 30 mart.* Bakı şəhəri. Göstərilən tamaşa: «Müsyö Jordan və dərviş Məstəli şah» (Mirzə Fətəli Axundzadə).





*1988-ci il, aprel – may ayları.* Özbəkistan Respublikasının Daşkənd və Səmərqənd, Rusiya Federasiyasının Moskva şəhərləri. Mirzə Fətəli Axundzadənin anadan olmasının 175 illiyi münasibətilə. Göstərilən tamaşa: «Müsyö Jordan və dərviş Məstəli şah» (Mirzə Fətəli Axundzadə).

*1990-cı il, 15 noyabr.* Bakı şəhəri. Göstərilən tamaşa: «Şah, ya qeyri-şah, şah elə şahdır» (Saadalla Vannus).

*1991-cı il, iyun ayı.* Rusiya Federasiyası, Mari El Respublikası, Moskva və Yoşkar-Ola şəhərləri. Göstərilən tamaşalar: «Lənkəran xanının vəziri» (Mirzə Fətəli Axundzadə), «Təhminə və Zaur» (Anar), «Dəli yığıncağı» (Cəlil Məmmədquluzadə), «Şah, ya qeyri-şah, şah elə şahdır» (Saadalla Vannus), «Ağ bayraqlar» (Nodar Dumbadze), «Ustad və Marqarita» (Mixail Bulqakov).

*1993-ci il, dekabr.* Rusiya Federasiyası, Moskva şəhəri. Göstərilən tamaşalar: «İblis» (Hüseyn Cavid), «Sən Qara deyilsən» (Əziz Nesin).

*2003-cü il, 27 – 29 noyabr.* Bakı şəhəri. Göstərilən tamaşalar: «Cəzasız günah» (Bəxtiyar Vahabzadə), «Məni qınamayın» (Hidayət), «Ruhlar» (Eduardo de Filippo).

*2005-ci il, 27 – 29 aprel.* Bakı şəhəri. Göstərilən tamaşalar: «Hacı Qənbər» («Yağışdan çıxdıq, yağmura düşdük». Nəcəf bəy Vəzirov), «Xoşbəxt hadisə» (Slavomir Mrojek).

*2006-cı il, 6 və 7 noyabr.* Bakı şəhəri. Göstərilən tamaşa: «Xoşbəxt hadisə» (Slavomir Mrojek).

*2007-ci il, 23 oktyabr.* Türkiyə Cümhuriyyəti, Giresun şəhəri. Göstərilən tamaşa: «Xoşbəxt hadisə» (Slavomir Mrojek).

*2008-ci il, 7 may.* Türkiyə Cümhuriyyəti, İstanbul şəhəri, Üsküdar bələdiyyəsi. «Xoşbəxt hadisə» (Slavomir Mrojek).

*2008-ci il, 1 və 2 dekabr.* Bakı şəhəri. Yeni teatr festivalı. Göstərilən tamaşa: «Xəsis» (Jan Batist Molyer).

*2010-cu il, 3 – 5 may.* Bakı və Sumqayıt şəhərləri. Göstərilən tamaşalar: «Pəri cadu» (Əbdürrəhim bəy Haqverdiyev), «Xəsis» (Jan Batist Molyer).

*2011-ci il, 19 və 20 dekabr.* Bakı şəhəri. Göstərilən tamaşa: «Aldadılmış ər» («Jorj Danden». Jan Batist Molyer).

*2012-ci il, 20 aprel.* Türkiyə Cümhuriyyəti, Konya şəhəri. Türkdilli xalqların «Min nəfəs, bir səs» V teatr festiavlı (11 – 24 aprel). Göstərilən tamaşa: «Aldadılmış ər» («Jorj Danden». Jan Batist Molyer).

*2015-ci il, 21 aprel.* Türkiyə Cümhuriyyəti, Konya və Giresun şəhərləri. Türkdilli xalqların «Min nəfəs, bir səs» VIII teatr festivalı və Giresun şəhərində keçirilən Fevzi Bayazitoğli Teatr Günləri (20 aprel – 4 may). Göstərilən tamaşa: «Xəsis» (Jan Batist Molyer).

* * *

Şəki teatrının müxtəlif illərdə hazırladığı «Ustalar» (Raço Stoyanov), «Adsız ulduz» (Mixail Sebastian), «Pələng və kaftar» (Şandor Petefi), «Arturo Uinin karyerası» (Bertolt Brext) tamaşaları SSRİ-də keçirilən bolqar,





rumın, macar, alman dramaturgiyası festivallarında uğurla nümayiş etdirilib və mükafata layiq yerlər tutub.

Teatrın kollektivi Azərbaycanın bu şəhər və rayonlarında dəfələrlə qastrol tamaşaları ilə çıxışlar edib: Naxçıvan, Gəncə, Sumqayıt, Mingəçevir, Lənkəran, Ağdam, Kəlbəcər, Zaqatala, Balakən, Qax, Qəbələ, Oğuz, Kürdəmir, Zərdab, Ucar, Tovuz, Şəmkir.

* * *

Şəki teatrının 1981-ci ildə Bakıda keçən qastrolları kollektivin ilk böyük yaradıcılıq hesabatı idi. Bakının teatr ictimaiyyəti şəkililərin yaradıcılıq uğurlarından heyranlıqla söz açırdılar. Tamaşaçılar yeni teatr estetikası ilə üzləşmişdilər və orijinal rejissor yozumundan, ifadəli aktyor oyunlarından zövq alırdılar. Şəki teatrının bu qastrolu haqqında sənətşünaslıq doktoru, professor Mahmud Allahverdiyev «Gənc kollektivin axtarışları» («Ədəbiyyat və incəsənət», 27 noyabr 1981) və mən İlham Rəhimli «Yaradıcılıq ehtirası və sənət ciddiliyi» («Kommunist», 23 sentyabr 1981) geniş məqalələr yazmışdıq. Həmin məqalələrdən müəyyən məqamları oxucuların diqqətinə çatdırmaq istəyirəm. Əvvəlcə «Yaradıcılıq ehtirası və sənət ciddiliyi» məqaləsindən sətirlər.

«Beş yaşlı Şəki teatrı indiyədək otuz beş tamaşa hazırlayıb. Bu, əlbəttə, böyük nailiyyətdir, ancaq teatrın əsas uğurunu onun yaradıcılıq istiqamətində, sənət prinsiplərində, pyeslərin səhnə bədiiliyində, rejissorların üslub axtarışlarında, aktyor oyunlarının məzmununda

görmək lazımdır. Teatrın repertuar rəngarəngliyinə bu mövqedən yanaşsaq, kəmiyyət ikinci plana keçər və gənc kollektivin inkişaf yollarını daha aydın görə bilərik.

Repertuar teatrın simasıdır.

Bu, sübuta ehtiyacı olmayan həqiqətdir. Amma və di gəl ki, hər dəfə bu həqiqəti təsdiqləməyə ehtiyac duyulur.

Müxtəlif festivallar laureatı olan Şəki teatrı Bakı qastrolunda doqquz tamaşa göstərdi: «Xırsquldurbasan» (Mirzə Fətəli Axundzadə), «Aşnalar» (Sabit Rəhman), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Meteor» (Fridrix Dürrenmatt), «Pələng və kaftar» (Şandor Petefi), «Vəzifə» (Əkrəm Əylisli), «Uca dağ başında» (Vaqif Səmədoğlu), «Hərənin bir ulduzu» (Əli Səmədli), «Kəndimizin narları» (Rəhman Əlizadə).

Göründüyü kimi, bu pyeslərin mövzusu, janrı, problematikası, dövrü, məkanı, yazıçı amalı müxtəlifdir. Quruluşçu rejissorlar və bütövlükdə teatrın yaradıcı kollektivi üst qatda bu rəngarəngliyi, müxtəliflik xüsusiyyətlərini saxlamışdır. Daxili qatda isə bu tamaşaları teatrın getgedə təkmilləşən, professional kamilliyə doğru yönələn üslub orijinallığı birləşdirir. Özlüyündə bu üslub yeni deyil, dünya teatrlarında müxtəlif dövrlərdə təcrübədən keçirilib və keçirilir də. Bizim üçün maraqlı orasıdır ki, Şəki teatrı (kollektivə rəhbərlik edən Hüseynağa Atakişiyev başda olmaqla) bu üslubu milli xalq oyunlarının, meydan və Brext teatrının elementlərinin, göstərmə teatrının bəzi prinsiplərini əlavə etməklə cazibədar və ma-





raqlı bir üslub-prinsip axtarışına başlamışdır. Həmçinin aktyorların biri digərinə nisbətən güclü və ya zəif oynasa da, səhnədəki ifaçılar bütöv ansambl təsiri bağışlayırlar.

Repertuar əlvanlığı üslub istiqamətini, üslub istiqaməti isə ideya yönümünü müəyyənləşdirib. Teatr insanlığa antipodlara, riyakarlığa, mənsəbpərəstliyə, əqidəsizliyə, müharibə qızışdıranlara, nadanlığa qarşı aydın mübarizə platformasında dayanıb. Kollektivin nöqsanları tənqid və ifşa, gözəlliyi təbliğ etməsi hər tamaşada üç kontekstdə – fərdi-psixoloji, ictimai-siyasi və ictimai-sosial kontekstlərdə realizə olunur.

«Aşnalar» tamaşasında (quruluşçu rejissor Cahangir Novruzov) fərdi-psixoloji kontekstdə Qurban Qurbanov, Səməndərli, Hüseyn, Qənbər, Gülümov kimi tiplərin bədxah əməlləri, mənəvi eybəcərlikləri, əqidələrinin çürüklüyü, simasızlığı ancaq hər personajın xarakteri prizmasından tənqid edilir. Onların tənqidində fəal ifşa funksiyasını əsasən müsbət obrazlar daşıyırlar. İctimai-siyasi kontekstdə isə hər cür mənəvi puçluq dramaturq və rejissor dünya duyumu mövqeyindən ifşaya məruz qalır. Mənfi tiplərdən hər biri təklikdə nə qədər dəhşətli olsa da, cəmiyyətimizdəki sağlam fəal həyat mövqeyi qarşısında ictimai kəsərdən düşürlər, çünki onların sosial zəmini çoxdan məhv olmuşdur.

Hüseynağa Atakişiyevin hazırladığı «Arturo Uinin karyerası» tamaşası dərinliyinə, kolorit zənginliyinə, struktur qurumuna, psixoloji qatların çoxmənalılığına və ifadəliliyinə görə daha bitkin təsir bağışlayır. For-

maca monumentallığa meyilli olan bu tamaşanın struktur qurumunda fərdi-psixoloji və sosial-ictimai kontekstlər toqquşur. Onların kəsişməsində isə konflikt-münaqişəni gücləndirən yeni kontekst yaranır: fəlsəfi-ictimai-siyasi kontekst. Bu kontekst hadisənin siyasi dərinliyini, müharibənin dəhşətlərini, pyes-tamaşada qoyulmuş problemin bəşəriliyini, obrazların psixoloji mahiyyətlərini, ideyanın ictimai gücünü daha qabarıq təcəssüm etdirməyə zəmin yaradıb.

Bir cəhəti qeyd etmək lazımdır ki, janr müxtəlifliyinə, formanın struktur qurumunun çoxmənalılığına çalışan Hüseynağa Atakişiyev eyni zamanda bütövlükdə tamaşanın poetikasını axıradək gözləməyə çalışır. Buna görə də onun quruluş verdiyi «Pələng və kaftar», «Hərənin bir ulduzu», «Xırsquldurbasan», «Vəzifə» tamaşaları poetik hüsnünə görə müxtəlif və cazibədardır.

«Kiçik səhnə» təcrübədə sınaqdan çıxmış formadır, qısa pyesləri tamaşaya qoymaq üçün səmərəli vasitədir. Bu, həmçinin eksperiment aparmaqdan ötrü də əlverişlidir, böyük tamaşada iştirak etməyən aktyorlar boş dayanmayıb məşğul olduqları üçün axtarmaq vərdişlərini itirmirlər. Şəki teatrı da Hüseynağa Atakişiyevin təşəbbüsü ilə bu formadan istifadə edərək «Vəzifə» pyesini tamaşaya hazırlamışdır.

Tamaşa foyedə göstərilir. Dörd-bir, altı-bir miz arasında oturan tamaşaçılar (maksimum 50 nəfər) bir növ hadisələrin baş verdiyi məkanın içindədirlər. İştirakçılar əməl-fəaliyyət xəttindən çıxmayaraq «səhnədəki»





epizodla bağlı tamaşaçılara da çay paylayırlar. Bu atmosferdə tamaşaçı şərti olaraq iştirakçıya çevrilir və zaman məkana tabe edilir. Bununla da teatr tamaşaçı ilə intim-psixoloji dialoqa girir, mənəvi-əxlaqi keyfiyyətlərə, şəxsiyyət və cəmiyyət, insan və zaman probleminə müxtəlif baxışlar saf-çürük edilir.

Tamaşa sanki qurtarmır, biz kiçik dekorların, ifaçı aktyorların arasından keçib gedir, «səhnədəki» (oyun dairəsindəki) fikrin təəssüratı ilə teatrdan çıxırıq. Öz kökündən, «elindən-obasından ayrılan adam əsl insan kimi həyatda xoşbəxt ola bilərmi?» sualı uzun müddət bizi düşündürür.

Uşaqlar üçün hazırlanmış «Hərənin bir ulduzu» tamaşasının poetikası əlvanlığına, şuxluğuna, ideya aydınlığına görə Hüseynağa Atakişiyevin quruluş verdiyi digər tamaşalardan tamam fərqlənir. Nizaminin əsərlərinin motivləri əsasında Əli Səmədlinin yazdığı bu pyesin tamaşası nağıl janrında hazırlandığı üçün rejissor fars, karnaval, qaravəlli elementlərindən, qroteskdən istifadə etmişdir. Bəzən bu elementlərin vəhdəti pozulsa da, ümumilikdə tamaşa cazibədardır, uşaq duyumunun estetik prinsipləri gözlənilib.

Kollektivin yaradıcılıq axtarışlarında, ansambl bütövlüyündə diqqəti cəlb edən maraqlı cəhətlərdən biri odur ki, teatrın tamaşadan-tamaşaya cilalanıb təkmilləşən üslub parametrlərini sənət ocağına təzə gələn gənc rejissorlar da gözləməyə çalışırlar. Cahangir Novruzovun «Aşnalar», «Kəndimizin narları», Mirzağa Əliyev adı-

na Azərbaycan Dövlət İncəsənət İnstitutunun diplomçuları Arzu Ağayevin «Meteor», Arzu Hadıyevin «Uca dağ başında» pyeslərinə verdikləri quruluşlar, ayrı-ayrı xırda nöqsanlarına baxmayaraq, orijinal səhnə yozumuna, kompozisiya bütövlüyünə, hər ifaçının əməl-fəaliyyət xəttinin aydınlığına, ali məqsədin düzgün müəyyənləşdirilməsinə görə professional təsir bağışlayır. Əsas nöqsan isə ondan ibarətdir ki, gənc rejissorlar müəyyən məqamlarda, xüsusən forma seçilməsində Hüseynağa Atakişiyevin əsaslandığı estetik prinsiplərdən bəhrələnməkdən daha çox baş rejissoru təkrar edirlər. Lakin bu nöqsanı aradan qaldırmaq mümkündür və gənclərin buna qabiliyyət və bacarıqları çatar.

Adlarını çəkdiyimiz doqquz tamaşadan üçünün–«Aşnalar»ın, «Xırs quldurbasan»ın və «Kəndimizin narları»nın səhnə tərtibatını Söhrab Ərəbov verib. Qalan tamaşaların tərtibat müəllifi isə teatrın baş rəssamı Qüdrət Məmmədovdur. Konstruktiv qurumdan, rəmzi detallardan, məkanların konkret təyinində, «səhnə içində səhnənin» göstərilməsində meydan teatrı şərtiliyindən sintez şəklində yaradıcılıqla istifadə edən Qüdrət məzmuna və ideyaya xidmət göstərən mənalı forma həllini tapır. «Arturo Uinin karyerası» tamaşasında bu, nəzəri daha çox cəlb edir. Burada səhnə tərtibatı dramaturq və rejissor fikrini açan, tamaşanın ali məqsədinə xidmət edən, aktyor oyununu mənalandıran bədii vasitəyə çevrilir.

Dəst-xətlə, fərdi üslubla öz-özünü təkrar arasında çox az məsafə var. Bəzən bu incəliyin tarazlığını pozmaq yanlışlığa gətirib çıxarır və təkrar elementlər, ifadə vasitələri orijinal olmadığından bədiilik funksiyasını itirir. Mən Qüdrət Məmmədov kimi işgüzar və istedadlı rəssamın işində («Arturo Uinin karyerası», «Pələng və kaftar») xırda oxşarlıqları görmək istəməzdim.





Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrının yaradıcılıq üslubuna uyuşan, ona bütövlük gətirən komponentlərdən biri bəstəkar işidir. Respublikanın məşhur sənətkarı Emin Sabitoğlunun, gənc bəstəkarlardan Aydın Əzimovun və Cavanşir Quliyevin kollektivlə yaradıcılıq işi bu baxımdan səmərəlidir. Üslub bütövlüyünü və ölçü hissini gözləmək baxımından Emin Sabitoğlunun «Aşnalar», Aydın Əzimovun «Arturo Uinin karyerası», Cavanşir Quliyevin «Hərənin bir ulduzu» tamaşalarındakı işləri daha uğurludur.

Teatrın xüsusi orkestri yoxdur, musiqi nömrələri maqnitafon vasitəsilə verilir. Bu zaman müəyyən texniki diqqətsizlik ümumi üsluba xələl gətirir, səhnədəki hadisələrdən doğan ovqatı pozur. Məsələn, «Arturo Uinin karyerası»nda, eləcə də «Hərənin bir ulduzu»nda müəyyən epizodun psixoloji mənasını və təsir gücünü artıran mahnılar səslənir. (Xatırladaq ki, mahnıları bəstəkarlar özləri ifa edirlər). Aktyorların zahiri və daxili hərəkətləri fanoqramaya uyğun gəlir. Lakin səs o qədər güclü verilir ki, həm xırıltı artır, ifadə aydınlığı itir, həm də aktyorun mahnıdan sözə keçməsində səs fərqləri açıq-aydın hiss olunur.

Gənc kollektivin tamaşalarında rəqslərdən geniş istifadə edilir. Əli Əşarinin qurduğu rəqslər, mahnı-rəqslər, pantomim hərəkətlər xoreoqrafiq mahiyyətini saxlamaqla tamaşanın poetikasından, üslubundan kənara çıxmır, dinamikanı, ritmi saxlayır. Mürəkkəb və ritmik rəqslərin ahəngini daha dəqiq tutmaq və canlı ifadə etmək üçün aktyorların öz plastikaları üzərində işləmələrinə ehtiyac hiss olunur.

Kollektivdə ali təhsil almış və yerli həvəskarlardan ibarət (onlarla teatrın nəzdindəki studiyada müntəzəm məşğələlər keçilir) maraqlı aktyorlar var. Onlar səhnə sərbəstliyinə, daxili ehtiraslarına, emosionallıqlarına, plastikadan bacarıqla istifadə etmələrinə görə maraqla baxılır və xoş təsir bağışlayırlar. Bu baxımdan Gülşad Baxşıyevanın Predslava («Pələng və kaftar»), Mahirə Əliyevanın Xanım Nomzen («Meteor»), İbrahim Əliyevin Arturo Ui («Arturo Uinin karyerası»), Novruz Cəfərovun Səməndərli («Aşnalar»), Rafiq Yunusovun Qlauzer («Meteor»), Təvəkkül İsmayılovun Qender («Pələng və kaftar»), Əligüşad Rəhimovun Gülümov («Aşnalar»), Muxtar İbadovun Nazim («Vəzifə»), Xanlar Həşimzadənin Münəccim («Hərənin bir ulduzu»), Fərman Abdullayevin Rəcəb («Kəndimizin narları») rollarında bədii bütövlük var.

Təbii yumoru, güclü emosiyası, duzlu koloriti ilə salondakıların qəlbinə sirayət edən Cahangir Novruzovun





Tanrıverdi («Xırs quldurbasan»), Şiyt və Aktyor («Arturo Uinin karyerası»), Quqqulu («Uca dağ başında») rollarını xüsusi qeyd etmək istəyirəm.

Aktyor oyunundan söhbət düşdüyü üçün elə buradaca incə bir məsələyə toxunmaq lazımdır: səhnə danışığı məsələsinə. Elə aktyorlar (hətta yuxarıda adını çəkdiyimiz aktyorlardan da bəzisi) var ki, istəsələr də Şəki ləhcəsindən yaxa qurtara bilmirlər. Bu hal klassik və tərcümə pyeslərinin tamaşalarında daha çox narahatlıq doğurur. Aktyorlar mütləq səylə çalışıb bu nöqsanı aradan götürməlidirlər.

Səhnə mədəniyyətinin bir əlaməti də aktyorun obrazın xarakterinə uyğun geyinməsidir. Şəki teatrının tamaşalarında narahatlıq doğuran, gözü qıcıqlandıran cəhətlərdən biri geyimlərdəki uyğunsuzluq, səliqəsizlik və zövqsüzlük idi. Hətta «Arturo Uinin karyerası» kimi sanballı bir tamaşada da bu ölçü pozulmuşdu. Bəzi ifaçılar səliqəsiz geyinməkdən əlavə (bu, təkcə aktyorun təqsiri deyil), əyinlərindəki fraka uyğun davranmaqda, rəftar etməkdə təcrübəsizlik göstərirdilər.

Teatrın yaradıcılıq üslubunun estetik parametrləri birdən-birə təkmilləşmir. Bu təbii proses gərgin zəhmət və axtarışlar bahasına tədricən inkişaf edir və kollektivi sənətdə formalaşdırır. Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrı bu yolun başlanğıcındadır. Gənc kollektiv mərama çatmaq üçün maneələrdən çəkinməməli, sənət prinsipiallığını həmişə gözləməli, qazandığı uğurları son hədd bilməməlidir. Sənət ehtirası yaradıcılıq ciddiliyinə qovuşmalıdır».

* * *

İndi də «Gənc kollektivin axtarışları» məqaləsini təqdim edirəm.

«Sabit Rəhman adına Şəki teatrının Bakı tamaşaçıları ilə görüşü bu gənc kollektivin axtarışlar yolunda olduğunu göstərdi. Elə Sabit Rəhmanın «Aşnalar» komediyasından başlayaq.

«Aşnalar» yüksək bədii ümumiləşdirmələr və bitkin dramaturji quruluşu cəhətdən fərqlənməsə də, rejissor Cahangir Novruzov hadisələrin hərəkət istiqamətini, satirik təbiətini, ideya-bədii məzmununu mənalı şəkildə açmaq üçün pyesin öz məntiqini əsas götürərək, ona müəyyən əlavələr etmişdir.

Tamaşada taxıl anbarlarının rəmzini verən üç böyük kisə şaquli şəkildə yan-yana düzülmüşdür (rəssam Söhrab Ərəbovdur). Xalq malını talayanların prototipləri kimi səhnəyə çıxarılmış siçovullar kisələrin arasında vurnuxurlar. Siçovullar səhnədən yox olan kimi qanun adından dəm vuran vicdansız dələduzlar səhnəyə çıxırlar. Rəmzi məna daşıyan bu səhnə tamaşanın ideya-bədii və satirik xarakterini qüvvətləndirir. Rafiq Yunusov öz qəhrəmanını (Qurban Qurbanov) sərxoş, mənən pozğun dələduz kimi təqdim edir. Onun maymaqlığından istifadə edən fırıldaqçı Səməndərli (Novruz Cəfərov), Gülümov (Əligüşad Rəhimov), Hüseyn (Fərman Abdullayev) kimi eybəcər əməlli tiplər ifşa olunurlar. Əliəyri, yaltaq və qorxaqlara qarşı qətiyyətli mübarizə aparan zəhmət adamlarının da obrazları diqqətlə işlənib:





Ağazadə (Akif Mirzəyev), Qumru (Ofeliya Nəzirova), Murad (Xanlar Həşimzadə) və başqaları.

Tamaşanın bədii bütövlüyünün yaranmasında bəstəkar Emin Sabitoğlunun melodiyaları hadisələrin şərhində, tamaşanın satirik pafosunun emosional ifadəsində mühüm rol oynayır.

Şəki teatrı sənətkarlıq və aktuallıq mövqeyini möhkəmlətmək məqsədilə repertuarına müasir mövzulu bir neçə pyes daxil etmişdir. Vaqif Səmədoğlunun «Uca dağ başında» pyesinin tamaşası professional hazırlığı olmayan bir qrup layihəçinin maymaqlığından, zamanın böyük quruculuq tələblərindən geri qalan fərsizlərin yarıtmazlığından bəhs edir. Belələri hər bir sənətdə, hər bir idarədə özünə yer tapa bilər. Buna görə də Şəki teatrının aktyorları vətəndaş aktyor duyumu ilə Şənbə xanımın (Gülşad Baxşıyeva), Murtuz müəllimin (Muxtar İbadov), Quqqulu müəllimin (Rafiq Yunusov), Kələntərin (Əligüşad Rəhimov) mənəvi çürüklüyünü, məsuliyyətsiz iş üsullarını satirik gülüşün hədəfinə çevirirlər. Burada Toğrulun (Cabir Əmrahov), Nəzifənin (Şahzadə Babayeva), Tellinin (Mahirə Əliyeva), Qafarın (Fərman Abdullayev) səhnə obrazları da müvəffəqiyyətlə yaradılmışdır.

Tamaşanın bədii tərtibatı (rəssam Qüdrət Məmmədov) və musiqisi (Emin Sabitoğlu) zövqlə işlənərək hadisələrin bədii məntiqinə tabe edilmişdir. Lakin pyesin bədii ümumiləşdirmə xarakteri tamamlanmadığın-

dan gülüşün ciddiyyəti azalır, təlqin gücü və bədii təsiri zəifləyir.

Teatrın kiçik kollektivi axtarışlar yolundadır. O, tamaşaçıların bədii-estetik tələblərini duymaq, ciddi həyat məsələləri barəsində düşündürmək üçün zamanla rabitədə olmağa çalışır. Şəki teatrının kiçik tamaşa salonu yaratmaq təşəbbüsü də uğurlu nəticələnmişdir. Dramaturq Əkrəm Əylislinin «Vəzifə» pyesinin tamaşası bu baxımdan diqqəti cəlb edir. Müəllif burada mənəvi keyfiyyətlərə toxunur, insanı, vəzifənin hansı yüksək pilləsində durmasından asılı olmayaraq, həmişə humanizmə, cəmiyyət işi ilə şəxsiyyətin mənafeyi arasında harmoniya yaratmağa çağırır.

Tamaşanın quruluşçu rejissoru Hüseynağa Atakişiyev pyesdəki hadisələri intellektual dram səpkisində şərh etmişdir. Aktyorlar Muxtar İbadov (Nazim), Gülşad Baxşıyeva (Nazlı) və Rafiq Yunusov (Nəbi) xarakterlərinin təşviş və iztirablarını təbii canlandırır, tamaşaya bədii bütövlük gətirirlər.

Qastrol tamaşalarının bədii-estetik məzmunundan, sənətkarlıq mövqeyindən bəlli olur ki, teatrın baş rejissoru Hüseynağa Atakişiyev yüksək səhnə mədəniyyətinə və müasirlik duyumuna malikdir. Onun zövqlə hazırladığı «Arturo Uinin karyerası», «Pələng və kaftar», «Hərənin bir ulduzu» və s. tamaşalarındakı mənalı rejissor fikri, obrazlı bədii təfəkkürü, əlvan boyaları və müasirlik duyumu göstərir ki, o, müasir rejissor sənətinin gözəl yaradıcılıq ənənələrinə bələddir. «Arturo Uinin





karyerası» tamaşası dediklərimizə əyani misaldır. Quruluşçu rejissor müasirlik axtarışlarında bu əsəri repertuara daxil etməklə, Brextlə Azərbaycan teatrı arasındakı «səddi» götürmüş bu böyük mədəniyyət nümunəsi ilə tamaşaçıları tanış etmək istəmişdir və öz məqsədinə nail olmuşdur. Hüseynağa Atakişiyev cəmiyyətlə terror rejimini qarşılaşdırmış, humanizmə, əmin-amanlığa meydan oxuyan faşizmə ictimai nifrət hissi oyatmışdır.

Rejissor işinin təsirli və mənalı cəhətlərindən biri də budur ki, o, səhnə ilə salon arasında üzvi rabitə yaradır, dinamik dialoq qurur. Tamaşada bu fikri təmsil edən Arturo Ui – İbrahim Əliyev iradəsini qəbul etdirib, təsir dairəsini genişləndirmək üçün alçala-alçala yüksəlir, xalqı mütiləşdirir, onu fəlakətə sürükləyir. İlk addımlarında o, ilan kimi sürünür, hər cür təhqir və təhdidlərə soyuqqanlılıqla dözür, lakin məqsədindən çəkinmir. O rədd edildikcə fikrindən daha da dönməz olur, böyük yırtıcıya çevrilir. Arturo Ui – İbrahim Əliyev süni, saxta təbəssümlər arxasında müdhiş bir ölüm gəzdirir. Bu obraz aktyorun nailiyyətidir. Aktyor oyununda əlvanlıq və xarakter bütövlüyü var.

Tamaşada Ata Doqsboronun (Rafiq Yunusov) mənəvi çırpıntıları, təşviş və sarsıntıları emosionallıqla rəsm edilir. Cahangir Novruzov isə Aktyorun parlaq obrazını yaratmağa nail olur. Muxtar İbadovun qəhrəmanı Klark hiyləgər, fırıldaqçı və amansızlığı ilə taun çələngini gəzdirən tip kimi səciyyələndirilir. Burada böyük daxili inam və ilhamla yaradılmış obrazlardan Fərman Abdul-

layevin Ernosto Roması, Gülşad Baxşıyevanın Dokdeyzisi, Novruz Cəfərovun Civolası, Mahirə Əmirovanın Bettisi, Akif Mirzəyevin Karuzeri, Akif Yusifovun Fleyki öz təbiiliyi, canlı və obrazlı təbiəti ilə tamaşanın bədii-estetik bütövlüyünü tamamlayırlar. Xoreoqrafik səhnələr, mahnılar və mizanlar isə incə zövqlə tamaşanın obrazlı məntiqinə tabe edilmişdir. Bu, üslub müxtəlifliyini aradan qaldırmır, əksinə, müxtəlif boyalar və fikir bitkinliyi əldə edir, tamaşadakı hərəkət prosesini məqsədə doğru istiqamətləndirir, onun dramatizm və dinamikasının ardıcıl inkişafına imkan verir.

Bu tamaşanın Brext teatrının poetikasına əsaslandığı amillərdən biri də qanqsterlərin törətdikləri ölüm səhnələrində kütlənin «məni yox, onu» fikrini əks etdirən pantomim hərəkətlərin bədii zövqlə işlənməsidir.

Tamaşada tərtibatçı rəssamın işi (Qüdrət Məmmədov), bəstəkarın musiqisi (Aydın Əzimov) quruluşçu rejissorun obrazlı məntiqi ilə birləşmişdir.

Şəki teatrı Azərbaycan və dünya dramaturgiyasının gözəl nümunələrini səhnəyə gətirməklə teatrın müasirlik və beynəlmiləl mövqeyini qüvvətləndirir, xarakterlərin dramatizmini dərindən duyan aktyor tərbiyə edir.

Teatrın qayğı ilə hazırladığı tamaşalardan biri də macar dramaturqu Şandor Petefinin «Pələng və kaftar» pyesidir. Quruluşçu rejissor Hüseynağa Atakişiyev və bədii tərtibatçı Qüdrət Məmmədov əsəri müasirlik duyğusu ilə yozmuşlar. Petefi bu faciədə özbaşınalığı, hökmranlıq və müharibə ideyasını mühakimə edir, xalqı





ölüm və fəlakətə, əzab və iztiraba sürükləyən rəyasət oyunbazlarını qəzəb hədəfinə çevirir. Bu ideya, eyni zamanda, şəxsiyyət və xalq problemini əhatə edir, humanizm ideyalarını ön xəttə çəkir. Burada rejissorun, rəssam və bəstəkarın bədii təfəkkürü yüksək sənətkarlıq tələbləri səviyyəsindədir. Tamaşadakı aktyor oyunundakı sənətkarlıq, hərəkətlə sözün vəhdətindən doğan məna və məntiq çaları Gülşad Baxşıyevanın (Predslava) və İbrahim Əliyevin (Boriç) ifasında çox qüvvətlidir. Bu baxımdan Novruz Cəfərovun Şaulu, Rafiq Yunusovun Şamşonu və Fərman Abdullayevin Təlxəyi xüsusilə fərqlənirlər.

Tamaşada şah Belanı Muxtar İbadov, onun həyat yoldaşı İlonanı isə Mahirə Əliyeva səmimiyyətlə rəsm edirlər; hər iki obrazın xarakteri və psixoloji mürəkkəbliyi bədii ifadəsini tapır. Tamaşada işıqlı kölgədən də ustalıqla istifadə edilmişdir. İlk səhnədə iştirakçıların qüvvəsilə yaradılmış boz və sərt görkəmli dağ son dərəcə əzəmətli təsir bağışlayır.

Maraqla baxılan tamaşalardan biri də Fridrix Dürrenmattın «Meteor» komediyasıdır. Nobel mükafatı laureatı, yazıçı Şvitter dəfələrlə ölüb-dirilir. O ölmək istəyir, ölə bilmir. Onun dirilməsi cəmiyyətdə tənhalaşmasına səbəb olur, fərdlər arasında mütləq fərdə çevrilir. Belə bir fərd isə cəmiyyətin həyat tərzi və ideologiyası üçün təhlükəlidir. Hadisələrin davamından bəlli olur ki, Şvitter ətrafdakılara ölümdən başqa heç nə verə bilməz: o, orbitindən qopmuş meteor kimi qarşısına çıxanı məhv

edir. Dramaturq burada ölüm vaxtı ilə ziddiyyətli insan psixologiyasına, cəmiyyətin amansızlığına gülür. Tamaşada Hüseynağa Atakişiyevin təmkinlə yaratdığı Şvitter son dərəcə mənalıdır. Şvitter xanım Nomzenlə söhbət edərkən onu mənəvi cəhətdən özündən üstün sayır. Bu səhnə cəmiyyətin həyat məntiqini ifşa edir. Möhtəşəm Müqeymin daxili çırpıntılarını, əzab və iztirablarını isə Cahangir Novruzov emosionallıqla canlandırır...

Teatr məktəbyaşlı uşaqların düşüncə və gözəllik duyğuları ilə səsləşən, bədii zövqlərinin formalaşmasına təsir göstərən pyesləri də repertuarına daxil edir, xeyir və şər haqqındakı təsəvvürlərini zənginləşdirir. Əli Səmədlinin «Hərənin bir ulduzu» nağıl-pyesi bu baxımdan maraq doğurur. Tamaşanın quruluşçu rejissoru Hüseynağa Atakişiyev və tərtibatçı rəssam Söhrab Ərəbov, bəstəkar Cavanşir Quliyev nağıl janrının tələblərinə əməl etmiş, baxımlı tamaşa yaratmışlar.

Teatr qastrol səfərini Mirzə Fətəli Axundzadənin «Xırs quldurbasan» komediyası ilə başa vurdu. Quruluşçu rejissor Hüseynağa Atakişiyev haqlı olaraq əsəri meydan tamaşalarının ənənələri əsasında hazırlamışdır. Tamaşada hadisələrin inkişafına açıq istiqamət verir: bu əlavə obraz pyesin mahiyyəti və Mirzə Fətəlinin teatrının kökləri ilə əlaqədardır. Tamaşada Mirzə Fətəli Axundzadə gülüşünün hikmətli və satirik təbiəti duyulmuş, gülüş maymaqlığa, avamlığa qarşı çevrilmişdir.

Tamaşada müvəffəqiyyətli obraz yaradan aktyorlarla yanaşı, epizodik rolların ifaçıları da aydın məntiqli, fərdi





xarakterli tiplər yaratmaqla əsərin bədii bütövlüyünün tamamlanmasında fəal rol oynayırlar.

Teatrın sənətkarlıq mövqeyini zəiflədən müəyyən qüsurlar da nəzərə çarpır. «Arturo Uinin karyerası» tamaşasında dinamikanı və dramatizmi zəiflədən, onun obrazlı xarakteri ilə uyuşmayan səhnələr vardır. Bu, tamaşanın birinci yarısında və qismən də ikinci hissəsində xüsusilə diqqəti cəlb edir. Eyni zamanda, yaxşı tapılmış ölüm arabasının səhnəyə gətirilməsi də onun oyatdığı bədii təsiri zəiflədir. Burada dinamik və lakonik ifadə tərzi tapılmasına ehtiyac duyulur. Tamaşada mahnılar çoxdur və yorucu təsir bağışlayır. Brext teatrının poetikasına müvafiq olaraq aktyorlar yaratdıqları kəskin obrazlara öz münasibətlərini bildirməklə tamaşanı siyasi pamflet səviyyəsinə yüksəltmək mümkündür. «Aşnalar» tamaşasında isə hadisələr sona yetdikcə gülüşün kəsəri azalır. Tamaşanın sona çatmasını sanki kollektiv özü səbirsizliklə gözləyir. Bu, tamaşanın bədii təsirini azaldır.

Teatr müxtəlif janrlarda hazırladığı tamaşaların psixoloji qatlarına enməsi üçün ciddi düşünməlidir. Zahiri effekt, səliqəli ifaçılıq tərzi tragizmi ifadə etmir («Pələng və kaftar»). Teatr repertuar seçmək işində çox ciddi mövqe tutmalıdır. Zəif repertuar kollektivi zəiflədər və qazanılmış nailiyyəti də itirər. Teatr dramaturqlarla yaradıcılıq əlaqəsini gücləndirməli, məhz Şəki teatrı üçün ideya-bədii cəhətdən dolğun pyeslər yazdırmalıdır. Mədəniyyət Nazirliyi teatrın yeni tamaşalarına böyük sənətkarlıq tələbləri baxımından yanaşmalıdır».

# QÜRBƏTDƏN SƏSLƏR

Teatrın Türkiyənin Konya şəhərində keçirilən festivaldakı çıxışı çox maraqla qarşılanıb. Kollektiv bu festivalda Jan Batist Molyerin «Aldadılmiş ər» («Jorj Danden». Quruluşçu rejissor Mirbala Səlimli) komediyası ilə iştirak edib. Festivalda iştirak edən xalqların nümayəndələri ürək sözlərini söyləyiblər. Jurnalist Sevda Babayevanın müxtəlif ölkələri təmsil edən sənət adamlarından aldığı və 11 may 2012-ci il tarixdə çap etdirdiyi müsahibələr, fikrimcə, maraqlı və ürəkaçandır. Onları oxuculara təqdim edirəm.

*Nafiz Gürcüali, rejissor (Kosova).* «Molyerdən bir oyun izləmək şansımızın olması mənim üçün ayrı bir özəllikdir. Oyunun səhnə tərtibatı, kostyumları çox gözəldir. Aktyorlar obrazların xarakterlərini məharətlə ifadə edirlər».

*Gülnaz Aknazarova, teatrşünas (Başqırdıstan).* «Tamaşa öncəsi müəyyən tərəddüdlərim vardı: – Azərbaycan niyə məhz Molyerin əsərinin tamaşasını gətirib? Məşhur





bir pyesi necə oynayacaq, o dövrü canlandıra biləcəkmi? Dil baryeri səbəbindən tamaşanın ilk 5 dəqiqəsini qavramaqda çətinlik çəksəm də, sonradan həmin dövrə fikrən, ruhən daxil ola bildim. Bu da, təbii ki, ilk növbədə rejissorun bacarıqlı işi və aktyorların ustalığının sayəsində oldu. Aktyorlar çox parlaq oyun nümayiş etdirdilər. Tamaşa mənim yaddaşımda zərifliyi və aktyorların gözəl plastikası ilə yadda qaldı».

*Bakyt Nurpeiss, teatrşünas (Qazaxıstan).* «Komediyanı oynamaq faciədən daha çətindir. Özəlliklə Molyerin bu pyesini hazırlamaq asan məsələ deyil. Tamaşada mən sizin aktyor məktəbinizi görə bildim. Bu oyunu çox dinamik oynadınız».

*Zemfira Qulmitdinova, teatrşünas (Tatarıstan).* «Molyer mənim xüsusilə sevdiyim yazıçıdır. Fikrimcə, onun oyunlarına müraciət edən rejissor heç vaxt uduzmur. Molyeri sevməyimin ikinci səbəbi həmişə qadınların tərəfində olması, onları ağıllı və hiyləgər göstərməsidir. Kişilər isə onun əsərlərində çox vaxt gülünc vəziyyətdə qalırlar. Təbii ki, bu bir zarafatdır, amma həqiqət payı da az deyil. Tamaşanızı çox bəyəndim. Səhnə tərtibatı simvolikadan uzaq, qlobal və gözəl idi».

*Boğacxan Sözmən, aktyor (Türkiyə, Adana Dövlət Teatrı).* «Şəki teatrını daha öncələr qiyabi tanıyırdım. Teatrın fəaliyyəti, gördüyü işlər barədə birgə çalışmaqdan zövq aldığım Cahangir Novruzovun söhbətlərindən məlumatlıyam. Amma tamaşanı canlı seyr etməyin, qiyabi tanışlığın reallığa çevrilməsinin kefini yaşadığım

üçün çox sevincliyəm. Əskik və artığı olmayan çox gözəl, əyləncəli bir Molyer tamaşası seyr etdik. Azərbaycanlı həmkarlarımı uğurlu tamaşadan dolayı təbrik edirəm və düşünürəm ki, hər iki ölkənin teatr körpüsünün daha canlı, qarşılıqlı və dərin olmasına çalışmalıyıq».

*Marat Alışpayev, rejissor (Qırğızıstan).* «Son 20 ildə postsovet respublikalarının teatrları çox nadir hallarda Molyerə müraciət edirlər. Bu baxımdan qardaş Azərbaycandan olan sənət dostlarımızın festivala Molyerdən tamaşa gətirməsi təqdirəlayiq haldır. Tamaşa çox peşəkarcasına hazırlanıb. Aktyorların peşəkarlıqlarına heyran qaldım. Özəlliklə də Jorj Danden obrazını yaradan Xanlar Həşimzadənin oyununu çox bəyəndim».

*Orxan Cəbrayıloğlu, rəssam (Türkiyə, Konya Səlcuq Universitetinin müəllimi).* «Azərbaycanlıyam. Uzun müddətdir Konyada yaşayıram. Bu gözəl bir gündə həmyerlilərimlə görüşməkdən xoşbəxtlik duyuram. Tamaşanın bu qədər uğurla keçməsindən həqiqi mənada qürurlandım. Bütün teatr kollektivinə daha böyük uğurlar arzulayıram».





# MƏTBUATDAN NAXIŞLAR

*Şəki teatrının yaradıcılıq həyatı, müəyyən mövcud problemləri barədə məqalələr çap olunub, yeni tamaşaları haqqında resenziyalar yazılıb. Teatrın rejissor və aktyorları barədə portret-oçerklər qələmə alınıb. Vaxtaşırı teatrın baş rejissorları və direktorları yeni yaradıcılıq planları barədə müsahibələr veriblər.*

*Ayrı-ayrı illərdə müxtəlif mətbuat nümunələrində dərc olunmuş yazılardan maraqlı məqamları oxucuların nəzərinə çatdırıram.*

Şəkililərin Moskva qastrolu göstərdi ki, «Hüseynağa Atakişiyev özünün ən yaxşı tamaşalarında yüksək yaradıcılıq qayəsi ilə çıxış edir, həqiqətə inamı səmimiyyətlə, insanlara ehtiraslı ləyaqət və ehtiramla təcəssüm etdirir... Şəki teatrı fəal rejissura, cəsarətli obrazlılıq, poetik sənət ocağı olmaqla yanaşı, həm də güclü aktyor teatrıdır. Burada adi ifaçılar yoxdur, eyni gücdə olan yaradıcı

sənətkarlar var». (M.Şvıdkoy. Əfsanə ilə sınaq. – «Pravda» (Moskva), 19 iyul 1984)

* * *

«Az müddətdə Şəki teatrında Mirzə Fətəli Axundzadənin «Hacı Qara», Səməd Vurğunun eyniadlı poeması əsasında İsgəndər Coşqunun yazdığı «Komsomol poeması», Sabit Rəhmanın «Nişanlı qız», Uilyam Şekspirin «Kral Lir» pyesləri tamaşaya qoyulub və öz üslubu, özünəməxsus yolu olan bir teatr kollektivi formalaşmağa başlayıb. Vaqif Abbasov bir rejissor-pedaqoq kimi yeni bir «teatr-məktəb»in bünövrəsini yarada bilib...

Heç şübhəsiz, Azərbaycan teatr həyatında və sənətində Şəki Dövlət Dram Teatrının özünəməxsus yeri və dəst-xətti var. Onu respublikamızdakı başqa teatr ocaqlarından fərqləndirən bu dəst-xətt, hər şeydən əvvəl, həmin teatrın özünəməxsus yaradıcılıq prinsiplərinin mövcudluğu ilə bağlıdır. Bu prinsiplər birinci növbədə özünü rejissor yozumunun, əsərin plastik həllinin orijinallığında və cəsarətliliyində; ikincisi, tamaşada dramaturq və rejissor fikirlərinin eyni bədii obrazda birləşdirilərək, onun səhnə tərtibatındakı «oynayan dekor-lar»da təcəssümündə; üçüncüsü isə aktyor oyununun əsasən improvizə üzərində qurulmasında göstərir...

Şəkidə teatr böhran keçirə bilər, enmələr, qabarmalar ola bilər. Ancaq Şəkidə teatr heç vaxt ölməyəcək, həmişə yaşayacaq. Çünki Şəki təbiətinə görə də, adamlarına görə də... teatrına görə də respublikamızın ən teatral şəhəridir» (Əziz Ələkbərli. Azərbaycanın ən teatral şəhəri. – «Xalq qəzeti», 24 may 1997).





* * *

Teatr canlı həyatını yaşayırdı. Təəssüf ki, 1980-ci illərin sonlarından başlanan böhran və keçid dövrünün çətinlikləri bu sənət ocağına da ağır zərbə vurdu. Tamaşaçıların gedişi azaldı. Maliyyə əngəlləri yarandı. Truppa üzvlərinin xeyli hissəsi kollektivdən ayrı düşdü. Tamaşalar hazırlanması tədricən dayandırıldı. Teatrın qapıları yalnız şəhər üzrə tədbirlər keçiriləndə açılırdı...

Çox axtarışlardan sonra kollektivin yaxından tanıdığı Mirbala Səlimli teatra baş rejissor təyin edildi. Vaxtilə bu teatrda işləmişdi. Sonralar Moskvaya getmiş, Rusiya paytaxtının bir neçə teatrında rejissor işləmişdi. Səhnədən uzaqlaşan bəzi aktyorlar da truppaya gəldilər.

Beləliklə, teatr öz canlı həyatına qayıtdı. Səhnəsevərlər üçün gözəl sənət əsərləri hazırlandı. İndi Nazim Hikmətin «Bayramın birinci günü» pyesinin tamaşası repertuarda xüsusi yer tutur...

Teatr özbək dramaturqu Şərəf Başbəyovun yaradıcılığına da müraciət edib. Onun «Dəmir qadın» pyesinə Şəkidə ilk dəfə səhnə həyatı verib... Rejissor Mirbala Səlimli pyes müəllifinin əsas fikrini tamaşaçılara canlı, aydın, təsirli səhnə dili, səhnə obrazları ilə çatdırmağı bacarıb» (Teymur Xəlilov. Şəkinin teatr həyatı. – «Ədəbiyyat və incəsənət», 3 iyul 1998).

* * *

Rejissor Mirbala Səlimli Şəki teatrında italyan dramaturqu Eduardo de Filipponun «Ruhlar» əsərini tamaşaya hazırlayıb. Şair-jurnalist Vaqif Aslanla söhbətində rejissor tamaşa üçün müəyyənləşdirdiyi ideyanı və ali rejissor məqsədinin əsas konsepsiyanı aşağıdakı kimi səciyyələndirib.

«Katarsis» təmizlənmədir, özü də mərhəmət və qorxu hissindən doğan bir təmizlənmədir. Bu heç də qanundan cəzalanmaqdan qorxaraq yaxşı olacağına söz verən cinayətkarın təmizlənməsi və tərbiyələnməsi deyildir. Tamaşaçı zalında oturan şəxs hələ cinayətkar deyil və o heç nəyi məcburi qəbul etmir. Teatr onu daha demokratik yolla, hələ heç bir pis iş tutmamış tərbiyə edir, saflaşdırır. Tamaşaçı səhnədə pis adamın çirkin əməlini görəndə istər-istəməz düşünür ki, bu iş onun da başına gələ bilər və o, gələcəkdə belə bir çirkin iş tutmaqdan vaz keçir.

Fikrim paradoksal olsa da, mənim inamıma görə, teatr öz «katarsis» məfhumu ilə insanları cəza evlərindən daha yaxşı tərbiyə edə bilər» (Vaqif Aslan. «Ruhlar» və teatr ruhu. – «Ədəbiyyat qəzeti», 3 yanvar 2001).

* * *

«Şəki teatrının 26-cı mövsümündə Əməkdar incəsənət xadimi Hüseynağa Atakişiyevin quruluş verdiyi, Xalq





artisti, Dövlət mükafatı laureatı, bəstəkar Xəyyam Mirzəzadənin musiqi yazdığı və Hidayətin qələmə aldığı «Məni qınamayın» pyesi ilə açıldı. Açılış uğurlu oldu. Tamaşaçı rəğbəti qazandı. Qınamamaq üçün teatrı öz qaydasında saxlamağı arzu edirik» (Bizi də qınamayın. Teatrın direktoru Hikmət Nəbiyevlə şair Vaqif Aslanın polemik müsahibəsi. – «Yeni Azərbaycan», 27 oktyabr 2001).

* * *

Qəmər Məmmədova: «Şəki teatrının bir vaxtlar nəyə qadir olduğunu söyləməyə ehtiyac yoxdur. Yəqin ki, bu teatr barədə eşidib bilən, tamaşaları görən hər bir kəs onun nəyə qadir olduğunu bilir. O vaxt biz də çətinliyə dözüb bir qrup tələbə ilə Şəkiyə üz tutduq və burada işləyib yaratmağa başladıq. Ancaq indi bura heç kim göndərilmir. Demək olar ki, incəsənət institutunu bitirən tələbələr əyalətə getmirlər, əziyyət çəkmək istəmirlər. Elə bu səbəbdən də biz öz teatrımızda aktyor studiyası yaratdıq. Bu yola əl atmaqda məqsəd teatrın həmişə yaşayıb-yaratması idi. Təbii ki, zaman gələcək və biz istər-istəməz teatrdan uzaqlaşmağa məcbur olacağıq. Bax onda bu teatra gələn tamaşaçı səhnənin boş olduğunu görməməlidir. Tamaşaçının gözü bizi axtaranda yerimizə hazırladığımız bu gəncləri görəcək və bir daha bizləri xatırlayacaqlar. Nə zamansa qoruyub inkişaf etdirdiyimiz bu teatrı yaşadıb ölməyə qoymadığımıza görə bizə rəhmət oxuyacaqlar» (Tamara Mütəllimzadə. Tamaşaçı

səhnəni boş görməməlidir. Aktrisa Qəmər Məmmədova ilə müsahibə. – «Olaylar», 6 – 7 dekabr 2001).

* * *

«Bu günlərdə Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrının səhnəsində polyak dramaturqu Slavomir Mrojekin «Xoşbəxt hadisə» tamaşası oynanılıb. Əsərə Mirbala Səlimli quruluş verib...

Mirbala Səlimlinin rejissor şərhi səhnədə öz təcəssümünü tapır. Sanki o, beşikdə yatan körpələrimizin bizim gələcəyimiz olduqlarını bir daha yadımıza salaraq deyir: təbiət öz işini görür, həyatda yeni nəsil köhnə nəsli əvəz edir. Çalışmaq lazımdır ki, bu yeni nəsil elə tərbiyə olunsun ki, keçmişini sevib, gələcəyi qurmaq arzusunda olsun. Bunun üçün onun həyata gəlişində, tərbiyəsində və yaşamasında qayğı hiss olunmalıdır» (Xaqani Həsənov. Şəkidə «Xoşbəxt hadisə». – «Zaman», 22 – 23 aprel 2003).

* * *

«Şəki teatrının uğuru bir də ondadır ki, o, tamaşaçısını həm də dünya xalqlarının həyat və düşüncəsi ilə tanış edir. Nazim Hikmətin «Bayramın birinci günü», Xose Eçeqarayın «Mahir aradüzəldənlər», Eduardo de Filipponun «Ruhlar», Mixail Sebastianın «Adsız ulduz», Slavomir Mrojekin «Xoşbəxt hadisə» əsərlərinin tamaşaya qoyulması dünya mədəniyyətinə inteqrasiya olunmağımıza xidmət edir. Bu mənada rejissor Mirbala Səlimlinin və Hüseynağa Atakişiyevin xidmətləri danılmazdır...

Bugünkü teatr tamaşaçı qıtlığı keçirir. Adamların teatrdan, teatrın adamlardan azacıq uzaqlaşması da təhlükəlidir. Bu sahədə heç kəs və heç bir qurum öz xidmətini əsirgəməməlidir. Şəki ənənəsi olan şəhər, Şəki Dövlət Dram Teatrı öz ənənəsi olan teatrdır. Bəxtiyar Vahabzadənin «Cəzasız günah» əsəri bizə çox şey deyir.

Nə olsun ki, teatr özü müstəqil surətdə tamaşaçı yığmalıdır. Bu işdə payı olmayanları qınamaq, günahlandırmaq olmaz. Bununla belə, kənarda qalmaq günahdır. Belə günahlara yol verdiyimizdəndir ki, cəzanı indi özümüz çəkirik» (Vaqif Aslan. Cəzanı biz çəkirik. – «Mədəniyyət», 2 avqust 2003).

* * *

«Eduardo de Filipponun «Ruhlar»ı bizim paytaxt tamaşaçısı üçün hələ tanış olmadığından böyük maraq doğurur. Amma bu iki hissəli komediya boyunca aktyorlar tamaşaçını güldürmək üçün bir dəfə də olsun artıq hərəkətə, jestə yol vermədilər.

Ölçülüb-biçilmiş və eyni zamanda, çox təbii aktyor oyunu ilə yanaşı, tamaşada səhnə geyimləri, musiqi tərtibatı da zövq oxşayırdı. Ümumiyyətlə, həm rejissorun, həm də aktyorların göstərdiyi səviyyəni paytaxt teatrlarında belə görmək çox çətindir. Kollektivin ilk səfər günü oynadığı tamaşaya baxmağa gələnlərin

əksəriyyətini təşkil edən həmkarlarına da «marka» nümayiş etdirdi. Bir sözlə, Şəki Dram Teatrının tamaşaları paytaxtın bayağı səhnə əsərlərindən yorulmuş tamaşaçı üçün əsl məlhəmdir.

Qeyd edək ki, dünən teatr Hidayətin «Məni qınamayın» əsərini oynayıb. Bu gün isə Bəxtiyar Vahabzadənin «Cəzasız günah» dramı tamaşaçılara təqdim olunacaq. Səfərin son günü isə tamaşaçılar bir daha «Ruhlar» əsərini Gənc Tamaşaçılar Teatrında görəcəklər» (Vəfa. Şəki teatrının «Ruhlar»ı paytaxt səhnəsini fəth etdi. – «525-ci qəzet», 29 noyabr 2003).

* * *

«*Müxbir:* – Sizcə nə üçün bizdə güclü dramaturqlar yoxdur?

*Mirbala Səlimli:* – Bunun səbəbləri çoxdur. Vaxtilə baş rejissor işləyəndə pyeslərin çoxu mənə gəlirdi. Və mən pyesləri oxuyanda görürdüm ki, bu adamların teatrdan xəbərləri yoxdur. Pyesləri dramaturgiyanın qanunlarını bilməyən adamlar yazır. Teatr üçün pyes yazmaq kinossenari yazmaqdan çox çətindir. Hətta Şəkidə mənə pyes gətirən adamdan soruşdum ki, axırıncı dəfə Şəkidə hansı tamaşaya baxmısan. Məlum oldu ki, axırıncı dəfə məktəbdə oxuyanda baxıb. Mən o dramaturqa necə inana bilərəm. Şekspir «Qlobus» teatrında yetişib, həm də aktyor kimi fəaliyyət göstərib. Mənim aləmimdə dramaturqu teatr yetişdirməlidir. Dramaturq qələmini götürüb





yazmağa girişməmişdən əvvəl teatrla maraqlanmalıdır. Demirəm ki, teatrı öyrənsin. Amma özündən əvvəlki dramaturqların əsərlərini, dramaturgiyanın qanunlarını, səhnəni bilməlidir. Məhz bu səbəbdən də bizdə yaxşı dramaturq yoxdur...

*Müxbir:* – Əyalət teatrının paytaxt teatrlarından fərqi nədir?

*Mirbala Səlimli:* – Buradakı səhnədə qışqırmalısan. Amma mərkəzdə pıçıltın da eşidilir. Gərək qışqırasan ki, səni eşitsinlər. Bizim sənət arena sənətidir. Yerində saymaq olmaz. İndi teatrları açmaq əvəzinə bağlamaq haqqında düşünürlər. Təhsil nazirliyi qərar verib ki, məktəblərdə teatr biletləri satmaq olmaz. Mən bir tərəfdən bunu başa düşürəm. Amma digər tərəfdən uşaqların tərbiyəsində teatrın rolu böyükdür. Biz teatrı olmayan rayonlara gedirik. Oradakı tamaşaçının səviyyəsi ilə buradakı tamaşaçının səviyyəsinin arasında fərq var. Teatr olan rayonlarda tamaşaçının səviyyəsi hiss olunur» (Sevda. Şəki Dram Teatrı. Rejissor Mirbala Səlimli ilə müsahibə. – «525-ci qəzet», 15 may 2004).

* * *

«Tamaşa intellektin, tərtibatın, musiqinin, işığın və daha nələrin məhsuludur. Və razılaşaq ki, bunların yarısından çoxu mühitin havasından asılıdı.

Bir vaxtlar Şəki teatrı sənət çevrəsində elə hadisələr etmişdi ki, səs-sədası Moskvadan gəlirdi, onda paytaxtı

belə ötüb keçirdi. Ayrı-ayrı rejissorların adları bu teatrla bağlıdır. Elə indi də Şəki teatrı o biri əyalət teatrlarının içində həmişə öndə olub. Aprelin sonunda Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrı üç gün Bakıda qastrolda oldu. Paytaxt əhlinə Şəki payı: «Yağışdan çıxdıq, yağmura düşdük» (Nəcəf bəy Vəzirov), «Xoşbəxt hadisə» (Slavomir Mrojek). Tamaşaların rejissoru Mirbala Səlimlidir. Səhnə tərtibatı Söhrab Ərəbova aiddir. Şəki teatrının aktyorları Xanlar Həşimzadə, Əbülfət Salahov, Sima Şabanova, Akif Yusifov, Nicat Əhmədli və başqa aktyorlar paytaxt tamaşaçılarına qonaq oldular...

Həm qrimdə, həm aktyor oyununda təqdirli cəhətlər onu baxımlı edirdi. Hər iki tamaşa anşlaqla keçdi. Qonaqların sevinci də bol idi, tamaşaçıların gülüşü də» (Aliyə. Paytaxt əhlinə Şəki payı. – «Kino», 11 – 18 may 2005).

* * *

«*Müxbir:* – Bildiyimə görə, teatrda bircə nəfər də olsun fəxri adı olan yoxdur.

*Mirbala Səlimli:* – Bu doğrudur. Yubiley ərəfəsində bu məsələnin də həll olunacağını gözləyirik...

Bilirsinizmi, pul məsələsindən çox bu gün bir rejissor kimi məni narahat edən kadr məsələsidir. İstərdim ki, teatra yeni aktyorlar və aktrisalar cəlb olunsun, yeni nəfəs gəlsin. Bu gün Şəki teatrında SSRİ dağılandan sonra Mədəniyyət və İncəsənət Universitetində təhsil alan aktyor yoxdur... Ona görə də məcbur olub aktyoru özümüz yetişdiririk. Mən teatrda bir studiya yaratmışam, orada gənc aktyorlara aktyorluq fakültəsinin proqramı üzrə aktyor sənətindən və səhnə danışığından dərslər keçirik. Başqa əlac yoxdur.

*Müxbir:* – Şəki teatrının repertuarına nəzər salanda xarici dramaturqların əsərlərinin çoxluq təşkil etdiyinin şahidi oluruq.

*Mirbala Səlimli:* – Bu mənim seçimimdir. Ona görə ki, Şəkinin xariclə əlaqəsi daha azdır. Əgər repertuara yalnız öz əsərlərimizi daxil etsək, bu zaman aktyorlarımız formadan düşmüş kimi olarlar. Mən onlara müxtəlif xalqların dramaturgiyasını oynadıram ki, formada qalsınlar. Çox istəyirəm ki, bizim aktyorlar Molyerin, Şekspirin, Brextin əsərlərində oynasınlar» (İltifat Hacıxanoğlu. Teatrın problemi kadr problemidir. Rejissor Mirbala Səlimli ilə müsahibə. – «Ekspress», 18 may 2005).

* * *

«Əbdürrəhim bəy Haqverdiyevin «Pəri cadu» dramının tamaşası haqqında. «Şəki teatrında Şamama cadu obrazının ifaçısı Əbülfət Salahovu xüsusi qeyd etmək lazımdır. Əbülfət Salahov Şamama cadunu gözlənilməz, orijinal şəkildə təqdim edir. Bu, bir gözü kor, qanadları sınmış qara qarğa təəssüratı bağışlayır. Ovsunlama səhnələrində Əbülfət Salahov zahiri plastik baxımdan inandırıcı bir şəkildə dəyişə bilir. Fərəhli sənət budur

ki, tamaşa komediya adlandırıldığından obrazda komik xüsusiyyətlər üstünlük təşkil edir.

Zahiri hərəkətlərlə zəngin obrazlardan biri də Xanlar Həşimzadənin yaratdığı İblis surətidir. Xanlar Həşimzadə həm də İblis olaraq Əmrah cildinə girmişdir...

Rejissor Mirbala Səlimlinin uğurlu işi teatr ictimaiyyətimizi sevindirməyə bilməz» (Ağakişi Kazımov. İki tamaşa haqqında. – «Respublika», 3 iyun 2006).

* * *

«Mirbala Səlimli: Rejissor yaşadığı zamanın və məkanın təsirini hiss etməyə bilməz. Məhz rejissor öz dövrünün bütün problemlərini və hadisələrini bir yaradıcı adam kimi daha tez hiss edir, onu içindən keçirdir və öz sənəti vasitəsilə onlara müdaxilə edir. Rejissorun nəinki öz dövrü haqqında danışmağa, hətta keçmiş zamanla bu gün arasında müqayisə və paralellər aparmağa imkanı var.

Bu baxımdan Nəcəf bəy Vəzirovun «Yağışdan çıxdıq, yağmura düşdük» komediyası mənə çox maraqlı gəldi...

Tamaşanın yaranması üçün üç şərtin olması vacibdir. Birincisi pyes, yəni müəllifin ideyası və müəllif dünyası. İkincisi müasirlik, yəni pyesin həmin dövr üçün aktuallığı. Üçüncüsü isə bu gün bu ideyanı tamaşaçılara çatdıra biləcək kollektivin olmasıdır... Üçüncü faktor çoxcəhətlidir. Bura birinci növbədə seçilmiş pyes üçün





yaradıcı kollektivin peşəkarlıq dərəcəsi, onun oyun üslubu və hər bir aktyorun fərdi keyfiyyətləri daxildir...

XIX əsrin axırları – XX əsrin əvvəllərində köhnə sistem dəyişməyə, yeni kapitalist münasibətləri ortaya çıxmağa başladı. Özünə kapital yığan yerli tacir və sahibkarlar öz pullarını «kənarda saxladıqları rus arvadlarına», Həccə gedib Hacı titulu alan «əsl müsəlmanlar» isə «Allahın əmrindən, Peyğəmbərin şəriətindən çıxmayaraq» azyaşlı naməhrəm müsəlman qızlarından özlərinə yaratdıqları hərəmxanaya sərf edirdilər.

Hacı Qənbər ikincilərdəndir. O bizim tamaşada iki dəfə dəli olur. Bir pulu əlindən çıxanda, bir də «qızım-qızım» deyə-deyə böyütdüyü Yetər (Sima Şabanova) Mahmudla (Taleh Mansurov) qaçanda. Belə çıxır ki, bizim tacirlər və sahibkarlar (biznesmenlər) dəliliyə çox meyillidirlər. Nə o vaxt, nə də indi bu adamlarda intellekt və sivil tərbiyə çatışmayıb ki, artıq pullarını xeyriyyəçiliyə, mədəniyyətə, təhsilə və xalqın rifahı üçün başqa sahələrə xərcləsinlər.

Amma xoşbəxtlikdən, az da olsa, həm o zaman, həm də indi xalq üçün iş görənlər də olub və var » (Teatr və zaman. Şairlə rejissorun dialoqu. – «Şəki», 1 – 15 iyul 2005).

* * *

«Mirzə Fətəli Axundzadənin 6 komediyası içində «Mola İbrahimxəlil kimyagər» özəl yer tutur. Öncə bu əsəri digərlərindən fərqləndirən bir məqam onunla bağ-

lıdır ki, sözügedən komediya Aristotel poetikasında yazılmış əsərdən daha çox genişləndirilmiş səhnə təfsirini andırır (məhz bundan çıxış edərək rejissor tamaşanın janrını səhnə novellası kimi müəyyənləşdirib). «Lətifə» üçün xeyli uzun, amma səhnə tamaşası üçün çox qısa olan bu pyesin digər fərqi əsərin konfliktində «məhəbbət düyünü»nün, «məhəbbət üçbucağı»nın, bir sözlə, «qadın başlanğıcı»nın olmamasıdır...

Rejissor Şahbaz Rəsul bəlkə də bu məqamı nəzərə alaraq tamaşada mühüm rol oynayan və funksional yükü kifayət qədər «ağır» olan əlavə etdiyi dörd personajın ikisini qadın obrazında səhnəyə çıxarır. Aktrisalar Sima Şabanova (Şəhvət) və İnqa Şabanova (Qarabasma), gənc aktyorlar İlham Musayev (Qorxu) və Qurban Rəsulov (Nəfs) ilə son dərəcə ifadəli, təsirli, tamaşanın ovsun başlanğıcını təmin edən «kvartet»i tamamlayırlar... Bu kvartetin başında duran Akif Yusifov (Dərviş Abbas) özünün son dərəcə mənalı və təmkinli oyun tərzi ilə lətifə xarakterli komediyaya nə isə sehrli, hətta bir qədər də qorxulu xassə qazandırmaq, tamaşaçı üçün «gülməli əhvalat»ın dərin qatlarına varmaq imkanını yaratdı.

Məncə, tamaşanın uğurunun böyük bir hissəsi səhnədə «kollektiv obraz sifətində çıxış edən və «Şəki sakinləri» kimi müəyyənləşdirə biləcəyimiz parlaq aktyor ansamblının ünvanına yazılmalıdır. Ansambl da ona görə ansambldır ki, təqdirəlayiq vəhdət içində yaradıcılıqla məşğul olan sənətçilərdən birini digərindən ayırmaq mümkün deyil. Tamaşanın proqramında verilən





siyahı ilə getsək, aktyorlardan Aydın Əlibalayevin (Hacı Kərim), Fərahim Fətəliyevin (Ağa Zaman), Rəhim Qocayevin (Şair Hacı Nuru), Pərviz İsmayılovun (Molla Salman), Əligüşad Rəhimovun (Məşədi Cabbar), Çingiz Novruzəliyevin (Səfər bəy), Niymət Ağabalayevin (Şeyx Salah) ansambl ifa şərtinə yaradıcı nizam-intizamla yanaşaraq fərdi bacarıqlarını parlaq şəkildə ifadə etmələrini mütləq nəzərə çatdırmalıyıq...

Kontrast yaradan ağ-qara obrazların arasında şalvarı, araxçını qara, köynəyi isə ağ olan bir personaj da var. Bu, fırıldaqçı kimyagərin köməkçisi Mola Həmiddir. Gənc aktyor Rəşad Rüstəmov bu personajın marginal (səhnədə duran) xarakterini olduqca aydın və ifadəli təqdim edərək səhnə kompozisiyasının sürətli dəyişmələrinə təkan verir.

Və nəhayət, pyesin və tamaşanın qəhrəmanı Molla İbrahimxəlil. Bu obrazın mürəkkəb olduğu qədər sadəliyini, mücərrəd olduğu qədər konkretliyini, qorxulu olduğu qədər gülməliliyini, ağır olduğu qədər çevikliyini təsvir etməyəcəyəm. Bütün bunları görərək obrazın zövqünü almaq istəyənlər Şəki teatr məktəbinin parlaq nümayəndəsi, gözəl sənətkar Xanlar Həşimzadəni səhnədə görməlidir!» (Məryəm Əlizadə. Ovsunlanmış səhnə. – «525-ci qəzet», 12 dekabr 2006).

* * *

«Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrı kollektivinin daxili imkanları hesabına yeni teatr studiyası

yaradılmışdır... Studiya bu sənət ocağının fəaliyyətində xüsusi rolu olan istedadlı rejissor Vaqif Abbasovun adını daşıyır, teatr üçün yeni kadr yetişdirmək kimi nəcib məqsəd güdür» («Zaman», 31 iyul 2006).

* * *

«Sevgili həmkarlarımın Bakıda ötən həftənin birinci və ikinci günü sərgilədikləri Jan Batist Molyerin «Xəsis» tamaşasıdır ki, bəri başdan onu teatr həyatımızın əlamətdar hadisəsi kimi dəyərləndirməkdən qürur duyuram...

Şəkililərin paytaxtda sərgilədikləri «Xəsis» tamaşası qədirbilən seyrçilərimizə və mütəxəssislərə nələri açıqladı, əcəba?

Sadalayaq:

– Şəki Dövlət Teatrı yaşadığımız dövrün çeşidli (obyektiv və subyektiv) təzyiqlərinə rəğmən ayaq üstədir və çətinliklərə müqavimət qüvvəsi, maşallah, yetərincədir;

– «Xəsis» tamaşasının yaradıcı heyətində təcrübəli sənətkarların gənclərlə ahəngdar ovqatda işbirliyində bulunması truppanın sağlam yaradıcı temperaturundan xəbər verir;

– Kollektivin uğurlu çıxışı. Həmçinin Türkiyə qastrol səfərinin ürəkaçan nəticələri bu teatrda yaradıcılıqdan ötəri səmərəli təşkilati, inzibati, nizam-intizamlı iqlimin mövcudluğundan xəbər verir...





– «Xəsis» tamaşası bariz şəkildə bizə göstərdi ki, Şəki Dövlət Teatrosu tələb olunan inkişaf dinamikasını və sürətini bərpa edərək tamaşadan-tamaşaya daha mürəkkəb yaradıcılıq məsələləri həll etmək iddiasını və – nə xoş ki! – imkanlarını nümayiş etdirir» (Vaqif İbrahimoğlu. Həssas «Xəsis». – «Üç nöqtə», 6 dekabr 2008).

* * *

«Molyerin öz aktuallığını itirməyən «Xəsis» əsəri XXI əsrdə də öz dəyərini qoruyub saxlamaqdadır. Teatrın yaradıcı heyətinin əsas uğurlarından biri ondadır ki, uzaq keçmişdən bəhs edən əsərin fikir və mahiyyətini bacarıqla açmağa müvəffəq olmuşdur...

Tamaşanın rejissoru Mirbala Səlimli əsərin məğzini özünəməxsus şəkildə məharətlə açmışdır. Rejissorun verdiyi quruluşda Molyerin «Xəsis» komediyası dünyəviliyini saxlamış və zaman-zaman xəstəliyə çevrilmiş xəsisliyin bəlaya dönməsini tamaşaçıya çatdırmağa nail olmuşdur. Səhnə mizanları, dekorasiyalar, XVII əsri xatırladan geyimlər, rəqslərin quruluşu tamaşaya baxımlılıq verən amillərdəndir. Tamaşanın uğurlu alınmasında, şübhəsiz ki, aktyor heyətinin böyük rolu vardır. Bu baxımdan «Xəsis» komediyasının baş qəhrəmanı Qarpaqon obrazının ustalıqla əks olunmasında Əbülfət Salahovun əvəzsiz xidməti vardır. O, xəsis Qarpaqonun daxili aləminin açılmasında öz bacarıq və imkanlarını məharətlə göstərmişdir...

Əsərin diqqət çəkən obrazlarından biri də Lafleşdir. Bu rolun ifaçısı Xanlar Həşimzadənin professionallığı onda hiss olunur ki, əsərin əsas qəhrəmanı Qarpaqonun iç üzünü ustalıqla açmağa çalışır. Lafleş Xanlar Həşimzadənin ifasında öz məzəliliyi ilə tamaşaçıların diqqətini cəlb edən, əsərə maraq verən obrazlardan biridir. O, səhnə mədəniyyəti yüksək olan aktyor jestləri, ifası ilə izləyiciləri ovsunlamağa nail olur...

Kleant rolunu Pərviz İsmayılov, Elizanı Sima Şabanova, Anselm obrazını Aydın Əlibalayev, Valer rolunu Rəhim Qocayev, Marianaııı Lalə Məmməd, Frozina obrazını Brilyant Babayeva, Simon və Carçını Rəşad Rüstəmov, Jak rolunu Akif Yusifov, Brendavuan obrazını Laçın Abbasov, Komissar rolunu Əligüşad Rəhimov müvəffəqiyyətlə ifa edirlər» (M.Leyla, R.Səbinə. – «Ədəbiyyat qəzeti», 23 yanvar 2009).

* * *

Rejissor Mirbala Səlimli müəllifin faciə qəhrəmanı kimi təqdim etdiyi Qurbanın düşüncələrini və əməllərini əsassız və gülünc hesab edir. Belə ki, odunçu Qurban heç bir iş görmədən, yəni zəhmət çəkmədən, mövcud vəziyyətini dürüst qiymətləndirmədən «gözəl arvad, gözəl güzəran» deyə xam xəyallarla xumarlanır. Bu zaman o heç nə görmür, heç kəsi eşitmir.

Hafizə xanım da belədir. Hər şeyə – mülkə, var-dövlətə malik olan, yaraşıqlı cavan, harınlamış Hafizə xanım





kişi həsrətindədir. O, sağlam, yaraşıqlı, sözəbaxan kişi axtarır. Şamama cadunun vasitəsilə Qurbanı tapır. İndi onun dəlisov ehtirasını təmin edəcək adam var...

Beləliklə, Pərinin və bəlli olduğu kimi, Qurbanın, Səlimənin, Hafizənin, bütövlükdə sonrakı hadisələrin hərəkət sükanı Şamama cadunun əlinə keçir. İlk baxışda əməllərin, göstərişlərin sadəcə icraçısı kimi görünən Şamama cadu, əslində hadisələrin nizamlayıcısına, insan talelərinin hakiminə çevrilir, onları dəcəl uşaq oyuncaqlarla oynadığı kimi oynadır.

Rejissor Mirbala Səlimli konsepsiyasının aparıcı siması kimi Şamama cadunu seçməkdə haqlı iş görmüşdür. Bu zaman onun etibar etdiyi aktyor Əbülfət Salahovu uğurlu seçim hesab etmək olar. Bu aktyorun təqdim etdiyi Şamama cadu ağasına sədaqətlidir, öz işinin məharətli ustasıdır. Şamama cadu obrazının aktyor ifasındakı plastik həlli bu və ya digər vəziyyətlərdəki əməl xətti, uğurlu xarakterik boyaları yerli-yerindədir. O, tamaşaçıları bezdirmir, hər gəliş, hər səhnə üçün yeni motivlər, yeni oyun vasitələri tapır, tərəf-müqabilləri ilə ünsiyyətdə təklif edilmiş şəraitə uyğun ifadə tərzi nümayiş etdirir...

«Pəri cadu» tamaşasının poetika göstəriciləri quruluşçu rejissorun təcəssüm prosesindəki özünü-ifadə tərzində, pyesin səhnə həllində bədii təzahürünü tapır. Burada irili-xırdalı səhnə tapıntıları effektli aktyor texnikası ilə mənalanır...

Tamaşanın ideya-estetik konsepsiyasının bədii realizəsinin tərkib elementləri olan janrı, konflikti, hadisələr xətti rejissorun məharətli səyi nəticəsində dürüst tətbiqi həllini tapır, konkret səhnə məqsədləri və aktyor oyunu vasitəsilə aşkarlanır» (İsrafil İsrafilov. Teatr klassikanı seçir. – «Mədəniyyət», 17 – 19 iyun 2009).

* * *

«Şəki teatrı studiyasının fəaliyyətini yerli istedadlı kadrları yetişdirib öz tərkibinə daxil etmək istiqamətində gerçəkləşdirir. Bir sıra bölgə teatrlarında çox kəskin olan kadr problemi, xüsusilə də aktrisa problemi burada ardıcıllıqla, sistemli şəkildə həllini tapır. Belə ki, «Pəri cadu» tamaşasında ikinci baş qəhrəman Hafizə xanım rolunun ifaçısı Sima Şabanova, Səlimə rolunun ifaçısı Lalə Məmmədova, Sayad və Rəqqasə rolunun ifaçısı İnqa Şabanova, Niyaz rolunun ifaçısı Pərviz İsmayılov studiyanın uğurlu işini təsdiqləyən istedadlı gənclərdir. Çoban rolunun ifaçısı təcrübəli aktyor Akif Yusifovla birlikdə mükəmməl ansambl yaradaraq gerçəkləşdirən gənclər Şəki teatrının uğurlu sabahının rəhnidir desəm, mübaliğəyə yol vermərəm» (Məryəm Əlizadə. Milçək hörümçəyi yedi… – «525-ci qəzet», 2 sentyabr 2009).





# ÖZƏL YARADICILIQ SƏCİYYƏLƏRİ

Hər bir sənət ocağında olduğu kimi, Şəki Dövlət Dram Teatrının da sırf onun özünə məxsus özəl yaradıcılıq uğurları olub.

Kollektivin dövlət təsisatındakı ilkin fəaliyyətindən (1933 – 1949) bəhs edəndə teatrın o dövr üçün yaradıcılıq qayə və prinsiplərini müəyyənləşdirməyə çalışmışam.

Teatrın bərpadan sonrakı dövründə (1975/76 – 2015) orijinallıq güclənib, fərdi yaradıcılıq məziyyətləri, axtarış səylərindəki cəsarətli addımları yüksək peşəkarlıqla cilalanıb.

Şəki Dövlət Dram Teatrı yaradıcılıq yollarında ciddi çətinliklərlə də üzləşib. Amma və di gəl ki, hər cür maneələrə dözümlə sinə gərərək müəyyən estetik cığırla mətanətlə, inamla, qətiyyətlə addımlayaraq sənət ocağı kimi formalaşıb. Məncə, dediyim bu formalaşmanın müəyyən əlamətlərini, estetik göstəricilərini tezis şəklində sistemləşdirmək kollektivin yaradıcılıq simasının təqdimi üçün səmərəli olar.

Ümumilikdə (müəyyən sapıntılara baxmayaraq) Şəki teatrının son 40 ildə özünün mövzu-problematikası müəyyənləşib. Onun mərkəzində insan, şəxsiyyət və cəmiyyət problemləri əsas götürülür. Janrından asılı olmayaraq, bütün mövzuların enerji nüvəsini yüksək bəşəri mahiyyət daşıyan insani münasibətlər təşkil edir.

Teatr adi məişət mövzulu əsərlərin səhnə həllində də ictimai-sosial problemlərə meydan aça bilir.

Kollektivin aparıcı rejissorları Hüseynağa Atakişiyev, Cahangir Novruzov və Mirbala Səlimli bir-birindən fərqli, təzadlı, kəskin səciyyəli konfliktlərin bədii-estetik səhnə təcəssümündə həmişə məkan və zaman xronotopunu, məzmun və formanın harmonik ahəngdarlığını həssaslıqla saxlamağı vacib sənət qayəsi kimi qorumaq cəhdində olublar.

Teatr klassik Azərbaycan və dünya ədiblərinin, çağdaş milli və əcnəbi dramaturqların əsərlərini oynamaqla yanaşı, öz ətrafında daimi müəlliflərini də birləşdirə bilib. Vaqif Səmədoğlunun («Uca dağ başında», «Bəxt üzüyü»), Rəhman Əlizadənin («Kəndimizin narları», «Doğmalar», «Dadaşbala əməliyyatı», «Tıq-tıq xanım»), Ramiz Rövşənin («Axşam dərsi»), Arif Abdullazadənin («Evlərin axşamları»), Əkrəm Əylislinin («Vəzifə»), Fikrət Qocanın («İkimərtəbəli adam»), «Tilsimli dairə» (Eldəniz Quliyev) və bir sıra digər pyesləri ilk dəfə məhz Şəki teatrında tamaşaya qoyulub.

Yerli müəlliflərdən Məmmədiyyə Yusifzadənin («Artıq tamah»), Məmməd Çələbiyevin («İstintaq başlanır»),





Məmməd Şəkilinin («Xatalı Kabul», «Hökm», «Yaşıl işıq»), teatrın aktyoru Novruz Cəfərovun («Şəkili + Ayrım», «Gecə yarısından sonra elçilik», "Buna da... şükür») müxtəlif mövzu və janrlı əsərləri repertuarda yer alıb.

Teatr 1975-ci ildən Şəkidə doğulmuş Sabit Rəhmanın adını daşıyır. Kollektiv vaxtaşırı onun komediyalarını tamaşaya hazırlayır. Cəsarətlə demək olar ki, yaradıcı heyət Sabit Rəhmanın «Nişanlı qız» (6 iyul 1976-cı il), «Aşnalar» (31 may 1981-ci il), «Toy» (17 iyun 1983-cü il), «Xoşbəxtlər» (25 may 1985-ci il) əsərlərinə hər dəfə tamamilə fərqli yaradıcılıq estetikası ilə yanaşıb, məlum mövzulara yeni fikir-məntiqlə səhnə təcəssümü verib.

Şəki teatrı cəsarətlə janr müxtəlifliyinin bədii-estetik səhnə həllinə nail olub.

Şəki teatrı əyalətdəki sənət ocaqları arasında yeganə teatrdır ki, bərpadan sonrakı fəaliyyətində özünün yaradıcılıq konsepsiyasını, estetik prinsiplərini daha ifadəli qətiyyətlə bəyan etdi və poetika göstəricilərini formalaşdırdı.

Şəki teatrı bir sıra dünya klassiklərinin, məşhur əcnəbi müəlliflərin yaradıcılığına ilk dəfə müraciət edib.

Azərbaycan teatr məkanında ilk dəfə Şəkinin sənət ocağında əsərləri uğurla tamaşaya qoyulan əcnəbi müəlliflər:

Macar dramaturqu Şandor Petefi («Pələng və kaftar». 6 mart 1979-cu il).

Rus yazıçısı Valentin Rasputin («Halallıq». 14 dekabr 1981-ci il).

İngilis şair və dramaturqu Kristafor Marlo («Teymurləng». 12 may 1983-cü il).

Çex dramaturqu Karl Çapek («Ağ xəstəlik». 30 sentyabr 1983-cü il).

Serb yazıçısı Meşa Səlimoviç («Dərviş və ölüm». 4 noyabr 1986-cı il).

Moldav nasir və dramaturqu İon Drutse («Kürən yabı». 3 may 1988-ci il).

Rus ədibi Mixail Bulqakov («Ustad və Marqarita». 22 mart 1989-cu il).

Suriya dramaturqu Saadalla Vannus («Şah, ya qeyri-şah, şah elə şahdır». 26 sentyabr 1990-cı il).

Avstriya ədibi Ferdinand Brukner («Napoleon». 2 oktyabr 1995-ci il).

Özbək dramaturqu Şərəf Başbəyov («Dəmir qadın». 28 fevral 1998-ci il).

İspan dramaturqu Xose Eçeqaray («Mahir aradüzəldənlər». 30 aprel 2000-ci il).

Polşa dramaturqu Slavomir Mrojek («Xoşbəxt hadisə». 14 mart 2003-cü il).

Türk ədəbiyyatının klassiki Haldun Taner («...Və dəyirman dönərdi». 19 dekabr 2015-ci il).

Teatrın müxtəlif janr və estetikada hazırladığı əsas tamaşalar aşağıdakılardır.

Qaravəlli oyun estetikasında səhnə təcəssümü tapmış ən yaxşı tamaşa: «Adamın adamı», Anar (30 noyabr 1976-cı il).





Klassik yanaşma ilə çağdaş düşüncənin sintezində hazırlanmış ən yaxşı tamaşa: «Kral Lir», Uilyam Şekspir (1 iyun 1977-ci il).

İroniyalı sarkazmın, fəlsəfi fikrin bir neçə qatda açılması baxımdan daha bitkin və daha dərin məna tutumlu tamaşa: «Ezop», Gilerma Fiqeyredo (16 dekabr 1979-cu il).

Azərbaycanda postmodernizm janrında hazırlanmış ilk tamaşa: «Poçt şöbəsində xəyal», Elçin (17 yanvar 1980-ci il).

Məzhəkə oyun estetikasında hazırlanmış ən yaxşı tamaşa: «Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə (12 fevral 1980-ci il).

Bir az ağlamalı, bir az gülməli, bir az kədərli səhnə yozumunda daha maraqlı tamaşa: «Uca dağ başında», Vaqif Səmədoğlu (24 aprel 1980-ci il).

Siyasi qroteskli sarkazm janrında ən yaxşı tamaşa: «Arturo Uinin karyerası», Bertolt Brext (25 noyabr 1980-ci il).

Avropa düşüncəsində mücərrəd mövzunun səhnə təfsirində müasir insanların mənəvi-əxlaqi dəyərlərinə estetik baxışı ehtiva edən ən yaxşı tamaşa: «Meteor», Fridrix Dürrenmatt (30 mart 1981-ci il).

İfşaedici məsxərə oyun estetikasında hazırlanmış ən yaxşı tamaşa: «Aşnalar», Sabit Rəhman (31 may 1981-ci il).

Poetika teatrı estetikasında ən yaxşı tamaşa: «Knyaz», Hüseyn Cavid (1 noyabr 1982-ci il).

Tarixi mövzunun çağdaş siyasi hadisələrlə bağlılıqda yozumu yönündə səhnə təfsiri tapmış ən maraqlı tamaşa: «Teymurləng», Kristafor Marlo (12 may 1983-cü il).

Milli karnaval estetikasında hazırlanmış ən yaxşı tamaşa: «Bəxt üzüyü», Vaqif Səmədoğlu (28 oktyabr 1984-cü il).

Yeniyetmələrin müstəqil həyata qədəm basdıqları astanadakı mənəvi-psixoloji dəyişmənin gərgin dramatizminin daha ifadəli bədii-estetik təcəssümü: «Çinari manifesti», Aleksandr Çxeidze (2 fevral 1986-cı il).

Psixoloji dərinlikli, detektiv təmayüllü janrda ən yaxşı tamaşa: «Tələ», Rober Toma (20 mart 1987-ci il).

Müsyö Jordanda dərvişlik, Məstəli şahda müsyölük əlamətlərinin bədii-estetik səhnə təcəssümünü ehtiva edən ironik ruhlu tamaşa: «Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə (23 may 1987-ci il).

Vodevil janrında hazırlanmış ən yaxşı tamaşa: «Qonşu qonşu olsa, kor qız ərə gedər», Rəşid bəy Əfəndizadə (7 oktyabr 1991-ci il).

Fəlsəfi ruhlu lirik-psixoloji janrda ən yaxşı tamaşa: «Ay tutulan gecə», Mustay Kərim (2 iyun 1995-ci il).

Qara komediya janrı estetikasında oynanılan ən yaxşı tamaşa: «Ruhlar», Eduardo de Filippo (12 may 2002-ci il).

Mürəkkəb, təzadlı insan münasibətlərinin mahiyyətində səadət axtarışları ruhunda daha maraqlı tamaşa: «Xoşbəxt hadisə», Slavomir Mrojek (14 mart 2003-cü il).

Fəlsəfi-psixoloji insan münasibətlərində reallıq axtarışları janrında orijinal səhnə yozumlu, düşündürücü ən yaxşı tamaşa: «Oyuncaq ev», Henrik İbsen (28 fevral 2004-cü il).





Müxtəlif komediya janrlarının sintezində hazırlanmış ən yaxşı milli klassika nümunəsi: «Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə (28 noyabr 2006-cı il).

Jan Batist Molyerin «Xəsis» komediyasının Azərbaycan səhnəsində təbdil olunmamış ilk orijinal tamaşası (14 mart 2008-ci il).

Mənəvi-əxlaqi mövzulu, ictimai-sosial mahiyyətli apofeoz janrında ən yaxşı tamaşa: «Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev (14 may 2009-cu il).

Avropa karnaval estetikası prinsipləri əsasında hazırlanmış ən yaxşı tamaşa: «Aldanmış ər» («Jorj Danden»), Jan Batist Molyer (19 sentyabr 2011-ci il).

Dünən, bü gün, sabah kontekstində fəlsəfi-psixoloji gəzişmədə tarixin faciəvi kəsişməsi estetikasında ən yaxşı tamaşa: «Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev (22 iyul 2014-cü il).

Bütün bunlar Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrının yaradıcılıq simasını müəyyənləşdirən sənətkarlıq xüsusiyyətləridir.

# SƏNƏTDƏ İZ QOYANLAR

## *AKTYORLAR*



### Cəlil Bağdadbəyov
(1887 – 21.4.1951)

Cəlil Bağdadbəyov Qarabağ əsilzadələrindən olan Əmrah bəyin ailəsində 1887-ci ildə Şuşada doğulub. Atası şəhərin sayılıb-seçilən hörmətli bəylərindən idi və elmə, təhsilə yüksək qiymət verirdi. Millətin işıqlı gələcəyini elmdə, mədəniyyətdə, mənəvi tərəqqidə görən Əmrah bəy oğluna Şuşadakı mütərəqqi məktəbdə təhsil verib. İti zehni, kəskin yaddaşı və gözəl qavrama qabiliyyəti, yüksək daxili mədəniyyəti, zəngin mənəvi aləmi olan, milli folklora, etno-mədəni irsə erkən yaşlarından dərin rəğbət bəsləyən Cəlil Bağdadbəyov təhsilini Peterburq gimnaziyasında davam etdirib.





1907-ci ildə «Nicat» mədəni-maarif cəmiyyətinin dram truppasına aktyor götürülüb. 1920-ci ilə kimi ayrı-ayrı teatr dəstələrində iştirak edib. Dərbənddə, Naxçıvanda, Vladiqafqazda, Mahaçqalada müxtəlif janrlı pyeslərə səhnə quruluşu verib. Şamaxı, Salyan, Ağdaş, Zaqatala, Qaryagin (Füzuli), Şuşa, Ağdam, Şəmkir, Naxçıvan, Ordubad şəhərlərinin dram dərnəklərinə və dövlət teatrlarına müntəzəm yaradıcılıq yardımı göstərib. Müxtəlif illərdə Akademik Milli Dram Teatrında, Bakı Türk Azad Tənqid və Təbliğ Teatrında aktyor kimi çalışıb.

Fövqəladə təşkilatçılıq qabiliyyəti olan, rus, ərəb, fransız, fars, özbək, tacik dillərində sərbəst danışan Cəlil Bağdadbəyov 1920-ci illərin ikinci yarısında Azərbaycan Xalq Komissarları Sovetinin qərarı ilə yerlərdə mədəniyyətin yüksəldilməsi üçün Orta Asiyaya göndərilib. Aşqabad (Eşqabad), Səmərqənd, Daşkənd, əsasən Düşənbə şəhərlərində fəaliyyət göstərib.

1933-cü ildə Bakıya qayıdan Bağdadbəyov yenidən qaynar teatr həyatının qoynuna atılıb. Əsas iş yeri Bakı Teatr Məktəbində müəllimlik olub. Bir müddət Şəki Dövlət Dram Teatrında aktyorluq edib. 1941-ci

ildə az müddət Azərbaycan mədəniyyət xadimlərinin tərkibində İranda fəaliyyət göstərib. Oradan qayıdaraq Şəki teatrında çalışıb və eyni zamanda, paralel olaraq Hüseynqulu Sarabski adına Füzuli Dövlət Dram Teatrında, Üzeyir bəy Hacıbəyli adına Şuşa Dövlət Musiqili Dram Teatrında, Seyid Əzim Şirvani adına Şamaxı Dövlət Dram Teatrında, Mirzağa Əliyev adına Şəmkir Dövlət Dram Teatrında və digər sənət ocaqlarında rejissorluq edib.

Bütün ömrünü teatr sənətinin tərəqqisinə, mədəniyyətin inkişafına sərf edən, yorulmadan və coşqun fədakarlıqla çalışan Cəlil Bağdadbəyov 17 iyun 1943-cü ildə, Şuşa teatrında işləyərkən Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Cəlil Bağdadbəyovun Şəki teatrında ifa etdiyi əsas rollar: Hacı Qara, Hacı Nuru («Hacı Qara» və «Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə), Hacı Salman («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), Mirzə Qoşunəli («Bəxtsiz cavan», Əbdürrəhim bəy Haqverdiyev), İmamverdi və Məhkəmə sədri, Babakişi («1905-ci ildə» və «Sevil», Cəfər Cabbarlı), Qurban kişi («Vaqif», Səməd Vurğun), Mehralı, Nəsirov («Toy» və «Xoşbəxtlər», Sabit Rəhman), Məşədi Hüseyn («Həyat», Mirzə İbrahimov), İntiligent Həsən («Məşədi İbad», Üzeyir bəy Hacıbəyli), Səfər kişi («Qaçaq Nəbi», Süleyman Rüstəm), Senator («Otello», Uilyam Şekspir), Andreyev («Özgə uşağı», Vasili Şkvarkin), Barxudar («Namus»,





Aleksandr Şirvanzadə), Ələkbər («Polad Qartal», Aleksandr Korneyçuk), Vaxtanq («Vətən namusu», Georgi Mdivani).

Fədakar səhnə xadimi 1951-ci il aprel ayının 21-də Bakıda vəfat edib.



## İbrahim Azəri
(21.3.1898 – 25.1.1969)

Milli səhnəmizin fədakar aktyorlarından olan İbrahim Ağakərim oğlu Atakişiyev (İbrahim Azəri) 21 mart 1898-ci ildə Bakıda doğulub. Mükəmməl təhsil alıb. Soyadı bəzi tamaşa proqramlarında «Atakişizadə», «İbrahimzadə» yazılıb. Daha çox «İbrahim Azəri» kimi çıxış edib.

Səhnəyə ilk dəfə Bakıda 1914-cü ildə Mehdi bəy Hacınskinin «Yezid ibn Müaviyə» dramında Qoca rolunda çıxıb. Müxtəlif illərdə «Nicat», «Səfa» mədəni-maarif cəmiyyətlərinin teatr dəstələrində, «Zülfüqar bəy və Üzeyir bəy Hacıbəyli qardaşlarının müdiriyyəti» («Müdiriyyət») teatr truppasında çıxış edib. 1921-ci ildə

Akademik Milli Dram Teatrının truppasına qəbul olunub.

1926-cı ildə müsavata rəğbət göstərməsi ittihamı ilə həbs edilib. Ona 8 il iş kəsilib və Kareliyaya sürgün edilib. Həbsdən 2 il tez qayıdıb. Müəyyən vaxtlarda Gəncə, Şəki, Quba, Zaqatala, Salyan, Aşqabad, Tiflis və İrəvan teatrlarında da aktyorluq edib.

Şəki teatrında ifa etdiyi əsas rollar: Otello («Otello», Uilyam Şekspir), Əlimərdan («Eşq və intiqam», Süleyman Sani Axundov), Hacı Əhməd, Aqşin («Almaz» və «Od gəlini», Cəfər Cabbarlı), Dəmirçi Musa («Toy», Sabit Rəhman), Mehdi («Qaçaq Nəbi», Süleyman Rüstəm), Kamil, Baloğlan («Xasay» və «El oğlu», Abdulla Şaiq), Qaraulov («Özgə uşağı», Vasili Şkvarkin), Qulu («Çətin dərə», Səttar Axundov), Soltan bəy və Süleyman («Arşın mal alan», Üzeyir bəy Hacıbəyli).

Aktyor «Qız qalası» (Vəzir), «Bismillah» (Cəfər), «Bir məhəllədən iki nəfər» (Həbsxana işçisi), «Mollanın sərgüzəşti» (Kişi), «Səhər» (Fəhlə) bədii filmlərində epizod rollara çəkilib. «Məhv olsun cəhalət» adlı pyesi var.

İbrahim Azəri 25 yanvar 1969-cu ildə Bakıda vəfat edib.





## Məmmədkəbir Hacıoğlu
(1906 – 12 iyun 1977)



Məmmədkəbir Hacı oğlu Kərimovun səhnə təxəllüsü «Hacıoğlu»dur.

Çox koloritli yumoru vardı və yeri gələndə bu gülüşə mənalı satirik çalar verə bilirdi.

Komediyalarda satirik elementlərdən istifadə edəndə ölçü hissini həssaslıqla gözləyirdi.

Zəhmətkeşliyi, fədakarlığı və səhnəyə vurğunluğu ilə sevilirdi.

İfa etdiyi dramatik rollarda psixoloji dürüstlüyə səy göstərirdi.

Fitri istedad sahibi olan aktyor 1906-cı ildə Şəkidə doğulub. Burada ibtidai təhsil alıb. Səhnə fəaliyyətinə 1920-ci ildə «Darvaza» dram dərnəyində həvəskar aktyor kimi başlayıb. 1933-cü ilə kimi bu dərnəkdə əvvəllər aktyor, bir neçə il sonra isə həm də rejissor kimi çalışıb. Mirzə Ələkbər Sabir adına Nuxa Dövlət Dram Teatrında (bugünkü Şəki Dövlət Dram Teatrı) işləyib (1933 – 1949).

Hacıoğlu müharibə illərində bir müddət teatrın direktoru olub. Şəki mədəniyyət evindəki dram dərnəyində bədii rəhbər (1949 – 1953), Mirzə Fətəli Axundzadə adına şəhər mədəniyyət və istirahət parkının direktoru (1953 – 1956), rayon mədəniyyət evinin direktoru (1956 – 1959), xalq teatrının rejissoru (1959 – 1973) işləyib.

1949-cu ildə bağlanmış Şəki teatrı 1975-ci ildə bərpa olunanda aktyor truppasına ilkin qəbul edilənlərdən biri Hacıoğlu idi. 23 fevral 1940-cı ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif edilib.

Milli klassik sənətkarlarımızın facia, dram və komediyalarında oynadığı səhnə obrazları: Cəfər Cabbarlının dramlarında Böyük bəy («Aydın»), Atakişi («Sevil»), Ağamyan («1905-ci ildə»), İbad («Almaz»), Altunbay («Od gəlini»), həmçinin başqa dramaturqların əsərlərində Hacı Qara, Kərəməli və Naçalnik, Hacı Kərim («Hacı Qara» və «Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə), Şahbaz bəy («Eşq və intiqam», Süleyman Sani Axundov), Məşədi İbad və Rüstəm bəy, Əsgər və Süleyman («Məşədi İbad» və «Arşın mal alan», Üzeyir bəy Hacıbəyli), Qacar («Vaqif», Səməd Vurğun), Bərbərzadə və Çeşməkli kişi, Kərəmov («Xoşbəxtlər» və «Toy», Sabit Rəhman).

Azəbaycanlı müəlliflərin əsərlərinin tamaşalarında ifa etdiyi əsas rollar: Qəşəm Məmişov, Qurban kişi («Məhəbbət» və «Həyat», Mirzə İbrahimov), Bəndalı, Nekrasov («Bayram günü» və «Çətin dərə», Səttar Axundov), Şah («Nizami», Mehdi Hüseyn), Səlim bəy





(«Qaçaq Nəbi», Süleyman Rüstəm), Qəhrəman («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə və bəstəkar Fikrət Əmirov), Şah («Qız qalası», Rza Şahvələd), Baba («Aslan yatağı», Məmmədhüseyn Təhmasib).

Tərcümə pyeslərinin tamaşalarında çıxış etdiyi səhnə surətləri: Yaqo («Otello», Uilyam Şekspir), Rüstəm («Namus», Aleksandr Şirvanzadə), Mehdiyev («Polad Qartal», Aleksandr Korneyçuk), Saridon («Vətən namusu», Georgi Mdivani).

Hacıoğlu teatrda bir sıra tamaşalara quruluş verib, bəzi səhnə əsərlərində rejissor assistenti kimi iştirak edib.

Səhnə xadimi 12 iyun 1977-ci ildə Şəkidə vəfat edib.

## Yunis Qarabağlı
(8.2.1909 – 3.11.1985)



Yunis Şükür oğlu Məmmədov Ağdamda anadan olub. Qarabağlı onun səhnə təxəllüsüdür. İbtidai təhsil alıb. Şirin və məlahətli səsi olduğu üçün Ağdamda fəaliyyət göstərən dram kollektivinin rəhbəri Əhməd

Ağdamskinin dəvəti ilə səhnə sənətinə bağlanıb. Barama açma müəssisəsində işləməklə yanaşı, həvəskar aktyor kimi də fəaliyyət göstərib. Üzeyir bəy Hacıbəylinin «Leyli və Məcnun» (Məcnun), «Əsli və Kərəm» (Kərəm), «Şah Abbas və Xurşid banu» (Şah Abbas), Əbdürrəhim bəy Haqverdiyevin «Pəri cadu» (Dərviş), Nəcəf bəy Vəzirovun «Hacı Qənbər» (Hacı Salman), Hüseyn Cavidin «Şeyx Sənan» (Kor ərəb) rollarında çıxış edib.

1928 – 1933-cü illərdə bugünkü Akademik Milli Dram Teatrının, Opera teatrının yardım heyətlərində işləyib. 1933-cü ildə Mirzə Ələkbər Sabir adına Nuxa (Şəki) Dövlət Dram Teatrı açılanda Yunis Qarabağlı bu kollektivə dəvət alıb. 1949-cu ilin əvvəllərində teatr bağlananda Şəki ipək kombinatının klubunda müdir kimi çalışıb (1949 – 1968-ci illərdə). Burada fəaliyyət göstərən dram dərnəyində də çıxış edib. Təsviri sənətdə də xüsusi istedadı olan sənətkar 1968 – 1975-ci illərdə Şəki xalq teatrında rəssamlıq edib. Kollektivdə hazırlanan tamaşalara maraqlı səhnə tərtibatı verib. 1975-ci ildə Şəki Dövlət Dram Teatrı bərpa olunanda Yunis Qarabağlı ömrünün sonuna kimi kollektivin butafor sexinə rəhbərlik edib.

Səhnə fədaisinin Şəki teatrında ifa etdiyi əsas rollar: Kərəm, Sərvər, Süleyman («Əsli və Kərəm», «Məşədi İbad» və «Arşın mal alan», Üzeyir bəy Hacıbəyli), Aşıq Qərib («Aşıq Qərib», Zülfüqar bəy Hacıbəyli), Şaliko («Vaqif», Səməd Vurğun), Ocaqqulu, Yanardağ, Usta Muxan («Almaz», «Od gəlini» və «1905-ci ildə», Cəfər Cabbarlı), Birinci kolxozçu, Usta Segah («Toy» və





«Xoşbəxtlər», Sabit Rəhman), İsgəndər («Məhəbbət», Mirzə İbrahimov), Təhmas bəy («Qaçaq Nəbi», Süleyman Rüstəm), İzzətullayev («Aslan yatağı», Məmmədhüseyn Təhmasib), Yusif («Nizami», Mehdi Hüseyn), Xanəndə («Qız qalası», Rza Şahvələd), Safonov (Vətən oğlu», Konstantin Simonov), Alay («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə, bəstəkar Fikrət Əmirov), Aşıq Murad («Durna», dramaturq Süleyman Rüstəm, bəstəkar Səid Rüstəmov),Yusif («Özgə uşağı», Vasili Şkvarkin).

Aktyor «Ögey ana», «Dəli Kür», «Yenilməz batalyon», «Arxadan vurulan zərbə» filmlərində çəkilib.

Yunis Qarabağlı 3 noyabr 1985-ci ildə Şəkidə vəfat edib.

## Bilqeyis Ələsgərova
(1913 – 8 aprel 1969)



Şəki teatrının peşəkar aktyorlarındandır. Teatrda aktrisaların azlıq təşkil etdiyi vaxtlarda cəsarətlə səhnəyə çıxıb.

Yaradıcılıq keyfiyyətləri daha çox dramatik rolların ifası istiqamətində formalaşmışdı.

Buna baxmayaraq, maraqlı komediya obrazlarında da çıxış edib.

Bilqeyis Yusif qızı Ələsgərova 1913-cü ildə Şəkidə doğulub. Səhnə fəaliyyətinə 1928-ci ildə dram dərnəyində başlayıb. 1934 – 1949-cu illərdə Mirzə Ələkbər Sabir adına Nuxa (indiki Şəki) Dövlət Dram Teatrında aktrisa işləyib. 1959 – 1968-ci illərdə Şəki xalq teatrında aktrisalıq edib, bir müddət dram dərnəyinin rəhbəri olub. 1968-ci ildə Mərziyə Davudova adına Mingəçevir Dövlət Dram Teatrı açılanda az müddət orada işləyib. Ağır xəstələndiyi üçün 1969-cu ilin əvvəllərində Şəkiyə qayıdıb.

Şəki teatrında Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərində ifa etdiyi əsas rollar: Teybə («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Züleyxa («Xasay», Abdulla Şaiq), Gülnisə, Böyükxanım, Kəblə Fatmanisə, Gülgün («Solğun çiçəklər», «Aydın», «Almaz» və «Od gəlini», Cəfər Cabbarlı), Yengə («Vaqif», Səməd Vurğun), Maral, Zalxa («Xoşbəxtlər» və «Toy», Sabit Rəhman), Xanım xala və Atlasın anası, Fatmanisə («Həyat» və «Məhəbbət», Mirzə İbrahimov), Püstə xala, Pərnisə («Bayram günü» və «Çətin dərə», Səttar Axundov), Xədicə («Nizami», Mehdi Hüseyn), Növbətçi qadın, Nigar («Bahar» və «Aslan yatağı», Məmmədhüseyn Təhmasib), Leyla, Gülbacı və Fatma («Qaçaq Nəbi», Süleyman Rüstəm), Yengə («Qız qalası», Rza Şahvələd), Nargilə («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə





və bəstəkar Fikrət Əmirov), Lalə («Durna», dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmov).

Tərcümə əsərlərinin tamaşalarında oynadığı səhnə personajları: Anna İvanovna («Vətən oğlu», Konstantin Simonov), Liza («Özgə uşağı», Vasili Şkvarkin), Sənəm və Məryəm («Namus», Aleksandr Şirvanzadə), Nənə («Qırmızı qalstuk», Sergey Mixalkov).

Bilqeyis Ələsgərova 1956-cı il iyun ayının 1-də Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif edilib.

Aktrisa 8 aprel 1969-cu ildə Şəkidə vəfat edib.

## Kamil Qubuşov
(25.12.1915 – 30.10.1977)



Güclü və qəltanlı səsi vardı. Dramatik xarakterli rolları daha uğurla oynayıb.

Səsinin çalar və ahənginə uyğun hərəkət plastikasından istifadə edirdi.

Kamil Mehdi oğlu Qubuşov (Kubışev) 1932 – 1935-ci illərdə Mirzə Fətəli Axundzadə adına Bakı Teatr Məktəbində təhsil alıb. 1940 – 1946-cı illərdə hərbi xidmət keçib. 1935 – 1936-cı illərdə İrəvan Dövlət Azərbaycan Dram Teatrında, 1936 – 1938-ci illərdə Nuxa (indiki Şəki) Dövlət Dram Teatrında, 1938 – 1940, 1946 – 1949 və 1962 – 1974-cü illərdə Akademik Milli Dram Teatrında aktyor işləyib. 1949 – 1951-ci illərdə Bakı kinostudiyasında çalışıb. 1959 – 1962-ci illərdə Azərbaycan Dövlət Radiosunda diktor olub.

Şəki teatrında ifa etdiyi əsas rollar: Balaş, Əbu Übeyd, Eyvaz («Sevil», «Od gəlini» və «1905-ci ildə», Cəfər Cabbarlı), Süleyman («Həyat», Mirzə İbrahimov), Polad Qartal («Polad Qartal», Aleksandr Korneyçuk), Seyran («Namus», Aleksandr Şirvanzadə), Əşrəf bəy («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), İbrahim xan («Vaqif», Səməd Vurğun), Təhmas bəy («Qaçaq Nəbi», Süleyman Rüstəm), Qoçu Əsgər («Məşədi İbad», Üzeyir bəy Hacıbəyli).

«Azərbaycanfilm» kinostudiyasında «Lətif» (Kəndli), «Bakıda küləklər əsir» (Neftçi), «Dəli Kür» (Kənd sakini), «Bizim Cəbiş müəllim» (Müəllim), «Sən niyə susursan?» (Bəbir), «Qaraca qız» (Bəy), «Qatır Məmməd» (Sadıq xan) bədii filmlərinə çəkilib.

Kamil Qubuşov 30 oktyabr 1977-ci ildə Bakıda vəfat edib.





## Məmməd Xalıqov
(1915 – 22.10.1958)



Yaradıcılığının əsas xüsusiyyəti səmimiyyət idi. Sadə, lakin müəyyən fikri ifadə edə bilən ştrixlərdən istifadə etməyi xoşlayırdı.

Romantik və realist aktyor məktəbinin ifadə vasitələrindən paralel şəkildə istifadə edirdi.

Məmməd (Məşəmməd) Məmməd oğlu Xalıqov 1915-ci ildə Bakının Buzovna kəndində doğulub. Burada 7-ci sinfi bitirib. 1933 – 1936-cı illərdə Mirzə Fətəli Axundzadə adına Bakı Teatr Məktəbində teatr aktyorluğu təhsili alıb. 1936 – 1949-cu illərdə Mirzə Ələkbər Sabir adına Nuxa (Şəki) Dövlət Dram Teatrında aktyor işləyib. 1949-cu ilin birinci yarısında Şəki teatrı bağlanıb. Məmməd Xalıqov Bakıya qayıdaraq Azərbaycan Dövlət Teatr İnstitutunda təhsil alıb. Tələbə vaxtından Gənc Tamaşaçılar Teatrının truppasına qəbul edilib. Bu teatrda da xeyli rollar oynayıb.

Aktyorun Şəki Dövlət Dram Teatrında milli klassik dramaturqlarımızın əsərlərində ifa etdiyi əsas rollar: Hacı Qara, Məstəli şah («Hacı Qara» və «Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Hacı Qənbər və Hacı Salman («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), Mirzə Səməndər, Atakişi, Oddamdı, Əmiraslan bəy Salamov («Almaz», «Sevil», Od gəlini» və «1905-ci ildə», Cəfər Cabbarlı), Mirzə Rəhim («Xasay», Abdulla Şaiq), Şeyx Alı və Vidadi («Vaqif», Səməd Vurğun), Mirzə Hüseyn, Mirzə Qərənfil («Toy» və «Nişanlı qız», Sabit Rəhman).

Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında çıxış etdiyi səhnə obrazları: Əhməd Biqəm, Tamada («Məhəbbət» və «Həyat», Mirzə İbrahimov), Qivami («Nizami», Mehdi Hüseyn), Zeyniş («İntizar», Mehdi Hüseyn və İlyas Əfəndiyev), Veysəl, Mehdi («Bahar» və «Aslan yatağı», Məmmədhüseyn Təhmasib), Koxa Məmməd («Qaçaq Nəbi», Süleyman Rüstəm), Hüseyn («Çətin dərə», Səttar Axundov), Məşədi İbad, Soltan bəy («Məşədi İbad» və «Arşın mal alan», Üzeyir bəy Hacıbəyli), Xacə Soltan («Aşıq Qərib», Zülfüqar bəy Hacıbəyli).

Tərcümə əsərlərinin tamaşalarında ifa etdiyi əsas rollar: Zabit («Vətən oğlu», Konstantin Simonov), Almas xan («Vətən namusu», Georgi Mdivani), Barxudar («Namus», Aleksandr Şirvanzadə), Qaraulov («Özgə uşağı», Vasili Şkvarkin), Mirzə Loğman («Polad Qartal», Aleksandr Korneyçuk).





Aktyorluq etməklə yanaşı, Şəki teatrında bir sıra tamaşalarda rejissor assistenti kimi çalışıb. Bir neçə əsərə rejissor kimi quruluş verib.

Məmməd Xalıqov 22 oktyabr 1958-ci ildə Bakıda vəfat edib.

## Yusif Vəliyev
(22.3.1917 – 18.3.1980)



Romantik və realist aktyor məktəbinin görkəmli nümayəndələrindən olan Yusif Abdulla oğlu Vəliyev 1917-ci il mart ayının 3-də qədim Azərbaycan şəhəri Dərbənddə doğulub. Yeddiillik məktəbi burada bitirib və Bakıya gələrək Mirzə Fətəli Axundzadə adına Teatr Məktəbində təhsil alıb (1933 – 1936). Tələbə vaxtı Akademik Milli Dram Teatrının tamaşalarında kütləvi səhnələrdə çıxış edib. Həmçinin Azərbaycan Dövlət Yəhudi Teatrında aktyor işləyib. Yəhudi dilini bilməyib, ancaq sözləri əzbərləyərək bir neçə rol oynayıb. Əsas ya-

radıcılığa Mirzə Ələkbər Sabir adına Nuxa (Şəki) Dövlət Dram Teatrında başlayıb və bu sənət ocağında zəngin səhnə təcrübəsi qazanıb (1936 – 1949). 1949-cu ildə Şəki teatrı bağlananda Bakıya gəlib. Əvvəlcə Azərbaycan Dövlət Rus Dram Teatrının aktyor truppasına daxil olub. Az müddət sonra Gənc Tamaşaçılar Teatrına keçib və ömrünün sonuna kimi bu kollektivdə çalışıb.

Şəki teatrında ifa etdiyi əsas rolları dörd aspektdə dəyərləndirmək olar.

Klassik milli dramaturqlarımızın dramlarında ifa etdiyi rollar: Cəfər Cabbarlının əsərlərində Aydın («Aydın»), Elxan («Od gəlini»), Oqtay («Oqtay Eloğlu»), General-qubernator («1905-ci ildə»), Balaş («Sevil»), Bəhram («Solğun çiçəklər»), həmçinin Hacı Qara («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Əşrəf bəy, Fəxrəddin («Hacı Qənbər» və «Müsibəti-Fəxrəddin», Nəcəf bəy Vəzirov), Fərhad («Bəxtsiz cavan», Əbdürrəhim bəy Haqverdiyev), Surxay, Sadıq («Toy» və «Xoşbəxtlər», Sabit Rəhman), Vaqif («Vaqif», Səməd Vurğun).

Azərbaycan müəlliflərinin pyeslərinin tamaşalarında çıxış etdiyi bədii personajlar: Süleyman («Həyat», Mirzə İbrahimov), Tərlan («Bahar», Məmmədhüseyn Təhmasib), Alxas bəy («İntizar», İlyas Əfəndiyev və Mehdi Hüseyn), Xan («Qız qalası», Rza Şahvələd).

Əcnəbi müəlliflərin səhnə əsərlərində oynadığı obrazlar: Yaqo («Otello», Uilyam Şekspir), Seyran («Namus», Aleksandr Şirvanzadə), Doktor Frantişek («Praqanın şabalıd ağacları altında», Konstantin Simonov), Nadir («Vətən namusu», Georgi Mdivani), Nəsir («Polad Qartal», Aleksandr Korneyçuk).





Aktyor Üzeyir bəy Hacıbəylinin «Leyli və Məcnun» (İbn Səlam), «Arşın mal alan» (Vəli), «Məşədi İbad» (Həsən bəy və Həsənqulu bəy), «Ər və arvad» (Mərcan bəy) opera və operettalarında, dramaturq Məhərrəm Əlizadə ilə bəstəkar Ağası Məşədibəyovun «Toy kimindir?» (Qoşun) musiqili komediyasında da maraqlı rollar oynayıb.

Gənc Tamaşaçılar Teatrında ifa etdiyi obrazları dörd qismə bölmək olar: romantik rollar, realist zəminli dramatik surətlər, lirik-psixoloji personajlar və komediyalarda yaratdığı obrazlar. Aktyorun bu teatrda daha möhtəşəm sənət qələbələri qazandığı rollar aşağıdakılardır.

Romantik səpkili dramlarda və faciələrdə ifa etdiyi səhnə obrazları: Ovod-Artur («Ovod», Etel Voyniç), Rüstəm («Söhrab və Rüstəm», İsgəndər Coşqun. Firdovsinin «Şahnamə» poeması əsasında), Mister Harle («Tom dayının koması», Biçer Stou), Hacı Səməd ağa («Bəxtsiz cavan», Əbdürrəhim bəy Haqverdiyev), Lorenso («Romeo və Cülyetta», Uilyam Şekspir), Gəray bəy («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında).

Dramatik janrlı tamaşalardakı müxtəlif yaş nəslinə aid rolları: İmamyar («Yaşar», Cəfər Cabbarlı), Mirzə Ələkbər Sabir («Komissar», Mehdi Hüseyn. Səhnələşdirəni Ağəli Dadaşov), Jarov («Düşmənlər içində», Novruz Gəncəli).

Lirik və psixoloji çalarlı bədii personajlar: Nəcəf («Mənim nəğməkar bibim», Əkrəm Əylisli), Ağabəy («Bir gəncin manifesti», Mir Cəlal. Səhnələşdirəni Ağəli Dadaşov), Səfər («Dağ seli», Əfqan), Ataman-Kamal («Anacan», Yusif Əzimzadə).

Komediyalarda ifa etdiyi rollar: Hatəmxan ağa, Molla İbrahimxəlil («Müsyö Jordan və dərviş Məstəli şah» və «Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə), Hacı Qənbər («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), Harun ər-Rəşid («Bir saat xəlifəlik», Abdulla Şaiq), Anuçkin («Evlənmə», Nikolay Qoqol), Jeront («Skapenin kələkləri», Jan Batist Molyer), Protey («İki veronalı», Uilyam Şekspir).

«Azərbaycanfilm» kinostudiyasında «Bəxtiyar» (Komisya üzvü), «Zirvə» (Fəraməz), «Dağlarda döyüş» (Milis işçisi), «General (Əliağa Şıxlinski), «İnsan məskən salır» (Neftçi), «İstintaq» (Milis), «Sən nə üçün susursan?» (Balıqçı), «Bir cənub şəhərində» (Səfərəli), «Gəncəbasarlı qisasçı» («Qatır Məmməd». Şəkili tacir), «Arxadan vurulan zərbə» (Qurd Cəbrayıl-Fəttah kişi), «Tütək səsi» (Qılınc Qurban), «Nəsimi» (Əmir Teymur), «Uşaqlığın son gecəsi» (İş icraçısı) bədii filmlərinə çəkilib. Onlarla filmdə müxtəlif Azərbaycan aktyorlarının ifa etdiyi obrazları səsləndirib. Yüzdən çox filmin dublyajında iştirak edib.

Yusif Vəliyev «Komsomol poeması» tamaşasındakı Gəray bəy roluna görə Lenin komsomolu mükafatına layiq görülüb (1967).





Aktyor 24 may 1960-cı ildə Azərbaycan Respublikasının Əməkdar artisti və 9 fevral 1979-cu ildə Xalq artisti fəxri adları ilə təltif edilib.

Yusif Vəliyev romantik ruhlu tamaşalarda ehtiraslı və coşqun ifadə vasitələrini zərgər dəqiqliyi ilə obrazın ruhuna hopdururdu.

Realist səpkili rollarda dərin psixologizmi və emosional səmimiyyəti ilə heyranlıq doğururdu.

Ecazkar səsinin psixoloji dəyişmələri ilə oynadığı obraza dramaturji əzəmət bəxş edirdi.

Faciə rolları üçün zəngin daxili ifadə vasitələri, mənalı mimika-jest vərdişləri vardı.

Lirik-psixoloji epizodlarda pauzalardan böyük ustalıqla istifadə edirdi. İstər səhnədə sözsüz gəzintisi, istər «lal» baxışları, istərsə də gözlərini bir nöqtəyə zilləyərək «donuq» görkəmi ilə sanki çox mənalı və dərin mətləbli monoloq söyləyirdi.

Dramaturji və kəskin dönüşlü dialoqlarında ifadə vasitələrinə fəlsəfi dərinlik aşılayırdı.

Dublyaj işində yüksək mədəniyyəti və zəngin təcrübəsi vardı. Bir sıra aktyorlarımızın nəhəng rollarını məhz Yusif Vəliyev səsləndirib. Bununla da həmin obraza möhtəşəmlik və psixoloji əzəmət verib. «Axırıncı aşırım» filmində Ədil İsgəndərovun ustalıqla oynadığı Kərbəlayı İsmayıl obrazı Yusif Vəliyevin səsi ilə daha da qüdrətli və möhtəşəm alınıb.

Dramaturji hadisələrdən asılı olaraq, səhnəyə tək çıxanda əzəmətli baxılırdı. Sanki səhnə ifaçılarla dopdolu olurdu.

Teatrın bütün yaş nəslinə mənsub aktyorları Yusif Vəliyevlə yöndaş olmağa can atırdılar. Çünki onun yüksək peşəkarlığı digər ifaçılara da sirayət edir, hər kəsi daxili səfərbərliyə, psixoloji dəqiqliyə kökləyirdi.

Yusif Vəliyev 18 mart 1980-ci ildə Bakıda vəfat edib.



## Mustafa Əhmədzadə
(1917 – 1981)

Yaradıcılığı və səhnə imkanları realist aktyor məktəbinin estetik prinsiplərinə daha uyğun gəlir.

İfa etdiyi rollar təbiiliyi və koloritli realizmi ilə seçilib.

Əhməd Baqi oğlu Mustafazadə 1917-ci ildə Şəkidə doğulub. Yeddiillik təhsil alıb. Səhnəyə 14 yaşında İpək fabrikindəki dram dərnəyində çıxıb. 1934-cü ildə az müddət fəaliyyət göstərən dövlət teatrına aktyor götürülüb. 1936-cı ildə yenidən təşkil olunan Şəki Dövlət Dram Teatrının truppasına daxil olub. Rayonda mədəniyyət sahəsində müxtəlif vəzifələrdə işləyib. 1949-cu ildə bağ-





lanmış Şəki teatrı 1975-ci ildə bərpa olunanda qocaman sənətkar yenidən doğma kollektivə qayıdıb. 1980-ci ilin sonlarına qədər bu teatrda çalışıb.

Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi əsas səhnə obrazları: Səlim, Dönməz («Aydın» və «Od gəlini», Cəfər Cabbarlı), Anbar Hüseyn («Aşnalar», Sabit Rəhman), Aşıq («Qız qalası», Rza Şahvələd), Dursun («Durna», dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmov), Fantanov («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə və bəstəkar Fikrət Əmirov), Tağı müəllim («Şirinbala bal yığır», Salam Qədirzadə), Xoca Zığ-zığ («Adamın adamı», Anar), Briqadir («Əks-səda», Nəbi Xəzri), Qonşu kişi («Bir saat xəlifəlik», Abdulla Şaiq), Usta Nicat («Artıq adam». İkinci adı «Yollara iz düşür», Bəxtiyar Vahabzadə), Qoca («Bağdada putyovka var», Əkrəm Əylisli), Molla («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Qoca kəndli («İmzalar içində», Nəriman Həsənzadə).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Raad («Pələng və kaftar», Şandor Petefi), Qoca («Kral Lir», Uilyam Şekspir), Çaşkin («Qırmızı qalstuk», Sergey Mixalkov).

Əsl teatr fədaisi olan Mustafa Əhmədzadə 1981-ci ildə dünyasını dəyişib.



## Hökümə Qasımova
(7.11.1919 – 1982)

Qızlıq soyadı İsmayılovadır. Səhnə fəaliyyətinin ilk illərində afişa və proqramlarda Hökümə İsmayılova kimi təqdim olunub.

Həyat yoldaşı Türhüd Qasımov da Şəki teatrında aktyorluq edib.

Enerjili aktrisa idi və çılğın təbiətli rollarda daha çox uğur qazanırdı.

Hökümə Qurban qızı Qasımova (İsmayılova) 1919-cu il noyabr ayının 7-də Bakıda doğulub. 38 saylı məktəbin yeddinci sinfini bitirib. Səhnəyə ilk dəfə 13 yaşında Əli Bayramov adına qadınlar klubunda çıxıb. 1933 – 1936-cı illərdə Mirzə Fətəli Axundzadə adına Bakı Teatr Məktəbində aktyorluq təhsili alıb. Onların kursu təhsillərini başa vuranda, başda sənət müəllimləri Həsən Əliyev və Cəlil Bağdadbəyov olmaqla, qısa fasilədən sonra yenicə fəaliyyətə başlayan Mirzə Ələkbər Sabir adına Nuxa (Şəki) Dövlət Dram Teatrına işləməyə göndəriliblər. Hökümə xanım da onların arasında olub.

Aktrisa 1938-ci ildə Gəncə Dövlət Dram Teatrına gedib. İki il sonra yenə Şəkiyə qayıdıb.

1941 – 1945-ci illərdə könüllü olaraq Böyük Vətən müharibəsində iştirak edib. 1945-ci ildən 1949-cu ilin ortalarına kimi Şəki teatrının kollektivində çalışıb.

Hökümə xanım 1950-ci ildə Akademik Milli Dram Teatrının truppasına qəbul olunub və uzun illər bu sənət ocağında çalışıb. Akademik teatrda əllidən çox müxtəlif janrlı tamaşalarda çıxış edib. 10 avqust 1978-ci ildə təqaüdə çıxıb. Təqaüddə olsa da, bir müddət repertuardakı rol oynadığı tamaşalarda müqavilə ilə iştirak edib.

Aktrisanın Şəki Dövlət Dram Teatrında ifa etdiyi əsas rollar: Sona («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Sara, Gültəkin («Solğun çiçəklər» və «Aydın», Cəfər Cabbarlı), Məryəm, Gülnar («Fərhad və Şirin» və «Vaqif», Səməd Vurğun), Qumru («Aşnalar», Sabit Rəhman), Gülyaz («İntizar», Mehdi Hüseyn və İlyas Əfəndiyev), Durna («Qız qalası», Rza Şahvələd), Qumru («Bahar», Məmmədhüseyn Təhmasib), Telli («Arşın mal alan», Üzeyir bəy Hacıbəyli), Sevgili («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə və bəstəkar Fikrət Əmirov), Durna («Durna», dramaturq Süleyman Rüstəm və bəstəkar Səid Rüstəmov), Zərif («Bayram günü», Səttar Axundov), Yaqut («Məlik Məmməd», Əyyub Abbasov), Ray («Özgə uşağı», Vasili Şkvarkin), Marina («Qırmızı qalstuk», Sergey Mixalkov).

Teatrda işləməklə yanaşı, «Bizim küçə» (Qadın), «Firəngiz» (Musanın arvadı), «Qanun naminə» (Yavər), «Uşaqlığın son gecəsi» (Davudun arvadı), «Qaynana» (Xəstə) bədii filmlərinə çəkilib.

Hökümə Qasımova 1982-ci ildə Bakıda vəfat edib.



Sədayə Mustafayeva
(15.7.1926 – 13.8.2004)

Səmimi və emosional, psixoloji və dramatik aktrisa idi. Səhnə məlahəti tamaşaçılarda oynadığı rollara rəğbət oyadırdı.

Yaradıcılığının yetkin dövrü Cəfər Cabbarlı adına Gəncə Dövlət Dram Teatrı ilə bağlıdır. Gəncə teatrının repertuarındakı uzunömürlü tamaşaların əksəriyyətində əsas rolların ifaçısı olub.

Sədayə İsmayıl qızı Mustafayeva 15 iyul 1926-cı ildə Şəkidə doğulub. Yeddiillik təhsil alıb. Peşəkar aktrisalığa 14 yaşında Şəki Dövlət Dram Teatrında başlayıb. Bir





müddət Ağdaş və Göyçay teatrlarında işləyib. 1950-ci ildə Gəncə Dövlət Dram Teatrına dəvət alıb. Teatrın aparıcı aktyoru, xalq artisti Məmməd Bürcəliyevin həyat yoldaşı idi. 20 may 1958-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti və 24 dekabr 1981-ci ildə Xalq artisti fəxri adları ilə təltif olunub. Prezident təqaüdçüsü idi.

Şəki teatrında ifa etdiyi əsas rollar: Şərəfnisə («Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Sürmə («Almaz», Cəfər Cabbarlı), Çimnaz («Qaçaq Nəbi», Süleyman Rüstəm), Nübar («Çətin dərə», Səttar Axundov), Süsənbər («Namus», Aleksandr Şirvanzadə), Lena («Aslan yatağı», Məmmədhüseyn Təhmasib), Töhfə («Məhəbbət», Mirzə İbrahimov), Kamilə, Rəhilə («Toy» və «Aşnalar», Sabit Rəhman), Gülyaz («İntizar», Mehdi Hüseyn və İlyas Əfəndiyev), Gülyaz («Qız qalası», Rza Şahvələd), Marfa («Özgə uşağı», Vasili Şkvarkin), Jenya («Vətən oğlu», Konstantin Simonov), Qız («Fərhad və Şirin», Səməd Vurğun), Gülərüz («Gözün aydın», dramaturq Məhərrəm Əlizadə və bəstəkar Fikrət Əmirov).

Sədayə Mustafayeva «Azərbaycanfilm» kinostudiyasında istehsal olunmuş «Mehman» («Qanun naminə», Xatın), «İki körpü» (Əsmər), «Mən ki gözəl deyildim» (Gözəl), «Şərikli çörək» (Şamama), «Var olun, qızlar» (Rüstəmin anası), «Firəngiz» (Məsmə), «Ad günü» (Əlinin anası), «Ölsəm... bağışla» (Yusifin anası), «Həm ziyarət, həm ticarət» (Suğra), «Ağ atlı oğlan» (Mirvari nənə) bədii filmlərinə çəkilib.

Aktrisa 13 avqust 2004-cü ildə Gəncədə vəfat edib.



## Sovqat Səmədova
(16 iyul 1946)

Qızlıq soyadı Əhmədovadır. Tamaşalarda həm Əhmədova, həm də Səmədova soyadları ilə çıxış edib. Sovqat Səfər qızı Səmədova (Əhmədova) 16 iyul 1946-cı ildə Yevlax rayonunun Aşağı bucaq kəndində anadan olub. Orta təhsilini Şəkidəki fəhlə-gənclər məktəbində alıb. Uzun illər Şəki xalq teatrında çalışıb. 28 iyul 1975-ci ildən 15 dekabr 2012-ci ilə kimi Şəki Dövlət Dram Teatrının aktrisası olub.

Aktrisanın Şəki teatrında klassik milli dramaturqlarımızın əsərlərində ifa etdiyi rollar: Tükəz və Teybə xanım, Xanpəri, Zalxa, Pəri xanım («Hacı Qara», «Müsyö Jordan və dərviş Məstəli şah», «Xırs quldurbasan» və «Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə), Ümmü Gülsüm, Şaban nənə («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Xəstə qadın («İblis», Hüseyn Cavid), Səkinə («Bir saat xəlifəlik», Abdulla Şaiq), Böyükxanım («Aydın», Cəfər Cabbarlı), Güllü xala («Yalan», Sabit Rəhman).





Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Nurcahan və Dilşad («Şirinbala bal yığır», Salam Qədirzadə), Xəbərçi Xədicə («Adamın adamı», Anar), Qızyetər («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Aynur («Artıq adam». İkinci adı «Yollara iz düşür», Bəxtiyar Vahabzadə), Rüxsarə («Şəhərin yay günləri», Anar), Zeytunə («Artıq tamah», Məmmədiyyə Yusifzadə), Mahnur, Gülgəz («Bağdada putyovka var» və «Quşu uçan budaqlar», Əkrəm Əylisli), Qarı («Poçt şöbəsində xəyal», Elçin), Züleyxa («Evlərin axşamları», Arif Abdullazadə), Salatın, Dilsuzə («Yaşıl işıq» və «Hökm», Məmməd Şəkili), Müavin, Zəhra xala («Toyda Çelentano oynayır» və «Hərənin bir ulduzu», Əli Səmədli), Xanəndə qadın, Maral, Püstə («Sindibadın xoşbəxtlik adasına səyahəti», «Kəndimizin narları» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Nənə, Elçi qadın («Onun iki qabırğası» və «Bala, başa bəla», Əli Əmirli), Səriyyə («İmzalar içində», Nəriman Həsənzadə), Xavər («Xatalı Kabul», Məmməd Şəkili), Ağbacı («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Bəsirə («Gurultulu məhəbbət», Salam Qədirzadə), Təlatüm («Kələntər hərəkatı», R.Xəlilzadə), Ağıçı Gülbinə («Bankir adaxlı», Tamara Vəliyeva), Məleykə («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin faciə, dram və komediyalarında və tərcümə pyeslərinin tamaşalarında çıxış etdiyi bədii personajlar: Kordeliya («Kral Lir», Uilyam Şekspir), Madlena («Ruhlar», Eduardo de Filippo), Qadın («Artu-

ro Uinin karyerası», Bertolt Brext), Qena («Ustalar», Raço Stoyanov), Kraliça Anna və Dayə («Napoleon», Ferdinand Brukner), Pakizə («Bayramın birinci günü», Nazim Hikmət), Ebeya («Teymurləng», Kristafor Marlo), Zəritə («Arvadımın əri», Georgi Xuqayev), Yaşlı qadın («Ay tutulan gecə», Mustay Kərim), Xidmətçi («Oyuncaq ev», Henrik İbsen), Coy («Bahalı oğlan», Sergey Mixalkov), Mironixa («Halallıq», Valentin Rasputin).

Sovqat Səmədova hazırda Bakıda Uşaq teatrında işləyir.



## İbrahim Əliyev
(10 iyul 1949)

Obraza ilk növbədə təfəkkür qənaətləri ilə yanaşan aktyordur.

Emosional duyğularını da psixoloji dərinliklə idrak süzgəcindən keçirir.





Onun ciddi yumorunda dərin sarkazm və kəskin ironiya elementləri güclüdür.

Pauzalarla oynamaqda son dərəcə bacarıqlıdır.

Səhnə plastikasında emosional cazibədarlıq var.

İbrahim Əsgər oğlu Əliyev 10 iyul 1949-cu ildə Bakıda doğulub. 1967-ci ildə Bakıdakı 190 saylı orta məktəbi bitirib. 1963-cü ildən Fioletov adına klubun dram dərnəyində həvəskar aktyor kimi çalışıb (rəhbər Xalq artisti Tofiq İsmayılov). 1967 – 1971-ci illərdə hərbi xidmətdə olub, iki il «Azərnəşr»də qəbulçu işləyib. 1971 – 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Kurs rəhbəri SSRİ xalq artisti Mehdi Məmmədov olub.

1975 – 1990-cı illərdə Şəki Dövlət Dram Teatrının truppasında aktyor işləyib. 1990 – 1995-ci illərdə paralel olaraq Dövlət Gənclər Teatrında, Gənc Tamaşaçılar Teatrında, «İlham» Miniatür teatrında aktyorluq edib. İbrahim Əliyev 1995-ci ildən sənətdən ayrılıb.

Aktyorun Şəki Dövlət Dram Teatrında milli klassik dramaturqlarımızın əsərlərində ifa etdiyi rollar: Teymur ağa, Bayram, Müsyö Jordan, Əsgər bəy («Lənkəran xanının vəziri», «Xırs quldurbasan», «Müsyö Jordan və dərviş Məstəli şah» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Molla və Qazı («Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Novruz bəy («Aydın», Cəfər Cabbarlı), Malik ibn Səid («Bir saat xəlifəlik», Abdulla Şaiq),

Şakro («Knyaz», Hüseyn Cavid), Sadıq, Aslan, Hüseyn («Xoşbəxtlər», «Yalan» və «Aşnalar», Sabit Rəhman).

Şəki teatrında Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Lağlağı, Fənd Fərəc («Sizi deyib gəlmişəm» və «Adamın adamı», Anar), Şahmar («Əks-səda», Nəbi Xəzri), İbn Tahir, Səlim («Dar ağacı» və «Artıq adam», Bəxtiyar Vahabzadə), Qürbət Əzizov («Bağdada putyovka var», Əkrəm Əylisli), Qiyas Zeynallı («Şəhərin yay günləri», Anar), Qədir («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Kələntər («Uca dağ başında», Vaqif Səmədoğlu), Əşrəf («Evlərin axşamları», Arif Abdullazadə), Şər («Hərənin bir ulduzu», Əli Səmədli), Cəlal («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Kor Akif, Atabala, Cəfər («Kəndimizin narları», «Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Elcan («Ömrün sorağında», Nahid Hacıyev), Hüseyn («Bəxt üzüyü», Vaqif Səmədoğlu), Davud («İkimərtəbəli adam», Fikrət Qoca), Nurulla («Axşam dərsi», Ramiz Rövşən), Şıxlınski («İmzalar içində», Nəriman Həsənzadə), Səfər («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Kamal («Xatalı Kabul», Məmməd Şəkili), Böyükağa («Tilsimli dairə», Eldəniz Quliyev), Mərdanlı («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Edmund, Romeo («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Boriç («Pələng və kaftar», Şandor Petefi), Kəndli («Adsız ulduz», Mixail Sebastian), Professor Şlatter («Meteor», Fridrix Dürrenmatt), Arturo Ui («Arturo Uinin karyerası», Bertolt Brext), Şivko («Ustalar», Raço Stoyanov), Teridam və Hitler («Teymurləng», Kristafor Marlo), Doktor Qalel («Ağ xəstəlik», Karl Çapek).





Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Elbrus («Arvadımın əri», Georgi Xuqayev), Andro («Çinari manifesti», Aleksandr Çxeidze), Qriqoryev («Lunin və Jakın ölümü», Edvard Radzinski), Jora Timoxin («Bahalı oğlan», Sergey Mixalkov), İlya («Halallıq», Valentin Rasputin), Dərrakəli («Avtobus», Stanislav Stratiyev), Dərviş («Dərviş və ölüm», Meşa Səlimoviç), İvan Bezdomnı («Ustad və Marqarita», Mixail Bulqakov).

«Əmək və Qızılgül» (Uşaq Mahmud), «Qətl günü» (Hökmdar), «Güllələnmə təxirə salınır» («Eynəkli») bədii filmlərinə çəkilib.

İbrahim Əliyev Şəki teatrında yaradıcılığı intellektə əsaslanan güclü aktyor olub. Onun yaradıcılığının bu keyfiyyəti xüsusilə «Teymurləng», «Meteor», «Ağ xəstəlik» kimi fəlsəfi-psixoloji tərcümə əsərlərinin tamaşalarında daha qabarıq nəzərə çarpır.

Aktyor Romeo kimi lirik faciə qəhrəmanlarını ifa edəndə də obrazın mayasına həssaslıqla fəlsəfi çalar qata bilirdi.

Onun üçün janr çətinliyi yoxdur. İstənilən janrda, üslub-formada, ən mürəkkəb mövzularda cəsarətlə çıxış edir. Janrın estetikasını, üslubların poetika səciyyələrini peşəkarlıqla mənimsəyib.

Çılğın romantik rollarda realizm çalarlarını yumşaq, ifadəli realizmlə canlandırır.

Daxilən çox çevikdir. Amma və di gəl ki, bu çevikliyi bütün məqamlarda idraki qənaətlə idarə edə bilir.

Coşqun daxili ehtirasında, sərhədsiz görünən çılğınlığında cazibəli ölçü həddi var. Hansısa rola, hətta ictimai-sosial faciəyədək bədii personajın ifasında da əndazəni keçmir.

İbrahim Əliyev əksər tamaşalarda oynadığı rolun müəllifi olmaq hüququnu yüksək peşəkarlıqla təsdiqləyib.



## Aydın Əlibalayev
(9 iyul 1950)

Xüsusi aktyor təhsili görməsə də, bu sənətdə fitri istedadı var.

Müxtəlif janrlı tamaşalarda bir-birindən fərqli rollar oynayıb.





İfa etdiyi obrazlar üçün ifadəli ştrixlər tapa bilir.

Aydın Niyazi oğlu Əlibalayev 9 iyul 1950-ci ildə Şəki rayonunun Qoxmuq kəndində anadan olub. 1957 – 1967-ci illərdə kənd orta məktəbində oxuyub. Hərbi xidmətdən qayıtdıqdan sonra Şəki Pedaqoji Məktəbinin idman müəllimi şöbəsində təhsil alıb (1971 – 1973). 1973-cü ildən 1976-cı ilə kimi rayon mədəniyyət şöbəsində rəqs dərnəyinin rəhbəri işləyib. 1976-cı ilin ilk günlərindən Şəki Dövlət Dram Teatrının truppasındadır.

Aktyorun milli klassik dramaturqlarımızın əsərlərində ifa etdiyi rollar: Mirzə Fətəli Axundzadənin komediyalarında Naçalnik və Murov («Hacı Qara»), Qulaməli («Müsyö Jordan və dərviş Məstəli şah»), Hacı Kərim («Molla İbrahimxəlil kimyagər»), Namaz («Xırs quldurbasan»), Ağa Bəşir («Lənkəran xanının vəziri»), həmçinin Hacı Salman («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Rəhim və Dərviş («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Hacı Xudaverdi və Hacı Mədinə, Kərbəlayı Mirzalı və Kərbəlayı İmamqulu («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Salamon, İbn Yəmin («Knyaz» və «İblis», Hüseyn Cavid), Qulam («Aydın», Cəfər Cabbarlı), Vəzir («Bir saat xəlifəlik», Abdulla Şaiq), Şirəli, Fərman («Toy» və «Yalan», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Murtuz, Əjdər, Molla Nəsrəddin («Təhminə və Zaur», «Şəhərin yay günləri» və «Sizi deyib gəlmişəm», Anar),

Milis serjantı, Şənbə xanımın əri («Bəxt üzüyü» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Səməd Vurğun («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Vartan («İkimərtəbəli adam», Fikrət Qoca), Tufan («Əks-səda», Nəbi Xəzri), İbn Süheyl, Hüquqçu, Səlim («Dar ağacı», «Cəzasız günah» və «Artıq adam», Bəxtiyar Vahabzadə), Qeybulla, Balkondakı kişi («Quşu uçan budaqlar və «Bağdada putyovka var», Əkrəm Əylisli), Milis kapitanı («Artıq tamah», Məmmədiyyə Yusifzadə), Yalçın («Evlərin axşamları», Arif Abdullazadə), Orxan Talıbxanov («Hökm», Məmməd Şəkili), Məmməd, Ovsunçu, Çingiz («Kəndimizin narları», «Sindibadın xoşbəxtlik adasına səyahəti» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Çilingər («Şirəbənzər», Rüstəm İbrahimbəyov), Mirzə Dədə, Elçi kişi («Onun iki qabırğası» və «Bala, başa bəla», Əli Əmirli), Afşar Hüseyn («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Qəhrəman («İmzalar içində», Nəriman Həsənzadə), Fəhlə məhbus («Günəş küləyi», Ramiz Heydər), Nəcəf bəy («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Muxtar («Gurultulu məhəbbət», Salam Qədirzadə), Sərkərdə, Səlim kişi («Hərənin bir ulduzu» və «Toyda Çelentano oynayır», Əli Səmədli), Qədimalı («Buna da... şükür», Novruz Cəfərov), Salahov («Məni qınamayın», Hidayət), Rafiq («Tilsimli dairə», Eldəniz Quliyev), Kələntər («Kələntər hərəkatı», R.Xəlilzadə), Atakişi Böyükkişiyeviç («Bankir adaxlı», Tamara Vəliyeva), Əli («Körpü», İsi Məlikzadə), Orxan Talıbxanov («İstintaq başlanır», Məmməd Çələbiyev).





Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Qraf Kent, Hersoq Eskal («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Severio («Ruhlar», Eduardo de Filippo), Şaban («Bayramın birinci günü», Nazim Hikmət), Usta Nikola («Ustalar», Raço Stoyanov), Təlxək və Boriç («Pələng və kaftar», Şandor Petefi), Malberli («Arturo Uinin karyerası», Bertolt Brext), Komissar («Ağ xəstəlik», Karl Çapek), Cənab Sotanvil, Anselm («Aldadılmış ər» və «Xəsis», Jan Batist Molyer), Həkim Rank («Oyuncaq ev», Henrik İbsen), İeozef Bonopart («Napoleon», Ferdinand Brukner), Meandr və Almeda («Teymurləng», Kristafor Marlo), Qriq («Adsız ulduz», Mixail Sebastian).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Keşiş («Tələ», Rober Toma), Albadam, Kazbek («Elbrus evlənir» və «Arvadımın əri», Georgi Xuqayev), Katib («Lunin və Jakın ölümü», Edvard Radzinski), Platon («Çinari manifesti», Aleksandr Çxeidze), Birinci ağsaqqal və İkinci ağsaqqal («Ay tutulan gecə», Mustay Kərim), İlya («Halallıq», Valentin Rasputin), Leytenant Tansıxbayev («Əsrə bərabər gün», Çingiz Aytmatov), Az cavabdeh («Kürən yabı», İon Drutse), Z («Çox gülməli faciə», Əziz Nesin), Müsəllim («Dərviş və ölüm», Meşa Səlimoviç), Kaifa («Ustad və Marqarita», Mixail Bulqakov), Molla Nəsrəddin, Rəhim bəy («Molla Nəsrəddinin sərgüzəştləri» və «Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Viktoviç).



## Akif Yusifov
(3 sentyabr 1950)

Qırx ilə yaxındır Şəki Dövlət Dram Teatrının truppasında aktyorluq edir.

Yaradıcılığı müxtəlif xarakterli səhnə obrazlarının yaddaqalan ifası ilə maraq doğurur.

Koloritli və realist teatr məktəbinin prinsiplərinə yaradıcılıqla yanaşan aktyordur.

Akif Əli oğlu Yusifov 8 iyul 1948-ci ildə Qax rayonunun Almalı kəndində anadan olub. Orta məktəbi kənddə qurtarıb. 1969 – 1971-ci illərdə hərbi xidmətdə olub. 1972 – 1976-cı illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Şəki teatrının kollektivinə 10 iyul 1977-ci ildə qəbul olunub.

Aktyorun milli klassik dramaturqlarımızın əsərlərində ifa etdiyi rollar: Mirzə Fətəli Axundzadənin komediyalarında Dərviş Abbas («Molla İbrahimxəlil kimyagər»), Murov («Hacı Qara»), Qədir bəy («Lənkəran xanının





vəziri»), Oruc Nəsiboğlu («Xırs quldurbasan»), həmçinin Xudaverdi bəy («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Çoban («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Hacı Məhəmmədəli və Hacı Əbdüləzim, Qasım kişi («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Xəfiyyə, Elxan («Knyaz» və «İblis», Hüseyn Cavid), Surxay, Zəki, Gülümov («Toy», «Yalan» və «Aşnalar», Sabit Rəhman), Faxir («Bir saat xəlifəlik», Abdulla Şaiq).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Qoşqar, Dəli Domrul, Daşqın («Cəzasız günah», «Dar ağacı» və «Artıq adam», Bəxtiyar Vahabzadə), Balkondakı kişi («Bağdada putyovka var», Əkrəm Əylisli), Rasim («Şəhərin yay günləri», Anar), Şahrul («Artıq tamah», Məmmədiyyə Yusifzadə), Skripkaçı («Poçt şöbəsində xəyal», Elçin), Sindibad, Kərim, Tofiq, Fikrət («Sindibadın xoşbəxtlik adasına səyahəti», «Doğmalar», «Kəndimizin narları» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Dəniz («Evlərin axşamları», Arif Abdullazadə), Polismeyster, Təlxək («Toyda Çelentano oynayır» və «Hərənin bir ulduzu», Əli Səmədli), Bahadur, Tanrıbəy («Yayda qartopu oyunu» və «Bəxt üzüyü», Vaqif Səmədoğlu), Şair Şükür («Axşam dərsi», Ramiz Rövşən), Ata, Səyyad («Bala, başa bəla» və «Onun iki qabırğası», Əli Əmirli), Səlim Babayev («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Azad («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Şaumyan («İmza-

lar içində», Nəriman Həsənzadə), Əsalı zənci («Günəş küləyi», Ramiz Heydər), Polad («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Dadaş («Gurultulu məhəbbət», Salam Qədirzadə), Polis, Sahə müvəkkili («Buna da... şükür» və «Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Redaktor («Məni qınamayın», Hidayət), Mirzağa («Tilsimli dairə», Eldəniz Quliyev), Sərdar («Yaşıl işıq», Məmməd Şəkili), Azay («Körpü», İsi Məlikzadə), Şahin («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin facié, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Baltazar («Romeo və Cülyetta», Uilyam Şekspir), Cənab Sotanvil, Jak («Aldadılmış ər», yaxud «Jorj Danden» və «Xəsis», Jan Batist Molyer), Fleyk («Arturo Uinin karyerası», Bertolt Brext), Marşal («Napoleon», Ferdinand Brukner), Doktor («Bayramın birinci günü», Nazim Hikmət), Qastone («Ruhlar», Eduardo de Filippo), Təbliğat naziri («Ağ xəstəlik», Karl Çapek), Qoca («Xoşbəxt hadisə», Slavomir Mrojek), Ortiqiy və Orxan («Teymurləng», Kristafor Marlo), Həkim Rank («Oyuncaq ev», Henrik İbsen), Don Xulian («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Birinci usta («Ustalar», Raço Stoyanov).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Qabrile, Bulat («Çiy yumurta, bişmiş məhəbbət» və «Arvadımın əri», Georgi Xuqayev), İkinci mundir («Lunin və Jakın ölümü», Edvard Radzinski), Andro («Çinari manifesti», Aleksandr Çxeidze), A, Polis





(«Çox gülməli faciə» və «Sən Qara deyilsən», Əziz Nesin), Yalsıqul və Rısqul bəy («Ay tutulan gecə», Mustay Kərim), Raul («Bahalı oğlan», Sergey Mixalkov), Edilbay («Əsrə bərabər gün», Çingiz Aytmatov), Birinci polis («Dərviş və ölüm», Meşa Səlimoviç), Afrani («Ustad və Marqarita», Mixail Bulqakov), Cəllad («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Niyaz, Ağabəy («Salam, Molla Nəsrəddin!» və «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).

## Rafiq Yunusov
(11.7.1951 – 25.6.1997)



Təbiətən koloritli insan idi. Ruhunda şəkililərə məxsus incə yumor vardı.

Komik rollarda milli karnaval estetikasının prinsiplərindən bacarıqla bəhrələnirdi.

Səhnədə ifadəli oyunu və şirin yapışıqlığı ilə rəğbət qazanmışdı.

Müəyyən rəmzi obrazlarda hiperboladan və qroteskdən məharətlə istifadə edirdi.

Rafiq Məhərrəm oğlu Yunusov 11 iyul 1951-ci ildə Şəkidə anadan olub. Şəkidəki 3 saylı orta məktəbi 1968-ci ildə bitirib. 8-ci sinifdən səhnəyə maraq göstərib. Şəki xalq teatrının fəal üzvlərindən olub. Bu kollektivdə xeyli rol oynayıb və özünə pərəstişkar qazana bilib. Bir müddət Mərziyə Davudova adına Mingəçevir Dövlət Dram Teatrında işləyib. 1970 – 1972-ci illərdə hərbi xidmətdə olub. Şəki Dövlət Dram Teatrı bərpa olunandan sonra, 16 iyul 1975-ci ildə həvəskar aktyor sənət ocağının truppasına qəbul edilib. Ömrünün sonuna kimi bu kollektivdə çalışıb.

Rafiq Yunusovun klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Mirzə Fətəli Axundzadənin komediyalarında Hatəmxan ağa («Müsyö Jordan və dərviş Məstəli şah»), Hacı Qara («Hacı Qara»), Nəcəf («Xırs quldurbasan»), Xan («Lənkəran xanının vəziri»), həmçinin Pirverdi bəy və Mirzə Məmmədqulu, Farmasyon Rüstəm («Danabaş kəndinin məktəbi» və «Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Salamon («Knyaz», Hüseyn Cavid), Balaxan («Aydın», Cəfər Cabbarlı), Harun ər-Rəşid («Bir saat xəlifəlik», Abdulla Şaiq), Bərbərzadə, Qurban Qurbanov, Dəmirçi Musa, Saleh («Xoşbəxtlər», «Aşnalar», «Toy» və «Yalan», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Əhməd Biqəm, Şamxal Bədirzadə, Məmmədhəsən əmi («Adamın adamı», «Şəhərin yay günləri» və «Sizi deyib gəlmişəm», Anar), Əşrəf Bərkdəmirov («Şirinbala bal yığır», Salam Qədirzadə), Məğrur («Əks-səda», Nəbi Xəzri), Ozan, Loğmanlı («Dar ağacı» və «Artıq adam», Bəxtiyar Vahabzadə), Rövşən bəy («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Muradov və Piri («Artıq tamah», Məmmədiyyə Yusifzadə), Yekəpər kişi, Nəbi, Səməndər («Bağdada putyovka var», «Vəzifə» və «Quşu uçan budaqlar», Əkrəm Əylisli), Xəlil («Poçt şöbəsində xəyal», Elçin), Doktor İmanov, Moşu, Quqqulu müəllim («Yayda qartopu oyunu», «Bəxt üzüyü» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Hikmət («Evlərin axşamları», Arif Abdullazadə), Mərdanlı («Hökm», Məmməd Şəkili), Qubad kişi («Hərənin bir ulduzu», Əli Səmədli), Hacıverdi, Əbülfəz, Qeybulla («Kəndimizin narları», «Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Həmkar («İstintaq», Rüstəm İbrahimbəyov), Nəriman Nərimanov («İmzalar içində», Nəriman Həsənzadə), Zənci («Günəş küləyi», Ramiz Heydər), Mir Əhədulla («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Nadir şah («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Muxtar («Gurultulu məhəbbət», Salam Qədirzadə), Ata («Dəli Domrul», Altay Məmmədov), Abbas kişi («Toyda Çelentano oynayır», Əli Səmədli),

Mirəli kişi («Tilsimli dairə», Eldəniz Quliyev), Sərxan («Körpü», İsi Məlikzadə), Mərdanlı və Orxan Talıbxanov («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Hersoq Albani, Lorenso («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Qlauzer («Meteor», Fridrix Dürrenmatt), Usta Dobri («Ustalar», Raço Stoyanov), Vağzal naçalniki («Adsız ulduz», Mixail Sebastian), Ata Doqsboro («Arturo Uinin karyerası», Bertolt Brext), Uzun Həsən («Teymurləng», Kristafor Marlo), Ata («Ağ xəstəlik», Karl Çapek), Şamşon («Pələng və kaftar», Şandor Petefi).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Fyodor Balyasnikov («Bir insan ömrü» və yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), Hökmdarın mundiri («Lunin və Jakın ölümü», Edvard Radzinski), Dərviş («Ay tutulan gecə», Mustay Kərim), Polis, X, Nuru Sayaner («Sən Qara deyilsən», «Çox gülməli faciə» və «Toros canavarı», Əziz Nesin), Əmir («Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Viktoviç), Mak Donnel («Bahalı oğlan», Sergey Mixalkov), Mixail («Halallıq», Valentin Rasputin), Baş rəhbər («Əsrə bərabər gün», Çingiz Aytmatov), Qoca («Avtobus», Stanislav Stratiyev), Çafe («Kürən yabı», İon Drutse), Müfti («Dərviş və ölüm», Meşa Səlimoviç), Berlioz («Ustad və Marqarita», Mixail Bulqakov).





Rafiq Yunusovun ifasında güclü təbiilik vardı. Bu təbiilik Şəki bölgəsinə xas olan fövqəladə yumor duyğusu ilə cilalanmışdı. Onun komediya rolları ifadəli cazibə gücünə malik idi.

Aktyorun ifadə vasitələrində millilik nə qədər güclü olsa da, o bunu digər xalqların gülüş mədəniyyətinin ruhu ilə uzlaşdırmağı bacarırdı.

Aktyorun təbiətən coşqunluğu onun rollarının ifasında da özünü göstərirdi. Rafiqin obrazlarına süstlük, ləngllik yad idi, aktyor enerjili, dinamik ruhlu oyunu ilə adi personaja da tipik səciyyələr aşılayırdı.

Rafiq Yunusov oynadığı komediya rollarının tipik xarakterini ilk növbədə danışıq tərzində canlandırmağa daha çox səy göstərirdi.

Aktyorun dramatik obrazlarında həmişə psixoloji ovqatın müəyyən estetik ölçüsü, poetik həddi olurdu.

Yaradıcılığı sırf teatrla bağlı olan sənətkar «Həm ziyarət, həm ticarət» (Qonşu) bədii filmində epizod rola çəkilib.

Cəfakeş aktyor dünyasını dəyişənə kimi bu kollektivdə çalışıb.

Rafiq Yunusov 26 iyun 1997-ci ildə Şəkidə vəfat edib.



## Əligüşad Rəhimov
(18.7.1951 - 1.11.2012)

Bərpadan sonra Şəki Dövlət Dram Teatrında fasiləsiz çalışan aktyorlardandır. Əsasən tipik-xarakterik rollar oynayıb.

Uzun illər aktyorluq fəaliyyəti göstərməklə yanaşı, həm də teatrın truppa müdiri işləyib.

Əligüşad Əjdər oğlu Rəhimov 18 iyul 1951-ci ildə Lerik rayonunun Hoveri kəndində anadan olub. Uşaq vaxtı ailəsi Biləsuvar kəndinə köçüb. Burada 1968-ci ildə Nizami adına orta məktəbi bitirib. Bir il rayondakı «Məhsul» qəzetində işləyib. 1969-cu ildə Azərbaycan Dövlət Universitetinin jurnalistika fakültəsinə daxil olub və birinci kursdan təhsilini yarımçıq qoyaraq Biləsuvar rayon radio qovşağında baş redaktor olub. 1971 - 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. 1975-ci ilin iyun ayında Şəki Dövlət Dram Teatrında aktyorluq fəaliyyətinə başlayıb.





Əligüşad Rəhimovun klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Mirzə Fətəli Axundzadənin komediyalarında Qulaməli («Müsyö Jordan və dərviş Məstəli şah»), Məşədi Cabbar («Molla İbrahimxəlil kimyagər»), Ohan («Hacı Qara»), Əziz ağa («Lənkəran xanının vəziri»), həmçinin Molla Səfi («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Təlxək əcinnə («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Hacı Naib, Uçitel («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Keşiş («İblis», Hüseyn Cavid), Mirzə Cavad («Aydın», Cəfər Cabbarlı), Gülümov, Usta Segah («Aşnalar» və «Xoşbəxtlər», Sabit Rəhman), Əbu Məsud («Bir saat xəlifəlik», Abdulla Şaiq).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Zaman («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Məzyar, Şair, Nüsrət, («Dar ağacı», «Cəzasız günah» və «Artıq adam», Bəxtiyar Vahabzadə), Mahmud kişi («İkimərtəbəli adam», Fikrət Qoca), Usta Fərəməz («Axşam dərsi», Ramiz Rövşən), Professor («Onun iki qabırğası», Əli Əmirli), Firuz («Şəhərin yay günləri», Anar), Umud Qeybulla («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Yoldaş tək («Poçt şöbəsində xəyal», Elçin), Fərzəli, Kələntər («Yayda qartopu oyunu» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Bəbir («Evlərin axşamları», Arif Abdullazadə), Birinci əyan («Hərənin bir ulduzu», Əli

Səmədli), Dəniz ifriti, Amil, Dadaşbala («Sindibadın xoşbəxtlik adasına səyahəti», «Kəndimizin narları» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Nəsib bəy («İmzalar içində», Nəriman Həsənzadə), Naməlum adam («Günəş küləyi», Ramiz Heydər), Atabala («Xatalı Kabul», Məmməd Şəkili), Məruzəçi («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Birinci sərbaz («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Şişman («Dəli Domrul», Altay Məmmədov), Vəli Qurbanoviç («Məni qınamayın», Hidayət), Salman müəllim («Tilsimli dairə», Eldəniz Quliyev), Dilənçi padşahı («Bankir adaxlı», Tamara Vəliyeva), Yuxarıdan gələn adam («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Montekki («Romeo və Cülyetta», Uilyam Şekspir), Komissar («Xəsis», Jan Batist Molyer), Fridli («Meteor», Fridrix Dürrenmatt), Severio («Ruhlar», Eduardo de Filippo), Fuqis («Napoleon», Ferdinand Brukner), Polis komissarı («Bayramın birinci günü», Nazim Hikmət), İvan («Ustalar», Raço Stoyanov), Ted Reqq və Hakim («Arturo Uinin karyerası», Bertolt Brext), Jurnalist («Ağ xəstəlik», Karl Çapek), Miket, Paşa və Tranezun şahı («Teymurləng», Kristafor Marlo), Pasku («Adsız ulduz», Mixail Sebastian).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Birinci mujik («Lunin və Jakın ölümü», Edvard Radzinski), Kazbek («Arvadımın əri», Georgi Xuqayev), Mayor Avara («Tələ», Rober Toma),





Xəfiyyə («Sən Qara deyilsən», Əziz Nesin), Qalaktion («Çinari manifesti», Aleksandr Çxeidze), Üçüncü ağsaqqal («Ay tutulan gecə», Mustay Kərim), Makintoj («Bahalı oğlan», Sergey Mixalkov), Stepan Karçevnikov («Halallıq», Valentin Rasputin), Çox cavabdeh («Kürən yabı», İon Drutse), Qazı («Dərviş və ölüm», Meşa Səlimoviç), Həkim («Ustad və Marqarita», Mixail Bulqakov), Hüseyn Hüsliyə, Qazı («Salam, Molla Nəsrəddin!» və «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).

Əligüşad Rəhimov 1 noyabr 2012-ci ildə Şəkidə vəfat edib.

## Ağarəfi Rəhimov
(9.5.1952 – 25.10.2005)



Maraqlı və koloritli aktyor Ağarəfi Hacıbala oğlu Rəhimov 9 may 1952-ci ildə Bakıda doğulub. Səhnə fəaliyyətinə 182 saylı orta məktəbin dram

dərnəyində başlayıb. 1972 – 1976-cı illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Kurs rəhbəri xalq artisti Rza Təhmasib olub.

Bərpadan sonra fəaliyyət göstərən Şəki Dövlət Dram Teatrının ilk aktyorlarındandır. 1976 – 1977-ci illərdə Şəki Dövlət Dram Teatrında, 1977 – 1988 və 1996 – 2005-ci illərdə Azərbaycan Dövlət Musiqili Komediya Teatrında, 1988 – 1996-cı illərdə «Tənqid və Təbliğ» Bakı Bələdiyyə teatrında işləmişdir.

Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Naçalnik («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Dövlət bəy («Aydın», Cəfər Cabbarlı), Mirpaşa («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Malik ibn Səid («Bir saat xəlifəlik», Abdulla Şaiq), Şirinbala («Şirinbala bal yığır», Salam Qədirzadə), İbiş İbişli («Adamın adamı», Anar), Zəfər («Əks-səda», Nəbi Xəzri), Polis rəisi («İmzalar içində», Nəriman Həsənzadə).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Qraf Qloster («Kral Lir», Uilyam Şekspir), Xristofor Bloxin («Bir insan ömrü» və yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov).

Ağarəfi Rəhimov «Birisigün gecə yarısı» (Kişi), «Üzeyir ömrü» (Köməkçi), «Evlənmək istəyirəm» (Rəis), «İşarəni dənizdən gözləyin» (Küçədəki adam), «Özgə ömür» (İnstitut işçisi), «Qətl günü» (İclasçı), «Şirbalanın məhəbbəti» (Baloğlan), «Yük» (Qumarbaz) bədii filmlərinə çəkilib.

Aktyor 25 oktyabr 2005-ci ildə Bakıda ürək tutmasından qəflətən vəfat edib.





## Gülşad Baxşıyeva
(12 dekabr 1952)



Dinamik səhnə çevikliyi, coşqun daxili ehtirası var. Satirik və ironik ifadə elementlərindən bacarıqla istifadə edir.

Yüksək texnikaya malikdir, yaradıcılığı janr əlvanlığı ilə seçilir.

Səhnədə çox çevikdir və ifadəli plastikasının emosional cazibəsi var.

Gülşad Eynulla qızı Baxşıyeva 12 dekabr 1952-ci ildə Bakıda doğulub. Səhnəyə ilk dəfə 15 yaşında dram dərnəyində çıxıb. 1971 – 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram

və kino aktyorluğu fakültəsində təhsil alıb. Şəki Dövlət Dram Teatrının truppasında yaradıcılıq fəaliyyəti göstərib (1975 – 1985). 1981-ci ildə Predslava («Pələng və kaftar», Şandor Petefi) roluna görə macar dramaturqlarının tamaşa festivalında qadın rolunun ən yaxşı ifaçısı mükafatına layiq görülüb. 1985-ci ildən Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində rejissor və aktyor sənəti kafedrasında pedaqoji fəaliyyət göstərir. Eyni zamanda, Bakının müxtəlif teatrlarında dəvətlə maraqlı rollar oynayıb.

İstedadlı aktrisa Gülşad Baxşıyeva 1 dekabr 1982-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Şəki teatrında milli klassik dramaturqlarımızın əsərlərində ifa etdiyi rollar: Ziba xanım, Sona («Lənkəran xanının vəziri» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Ana («Kamança», Cəlil Məmmədquluzadə), Sevil, Gültəkin («Sevil» və «Aydın», Cəfər Cabbarlı), Firuzə, Tərlan xanım, Bənövşə («Aşnalar», «Yalan» və «Nişanlı qız», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Gülcamal («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Zərifə («Əks-səda», Nəbi Xəzri), Səltənət, Nazlı («Quşu uçan budaqlar» və «Vəzifə», Əkrəm Əylisli), At Balaxanım, Zeynəb («Adamın adamı» və «Sizi deyib gəlmişəm», Anar), Söylü, Şənbə xanım («Bəxt üzüyü» və «Uca dağ





başında», Vaqif Səmədoğlu), Dilşad («Şirinbala bal yığır», Salam Qədirzadə), Göyərçin («Artıq adam», yaxud «Yollara iz düşür», Bəxtiyar Vahabzadə), Fatma («Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Səriyyə («İmzalar içində», Nəriman Həsənzadə), Aypara («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Dilsuzə («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Qonerilya, Dayə («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Kleya («Ezop», Gilerma Fiqeyredo), Vasilisa («Həyatın dibində», Maksim Qorki), Ana («Ağ xəstəlik», Karl Çapek), Madmazel Kuku («Adsız ulduz», Mixail Sebastian), Arina Panteleyevna («Evlənmə», Nikolay Qoqol), Predslava («Pələng və kaftar», Şandor Petefi), Zenokrata («Teymurləng», Kristafor Marlo), Dokdeyzi («Arturo Uinin karyerası», Bertolt Brext).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Anna qarı («Halallıq», Valentin Rasputin), Siyen («Ay canım, qadan alım», Əziz Nesin), Farizad («Arvadımın əri», Georgi Xuqayev), Viktoşa («Bir insan ömrü», yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov).

Gülşad Baxşıyeva Bernard Şounun «Kənd elçiliyi» (Qız), Cəlil Məmmədquluzadənin «Kamança» (Ana), Nikolay Qoqolun «Evlənmə» (Aqafya Tixonovna) əsərlərinin televiziya tamaşalarında oynayıb.

«Yalan» (Nisə), «Bəxt üzüyü» (Sara), «Hər şey yaxşılığa doğru» (Əbdülqəninin arvadı), «Milli bomba» (Qız anası), «Bir anın həqiqəti» (Ana), «Özünə oxşa» (Məryəm), «Beşmərtəbəli evin altıncı mərtəbəsi» (Zivər), «Ömürdən uzun gecə» (Təvəkkülün anası), «Günaydın, mələyim!» (Raya), «İstanbul reysi» (Qadın) bədii filmlərinə çəkilib.

Gülşad Baxşıyeva coşqun enerjiyə, çılğın ehtirasa malik aktrisadır. O bu keyfiyyətlərə yiyələnməklə kifayətlənmir, onlardan bacarıqla, hər obrazın dramaturji-psixoloji xarakterinə uyğun tərzdə istifadə edir.

Aktrisa ifa edəcəyi obrazın daxili yükünü, fikir dərinliyini, tamaşanın ali məqsədində daşıdığı mahiyyəti tam dəqiqləşdirir və yalnız bundan sonra istedad enerjisinin bu personaja nə qədər sərf olunacağının ölçü-həddini müəyyənləşdirir. Bu müəyyənləşdirmədə aktrisa heç vaxt yanılmır, nə də meyarı itirmir.

Aktrisanın əsas uğurlarından biri də onunla bağlıdır ki, o oynadığı səhnə personajının enerji nüvəsini çox səlisliklə tapır. Obrazın sürət-ritmi məhz həmin enerjidən məcra alır. Eyni zamanda, bu enerji rolun dramaturji nəbzini, təzyiq yükünü normada saxlayır.

Gülşad xanımın səs diapazonu genişdir, çoxqatlıdır, əlvan çalarlıdır. Aktrisa obrazın xarakterinə uyğun olaraq səsinə müəyyən rəng və seçdiyi rəngin müxtəlif çalarlarını verə bilir. Təbii ki, onun səs dəyişmələri mütləq tamaşanın janrına, obrazın psixoloji mahiyyətinə uyğun olur. Buna görə də Gülşad Baxşıyeva romantik faciədə,





lirik-psixoloji dramda, məişət komediyasında, ictimai-sosial satirada, milli karnaval estetikasına əsaslanan məsxərə və məzhəkələrdə səsini sərbəstliklə işlətməkdə səriştəlidir.

Kövrək, həzin xarakterli psixoloji rolları cazibəli məlahətlə oynayır.

## Novruz Cəfərov

(13 mart 1953)



Yaradıcılığının poetika prinsipləri realist aktyor məktəbinin estetik səciyyələrinə uyğundur.

Şəki teatrının bərpadan sonrakı fəaliyyətini formalaşdıran sənətkarlardan biridir.

Novruz Adil oğlu Cəfərov 13 mart 1953-cü ildə Şəmkir rayonunun Könüllü kəndində doğulub. Yuxarı siniflərdə oxuyanda səhnə sənətinə maraq göstərib. 1971 – 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorlu-

ğu fakültəsində təhsil alıb. 1975 – 1997-ci illərdə Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrında işləyib. 1997-ci ildən Cəfər Cabbarlı adına Gəncə Dövlət Dram Teatrının truppasındadır.

Novruz Cəfərov 25 iyun 2013-cü ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Şəki teatrında klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Kərim, Hacı Salah, Məstəli şah («Xırs quldurbasan», «Lənkəran xanının vəziri» və «Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Molla və Qazı, Şümrəli («Danabaş kəndinin məktəbi» və «Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Bəxtiyar («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı əsəri əsasında), Aydın («Aydın», Cəfər Cabbarlı), Anton, Arif («Knyaz» və «İblis», Hüseyn Cavid), Tacir («Qonşu qonşu olsa, kor qız ərə gedər», Rəşid bəy Əfəndiyev), Şamil, Mirzə Qərənfil, Mirzə Hüseyn, Səməndərli («Yalan», «Xoşbəxtlər», «Toy» və «Aşnalar», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Alxan, İbn Zeyd («Artıq adam», yaxud «Yollara iz düşür» və «Dar ağacı», Bəxtiyar Vahabzadə), Hərdəmxəyal, Fənd Fərəc, Zaur, Ağarəfi («Sizi deyib gəlmişəm», «Adamın adamı», «Təhminə və Zaur» və «Şəhərin yay günləri», Anar), Xəlil («Poçt şöbəsində xəyal», Elçin), Bəhlul Danəndə («Bir saat xəlifəlik», Abdulla Şaiq), Qasım («Artıq tamah», Məmmədiyyə Yusifzadə), Qasım («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Məhəmməd Hadi («İmzalar içində», Nəriman Həsənzadə), Ziyad müəllim, Rasim, Qafar («Yayda qartopu oyunu», «Bəxt üzüyü» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Türmə rəisinin oğlu («Günəş küləyi», Ramiz Heydər), Mehman, Malik («Doğmalar» və «Kəndimizin narları», Rəhman Əlizadə), Dəniz («Evlərin axşamları», Arif Abdullazadə), Manaf («Tilsimli dairə», Eldəniz Quliyev), Müttəhim («İstintaq», Rüstəm İbrahimbəyov), Vartan («İkimərtəbəli adam», Fikrət Qoca), Gülağa («Axşam dərsi», Ramiz Rövşən), Çələbi xan («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Dədə Qorqud («Dəli Domrul», Altay Məmmədov), Şadi, Aşıq Məsim («Əhmədin vəfalı xoruzu» və «Toyda Çelentano oynayır», Əli Səmədli), Ayrım («Şəkili + Ayrım», Novruz Cəfərov), Professor («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Hacı Çələbi xan («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Dadaş («Gurultulu məhəbbət», Salam Qədirzadə), Sərdar («Yaşıl işıq», Məmməd Şəkili), Şəkər («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin facià, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Benvolio («Romeo və Cülyetta», Uilyam Şekspir), Texell («Böyük Teymurləng», Kristofor Marlo), Baron Kryuk («Ağ xəstəlik», Karl Çapek), Cüzeppe Civola («Arturo Uinin karyerası», Bertolt Brext), Bertye («Napoleon», Ferdinand Brukner), Karl

Koppe («Meteor», Fridrix Dürrenmatt), Nayden («Ustalar», Raço Stoyanov), Şaul («Pələng və kaftar», Şandor Petefi), Müəllim («Adsız ulduz», Mixail Sebastian).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Birinci ağsaqqal («Ay tutulan gecə», Mustay Kərim), İsgəndər («Duel», Mar Bayciyev), Ustad («Ustad və Marqarita», Mixail Bulqakov), Kazbek («Arvadımın əri», Georgi Xuqayev), Birinci mundir («Lunin və Jakın ölümü», Edvard Radzinski), Samsov («Çinari manifesti», Aleksandr Çxeidze), Müəllif («Əsrə bərabər gün», Çingiz Aytmatov), A, Ziya Çalaqçı, Qara («Çox gülməli faciə», «Toros canavarı» və «Sən Qara deyilsən», Əziz Nesin), Ər («Avtobus», Stanislav Stratiyev), Surkano («Kürən yabı», İon Drutse), Əbu Əza («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Cek («Bahalı oğlan», Sergey Mixalkov), Mixail («Halallıq», Valentin Rasputin), Qaçqın məhbus («Dərviş və ölüm», Meşa Səlimoviç).

Şəki teatrında Aleksandr Gelmanın «Hamılıqla təklikdə», Əli Səmədlinin «Əhmədin vəfalı xoruzu», özünün «Gecə yarıdan sonra elçilik», «Uşaq oğruları», «Qəribə lisey», Rober Tomanın «Tələ», Əli Əmirlinin «Onun iki qabırğası», Aleksandr Puşkinin «Qaraçılar», Firuz Mustafanın «Tıxac» əsərlərini tamaşaya hazırlayıb.

«Keçəlin cəhənnəmə səfəri», «Uşaq oğruları», «Gecə yarısından sonra elçilik», «Buna da... şükür», «Kədərli zarafat», «Tənbəlin yuxusu», «Qəribə lisey» pyesləri var.





Novruz Cəfərovun yaradıcılıq palitrasında komediya boyaları daha tünd, daha cazibəli və daha effektlidir. Qorteski məişət yumoruna, satiranı məsxərə elementlərinə, hiperbolanı realizm çalarlarına həssaslıqla, fitri istedadla uzlaşdırmaqda zəngin təcrübə qazanıb.

Forma əlvanlığına xüsusi maraq göstərir. Buna görə ilk növbədə obrazın bədii materialına, xarakter cizgilərinə əsaslanan forma tapır. Onun oynadığı səhnə surətlərinin forma və məzmununda həmişə ahəngdar harmoniya olur.

Aktyorun çöhrəsində qəribə cazibə gücü var. Amma və di gəl ki, Novruz heç vaxt bundan yalnız zahiri əlamət kimi istifadə etmir. O, mütləq bu məlahətə hər obrazın xarakterik-tipik cizgilərini əlavə edir.

Əlavə etdiyi vasitələrin mahiyyətini hərəkət plastikasında və danışıq tərzində məharətlə əsaslandırır.

Novruzun cazibəli səhnə plastikası var.

Aktyor yaradıcılığına əlvanlıq gətirən bu vasitədən obrazın forma həllində bacarıqla istifadə edə bilir.



## Çingiz Novruzəliyev
(1 aprel 1954)

Xüsusi aktyor təhsili görməyib, ancaq həssas səhnə duyumu var.

Səhnə sərbəstliyi və çalışqanlığı ilə seçilir.

Çingiz Adışirin oğlu Novruzəliyev 1 aprel 1954-cü ildə Şəkidə anadan olub. Beşinci sinifdən rəqs dərnəyinə gedib. 1971-ci ildə rayondakı 11 saylı orta məktəbi bitirib. Bir müddət istehsalatda çalışıb, iki il hərbi xidmətdə olub. Xalq teatrında, «Zorxana» rəqs qrupunda işləyib. 1980-ci ildən Şəki Dövlət Dram Teatrının truppasındadır. Teatrın nəzdindəki 2 illik aktyorluq kursunda müəyyən nəzəri təcrübə qazanıb.

Aktyorun Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Keçəl, Səfər bəy, Sərkis («Müsyö Jordan və dərviş Məstəli şah», «Molla İbrahimxəlil kimyagər» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), İkinci əcinnə («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Kirvə («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Məşədi Ağakişi və Kərbəlayı Heydər, Hacı Cəfər («Danabaş kəndinin məktəbi» və «Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Zabit («Bala, başa bəla», Əli Əmirli), Hacıqulu («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Riza xan («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Cahangir («Gurultulu məhəbbət», Salam Qədirzadə), Polismeyster («Toyda Çelentano oynayır», Əli Səmədli), Tacir («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Loğman («Cəzasız günah», Bəxtiyar Vahabzadə), Serjant («Tilsimli dairə», Eldəniz Quliyev), Zərgər («Bankir adaxlı», Tamara Vəliyeva), Piri («Körpü», İsi Məlikzadə).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Çapar və Üçüncü ağsaqqal («Ay tutulan gecə», Mustay Kərim), Gözətçi («Toros canavarı», Əziz Nesin), Birinci lakey («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Kuryer («Oyuncaq ev», Henrik İbsen), Kalıkbek («Əsrə bərabər gün», Çingiz Aytmatov), Avazello («Ustad və Marqarita», Mixail Bulqakov), Qarovulbaşı («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Kamil bəy («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).



## Mahirə Əliyeva
(2 fevral 1954)

Dramatik psixoloji obrazların ifasında yüksək peşəkarlıq göstərirdi.

Lirik-romantik xarakterli səhnə obrazları da ifa edib.

Qızlıq soyadı Əmirova olub. Ona görə də afişa və proqramlarda soyadı həm Əmirova, həm də Əliyeva verilib.

İstedadlı aktyor İbrahim Əliyevin həyat yoldaşıdır.

Mahirə Murad qızı Əliyeva (Əmirova) 2 fevral 1954-cü ildə Ucar rayonunun Qarabörk kəndində doğulub. Ailəsi 1960-cı ildə Bakıya köçüb. Burada 44 saylı orta məktəbi 1971-ci ildə bitirib. 1971 – 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Kurs rəhbəri SSRİ xalq artisti Ədil İsgəndərov olub. 1975 – 1990-cı illərdə Şəki Dövlət Dram Teatrının truppasında aktyor işləyib. 1990 – 1995-ci illərdə paralel olaraq Dövlət Gənclər Teatrında və «İlham» Miniatür teatrında aktyorluq edib.





Şəkidə klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Sona («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Şaban nənə («Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Marqo («Knyaz», Hüseyn Cavid), Böyükxanım («Aydın», Cəfər Cabbarlı), Nailə («Bir saat xəlifəlik», Abdulla Şaiq), Gülər, Xumar («Xoşbəxtlər» və «Yalan», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Eyzəngül («Şirinbala bal yığır», Salam Qədirzadə), Rüxsarə, Süsən Sünbül («Şəhərin yay günləri» və «Adamın adamı», Anar), Samirə xanım («Əks-səda», Nəbi Xəzri), Səltənət («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Ədilə («Poçt şöbəsində xəyal», Elçin), Rəna, Zabitə, Rəcibə («Dadaşbala əməliyyatı», «Doğmalar» və «Kəndimizin narları», Rəhman Əlizadə), Mərmər, Sara, Nelli («Yayda qartopu oyunu», «Bəxt üzüyü» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Müstəntiqin arvadı («İstintaq», Rüstəm İbrahimbəyov), Gülcamal («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Nigar xanım («İmzalar içində», Nəriman Həsənzadə), Mehparə («Xatalı Kabul», Məmməd Şəkili), Ceyran («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Bəyim («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Kordeliya («Kral Lir», Uilyam Şekspir), Milkana («Ustalar», Raço Stoyanov), Betti Dofit («Arturo Uinin karyerası», Bertolt Brext),

Xanım Nomzen («Meteor», Fridrix Dürrenmatt), Yudit («Pələng və kaftar», Şandor Petefi).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Zərİtə («Arvadımın əri», Georgi Xuqayev), Viktoşa («Bir insan ömrü» və yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), Ukubala («Əsrə bərabər gün», Çingiz Aytmatov), Odokiya («Kürən yabı», İon Drutse), Qadın («Dərviş və ölüm», Meşa Səlimoviç), Gülbadam («Elbrus evlənir», Georgi Xuqayev).

Mahirə Əliyeva 1995-ci ildən sənətdən ayrılıb.



## Təvəkkül İsmayılov

(9 iyun 1954)

Lirik-psixoloji janrlı tamaşalarda daha şövqlə oynayıb.

İfadə vasitələrində yumşaqlıq və güclü psixoloji çalarlar olub. Səhnə sərbəstliyi və hərəkətlərinin ölçü-biçisi ilə seçilib.





Təvəkkül Nəbi oğlu İsmayılov 9 iyun 1954-cü ildə Qubadlıda doğulub. Uşaq olarkən ailəsi Bakının Qaradağ rayonunun Qızıldaş qəsəbəsinə köçüb. Qəsəbədəki 180 saylı məktəbi bitirib. 1968-ci ildən Qızıldaşdakı dram dərnəyinin üzvü olub. 1972 – 1976-cı illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Sənət müəllimləri xalq artistləri Tofiq Kazımov, Cənnət Səlimova və Elmira Şabanova olublar.

Təvəkkül İsmayılov 1976 – 1982-ci illərdə Şəki Dövlət Dram Teatrında aktyorluq edib. 1982-ci ilin ikinci yarısında Qaradağ rayonu Qızıldaş qəsəbəsində mədəniyyət evinin müdiri işləyib. 1983 – 1993-cü illərdə Cəfər Cabbarlı adına «Azərbaycanfilm» kinostudiyasında çalışıb.

Aktyorun Şəki teatrında Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Vəli Xatınoğlu («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Əli Əyrizadə («Adamın adamı», Anar), Məğrur («Əks-səda», Nəbi Xəzri), Balaxan («Aydın», Cəfər Cabbarlı), Əjdər, Qədir («Vəzifə» və «Quşu uçan budaqlar», Əkrəm Əylisli), Səxavət («Kəndimizin narları», Rəhman Əlizadə), Rayon nümayəndəsi («Uca dağ başında», Vaqif Səmədoğlu), Hikmət («Evlərin axşamları», Arif Abdullazadə), Şah («Hərənin bir ulduzu», Əli Səmədli), Səməndərli («Aşnalar», Sabit Rəhman), Mirzə Məftun («Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Mirqafar («İstintaq başlanır», Məmməd Çələbiyev).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Yoxen («Meteor», Fridrix Dürrenmatt), Emenuele Qiri («Arturo Uinin karyerası», Bertolt Brext), Edqar («Kral Lir», Uilyam Şekspir).

Təvəkkül İsmayılov «Qaçaq Nəbi» (Qaçaq), «İmtahan» (Ağarəfi), «Yalan» (Səfər), «Bəyin oğurlanması» (Alıcı), «Araqarışdıran» (Sürücü), «Cəza» (Baş mühəndis), «Doğma sahillər» (Təvəkkül), «Köhnə bərə» (Sakin), «Qara gölün cəngavərləri» (Quram), «Qəzəlxan» (Mülki geyimli), «Şeytan göz qabağında» (Sürücü), «Şəhərli biçinçilər» (Biçinçi), «Sahilsiz gecə» (Rəqs edən), «Pəncərə» (Burxan) filmlərinə çəkilib.



## Qəmər Məmmədova
(10 sentyabr 1954)

Səhnəyə məktəb yaşlarında çıxıb. Şəki Dövlət Dram Teatrının bərpadan sonrakı fəaliyyətində coşqun yaradıcılıq nümunəsi göstərib.





Lirik-dramatik xarakterli rolları xüsusi məharətlə ifa edir.

Qəmər Məlik qızı Məmmədova 10 sentyabr 1954-cü ildə Bakının Biləcəri qəsəbəsində doğulub. 15 yaşından qəsəbədəki dram dərnəyində çıxışlar edib. 1971 – 1975-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. 1975 - 1979 və 1983 - 2002-ci illərdə Şəki Dövlət Dram Teatrında, 1979 – 1983-cü illərdə İncəsənət İnstitutunun Tədris teatrında, 2002 - 2009-cu illərdə Dövlət Gənclər Teatrında aktrisa işləyib. 2009-cu ildən Gənc Tamaşaçılar Teatrının truppasındadır. 2003-cü ildən Mədəniyyət və İncəsənət Universitetinin kütləvi tədbirlər və rejissorluq kafedrasının müdiridir.

Qəmər Məmmədova 28 oktyabr 2000-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti və 10 dekabr 2013-cü ildə Əməkdar incəsənət xadimi fəxri adları ilə təltif olunub.

Klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Şəhrəbanu, Tükəz («Müsyö Jordan və dərviş Məstəli şah» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Pırpız Sona və Məşədi Zeynəb («Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Gültəkin («Aydın», Cəfər Cabbarlı), Xavər («İblis», Hüseyn Cavid), Münirə («Bir saat xəlifəlik», Abdulla Şaiq), Qəmər, Şəlalə, Maral («Nişanlı qız»,«Yalan» və «Xoşbəxtlər», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Hu-

may («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Dilarə, Nazlı Qəmzəli, Təhminə («Şəhərin yay günləri», «Adamın adamı» və «Təhminə və Zaur», Anar), Adilə xanım, Sevgili («Yayda qartopu oyunu» və «Generalın son əmri», Vaqif Səmədoğlu), Xəyalə («Əks-səda», Nəbi Xəzri), Şəlalə, Eyzəngül («Gurultulu məhəbbət» və «Şirinbala bal yığır», Salam Qədirzadə), Ana, Aynur («Dar ağacı» və «Artıq adam», yaxud «Yollara iz düşür», Bəxtiyar Vahabzadə), Gülsüm («İmzalar içində», Nəriman Həsənzadə), Məsmə («Bağdada putyovka var», Əkrəm Əylisli), Qadın («İstintaq», Rüstəm İbrahimbəyov), Gülzar («Axşam dərsi», Ramiz Rövşən), Maral («Onun iki qabırğası», Əli Əmirli), Gülsüm («İmzalar içində», Nəriman Həsənzadə), Münəvvər («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Banu («Dəli Domrul», Altay Məmmədov), Şirhanə («Toyda Çelentano oynayır», Əli Səmədli), Məsmə xanım («Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Şəms-Qəmər («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Bikə xala («Tilsimli dairə», Eldəniz Quliyev), Nisə («Bankir adaxlı», Tamara Vəliyeva), Tahirə («Yaşıl işıq», Məmməd Şəkili), Sədəf («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Reqana («Kral Lir», Uilyam Şekspir), İlona («Pələng və kaftar», Şandor Petefi), Milkana («Ustalar», Raço Stoyanov), Zəbinə («Böyük Teymur», Karl Marlo), Jozefina («Napoleon», Ferdinand





Brukner), Donya Marianna («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Fəxrəndə («Bayramın birinci günü», Nazim Hikmət).

Əcnəbi ediblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Tanqabikə («Ay tutulan gecə», Mustay Kərim), Mehriban («Toros canavarı», Əziz Nesin), Nazlı («Duel», Mar Bayciyev), Varvara («Halallıq», Valentin Rasputin), Marqarita («Ustad və Marqarita», Mixail Bulqakov), Viktoşa («Bir insan ömrü», yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), Gülbadam, Farizad («Elbrus evlənir» və «Arvadımın əri», Georgi Xuqayev), Qadın («Lunin və Jakın ölümü», Edvard Radzinski), Vardo («Çinari manifesti», Aleksandr Çxeidze), Zərifə («Əsrə bərabər gün», Çingiz Aytmatov), Qadın («Dərviş və ölüm», Meşa Səlimoviç), Əza («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus).

«Azərbaycanfilm» kinostudiyasında istehsal olunmuş «O dünyadan salam» (Zeynəb), «Həm ziyarət, həm ticarət» (Qadın) bədii filmlərinə çəkilib.

Qəmər Məmmədova yaradıcılığının əsas estetik səciyyələri baxımından lirik-psixoloji aktrisadır. Daxili emosional duyğularla oynamaqda təcrübəlidir. Müəyyən mürəkkəb janrlı tamaşalarda bu emosionallığa fəlsəfi dərinlik də əlavə edir.

Dramatik komediya aktrisası kimi də tanınır. Qroteskli və satirik çalarlı bədii personajları daha uğurlu oynayır. Məişət yumorlu tamaşalarda daha çox yumşaq, məzəli gülüş elementlərinə əsaslanır.

Faciə rollarında daxili dramatizmə üstünlük verir.

Ehtirasının coşqunluğunu hadisələrin psixoloji mahiyyətinə uyğun şəkildə gərginlikdə saxlaya bilir.

Obrazın dəhşətli hadisələrlə üzləşdiyi məqamda səsinin faciə ahəngini bacarıqla dəyişir. Belə vəziyyətlərdə səsinin ahəngi ilə daxili gərginliyi, mənəvi-psixoloji dönüşləri vəhdətdə birləşir.



## Fərman Abdullayev

(4.11.1954 – 5.3.2013)

Daxili emosiya ilə oynamaqda xüsusi təcrübəsi vardı.

Faciə və satira elementlərini bir müstəvidə qovuşdurub obrazın ifasına şamil edə bilirdi.

«Şəkili» təxəllüsü ilə də çıxışlar edib.

Fərman Abdulcabbar oğlu Abdullayev 4 noyabr 1954-cü ildə Şəkidə doğulub. Ailə vəziyyəti ilə bağlı 10 saylı məktəbin axşam şöbəsində oxuyub. Rayonda





müxtəlif işlərdə işləyib. 1973-cü ildə xalq teatrının üzvü olub. Şəkidə Dövlət Dram Teatrı 26 illik fasilədən sonra 1975-ci ildə bərpa ediləndə həvəskar aktyor kimi kollektivə daxil olub. Əvvəl-əvvəl epizod rollar oynayıb və eyni zamanda, teatrın nəzdindəki studiyada nəzəri-təcrübi vərdişlərə yiyələnib. 1994-cü ilə kimi Şəki teatrında aktyorluq edib. Bakıda az müddət Dövlət Gənclər Teatrında çalışıb, müxtəlif televiziyalarda verilişlər aparıb.

Aktyorun Şəki teatrında klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Kosa, Xəlil yüzbaşı, Frans Foxt, Vəzir Mirzə Həbib («Müsyö Jordan və dərviş Məstəli şah», «Hacı Qara», «Xırs quldurbasan» və «Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə), Cinni Mustafa, Novruz («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Şakro («Knyaz», Hüseyn Cavid), Səlim («Aydın», Cəfər Cabbarlı), Əbu Məsud («Bir saat xəlifəlik», Abdulla Şaiq), Hüseyn («Aşnalar», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Sabutay («Dar ağacı», Bəxtiyar Vahabzadə), Murad («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Həfçi Məlik («Adamın adamı», Anar), Məğrur və Səfər («Əks-səda», Nəbi Xəzri), Qasım («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Rəcəb («Kəndimizin narları», Rəhman Əlizadə), Adil, Qafar («Yayda qartopu oyunu» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Bəbir («Evlərin axşamları», Arif

Abdullazadə), Ümid, Cəfər («Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Jandarm («İmzalar içində», Nəriman Həsənzadə), Qəlyanlı məhbus («Günəş küləyi», Ramiz Heydər), Musa («Xatalı Kabul», Məmməd Şəkili), Repartyor («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Falçı («Kələntər hərəkatı», R.Xəlilzadə), İkinci milis («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Təlxək, Merkusio («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Ernosto Roma («Arturo Uinin karyerası», Bertolt Brext), Şər («Ustalar», Raço Stoyanov), Teymurləng («Teymurləng», Kristafor Marlo), Oğul («Ağ xəstəlik», Karl Çapek).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Elbrus («Elbrus evlənir» və «Arvadımın əri», Georgi Xuqayev), Lyovuşka («Bir insan ömrü» və yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), Bill («Bahalı oğlan», Sergey Mixalkov), Sabitcan («Əsrə bərabər gün», Çingiz Aytmatov), Həsən («Dərviş və ölüm», Meşa Səlimoviç), İvan Bezdomnı («Ustad və Marqarita», Mixail Bulqakov).

Fərman Abdullayev «Boş yer» (Təbilçi), «Zirzəmi» (Teymur), «Fransız» (Əlibala), «Həm ticarət, həm ziyarət» (Nazim), «Yalan» (Mətiş), «Otel otağı» (Türk ofisiant), «Sarı gəlin» (Samvel), «Günaydın, mələyim!» (Kişi) bədii filmlərinə çəkilib. Pyes və ssenarilər yazıb.

İstedadlı aktyor, ssenarist Fərman Abdullayev 5 mart 2013-cü ildə Bakıda vəfat edib.





## Ayşad Məmmədov
(6 dekabr 1954)



Psixoloji-dramatik xarakterli personajları bacarıqla ifa edir.

Satirik-komik janrlı tamaşalarda da uğur qazanıb.

Səhnədə sakit görünsə də, rollarını daxili ehtirasla, təmkinlə oynayır.

Ayşad Kamal oğlu Məmmədov 6 dekabr 1954-cü ildə Bakının Mərdəkan qəsəbəsində doğulub. Məktəb illərindən buradakı dram dərnəyinin və sonralar xalq teatrının üzvü olub. 1978 – 1982-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Təyinatla Şəki Dövlət Dram Teatrına göndərilib və 1989-cu ilə kimi bu kollektivdə çalışıb. 1989 – 2009-cu illərdə Dövlət Gənclər Teatrında, 2009 – 2010-cu illərdə Gənc Tamaşaçılar Teatrında işləyib. 1 fevral 2011-ci ildən Akademik Milli Dram Teatrının truppasındadır.

Ayşad Məmmədov 28 oktyabr 2000-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif edilib.

Şəki teatrında Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Birinci maska, Müsyö Jordan («Lənkəran xanının vəziri» və «Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Kinto («Knyaz», Hüseyn Cavid), Surxay, Sadıq («Toy» və «Xoşbəxtlər», Sabit Rəhman), Sabutay («Dar ağacı», Bəxtiyar Vahabzadə), Müəllim («Axşam dərsi», Ramiz Rövşən), Ər («Şirəbənzər», Rüstəm İbrahimbəyov), Adil («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu), Əlibaba («Tilsimli dairə», Eldəniz Quliyev), Murad («Kələntər hərəkatı», R. Xəlilzadə).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Oğul Kruk («Ağ xəstəlik», Karl Çapek), Əmir («Teymurləng», Kristafor Marlo), Romeo («Romeo və Cülyetta»), Xəfiyyə («Sən Qara deyilsən», Əziz Nesin), Birinci mundir («Lunin və Jakın ölümü», Edvard Radzinski), Əyyaş kürəkən («Əsrə bərabər gün», Çingiz Aytmatov), Sandro Genenidze («Çinari manifesti», Aleksandr Çxeidze), İeşua («Ustad və Marqarita», Mixail Bulqakov), Əyyaş kürəkən («Əsrə bərabər gün», Çingiz Aytmatov), Dərrakəsiz («Avtobus», Stanislav Stratiyev), Molla Yusif («Dərviş və ölüm», Meşa Səlimoviç).

«Bəxt üzüyü» (Hüseyn), «Güllələnmə təxirə salınır» («Yetim» Paşa), «Ailə» (KQB işçisi) bədii filmlərinə çəkilib. «Yalan», «Sirat körpüsü», «Halallıq», «6-cı palata» televiziya film-tamaşalarında oynayıb.





## Şahzadə Babayeva
(25 yanvar 1955)



Şahzadə Eynulla qızı Babayeva 1976 – 1981-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Şəki Dövlət Dram Teatrında (1981 – 1984), Dövlət Gənclər Teatrında (1984 – 1992) aktrisa işləyib. 1993-cü ildən Bakı Bələdiyyə Teatrının truppasındadır.

Aktrisa 7 noyabr 2002-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Şahzadə Babayevanın Şəki teatrında Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Təranə («Hökm», Məmməd Şəkili), Şəhla («Hərənin bir ulduzu», Əli Səmədli), Rəhilə («Aşnalar», Sabit Rəhman), Həlimə, Zəhra («Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Nilufər («Ömrün sorağında», Nahid Hacıyev), Jasmen («Knyaz», Hüseyn Cavid), Şəfiqə («Xa-

talı Kabul», Məmməd Şəkili), Fəridə («Tilsimli dairə», Eldəniz Quliyev), Tərana («İstintaq başlanır», Məmməd Çələbiyev).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Boul («Arturo Uinin karyerası», Bertolt Brext), Naməlum qadın («Adsız ulduz», Mixail Sebastian), Olimpiya («Teymurləng», Kristafor Marlo), Avqusta («Meteor», Fridrix Dürrenmatt), Marşalın qızı («Ağ xəstəlik», Karl Çapek), Nadya («Halallıq», Valentin Rasputin).



## Muxtar İbadov
(2.2.1955 – 22.9.2013)

Yaradıcılığı əlvanlığı və xarakterik xüsusiyyətləri ilə seçilirdi.

Həm romantik, həm realist, həm də lirik-psixoloji teatr estetikalarının bədii prinsiplərini bacarıqla mənimsəmişdi.





İfadə vasitələrində sərt və yığcam, mənalı və fikir dərinliyi olan elementlərdən istifadə edirdi.

Muxtar Şahmar oğlu İbadov Balakən rayonunun Ağkilsə kəndində doğulub. Səhnəyə ilk dəfə məktəbdə fəaliyyət göstərən dram dərnəyində çıxıb. 1973 – 1977-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində oxuyub. 1977 – 1994-cü illərdə Şəki Dövlət Dram Teatrında aktyor, 1994 – 1996-cı illərdə baş rejissor, 1996 – 2006-cı illərdə Dövlət Gənclər Teatrında aktyor işləyib. 17 may 1989-cu ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Şəki teatrında klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Məstəli şah, Mirzə Fətəli Axundzadə, Divanbəyi («Müsyö Jordan və dərviş Məstəli şah», «Lənkəran xanının vəziri» və «Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Fazil Küleyni, Qasım kişi («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), İblis, Knyaz («İblis» və «Knyaz», Hüseyn Cavid), Kərəmov («Toy», Sabit Rəhman), Vəzir («Bir saat xəlifəlik», Abdulla Şaiq).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Kişi («Poçt şöbəsində xəyal», Elçin), Müstəntiq, Əmir, Murtuz müəllim («Bəxt üzüyü», «Yayda qartopu oyunu» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Seymur («Evlərin axşamları», Arif Abdullazadə), Hakim («Hökm», Məmməd Şəkili), Vəzir («Hərənin bir ulduzu», Əli Səmədli),

Nazim («Vəzifə», Əkrəm Əylisli), Əhliman, Əsəd, Bəyəli («Kəndimizin narları», «Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Afşin («Dar ağacı», Bəxtiyar Vahabzadə), Müstəntiq («İstintaq», Rüstəm İbrahimbəyov), Vaxtanq («İkimərtəbəli adam», Fikrət Qoca), Rəhim Rəhmanoviç («Axşam dərsi», Ramiz Rövşən), Nəriman Nərimanov («İmzalar içində», Nəriman Həsənzadə), Spartak, Cəlil Məmmədquluzadə («Təhminə və Zaur» və «Sizi deyib gəlmişəm», Anar), Türmə rəisi («Günəş küləyi», Ramiz Heydər), Səlim kişi («Toyda Çelentano oynayır», Əli Səmədli), Mirpaşa («Tilsimli dairə», Eldəniz Quliyev), Birinci milis («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Paloni, Kapuletti, Hersoq («Hamlet», «Romeo və Cülyetta» və «Tədbirə qarşı tədbir», Uilyam Şekspir), Napoleon («Napoleon», Ferdinand Brukner), Klark («Arturo Uinin karyerası», Bertolt Brext), Qriq («Adsız ulduz», Mixail Sebastian), Quqo Niffenşvander («Meteor», Fridrix Dürrenmatt), İldırım Bəyazid və Kalapin («Teymurləng», Kristafor Marlo), Satin («Həyatın dibində», Maksim Qorki), Naydin («Ustalar», Raço Stoyanov), Marşal («Ağ xəstəlik», Karl Çapek).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Arçil Qavaşeli və Eftixi («Çinari manifesti», Aleksandr Çxeidze), Lunin («Lunin və Jakın ölümü», Edvard Radzinski), Yedigey («Əsrə bərabər gün», Çingiz Aytmatov), Virtuoz («Avtobus», Stanislav Stratiyev), Qitse («Kürən yabı», İon Drutse), Müəllif («Halallıq», Valentin Rasputin), Ata («Dərviş və ölüm», Meşa Səlimoviç), Albadam («Elbrus evlənir», Georgi Xuqayev), Voland («Ustad və Marqarita», Mixail Bulqakov), Sultan («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus).





«Azərbaycanfilm» kinostudiyasında istehsal olunmuş «Qətl günü» (Qənbər Salahov), «Cavid ömrü» (İclas üzvü), «Sarı gəlin» (Muxtar), «Hökmdarın taleyi» (Bakı xanı) bədii filmlərinə çəkilib.

Muxtar İbadov daxilən gərgin aktyor idi. Amma və di gəl ki, aktyor bu gərginliyin ehtiras yüyənini həmişə əlində inamla saxlaya bilirdi. Onun gərginliyində romantik vüsət və təbii reallıq vardı. Aktyor bu gərginliyin estetik mahiyyətini və məna dəyərini ifa etdiyi səhnə personajının psixoloji ruhuna uyğun tərzdə nizamlaya və nizamlayıb qətiyyətlə idarə edə bilirdi.

Düşüncəliydi və bu düşüncəni personajın xarakteri ilə uzlaşdırmaqda yaxşı təcrübə toplamışdı. Ona görə mənalı pauzalara üstünlük verirdi. Həmin pauzalarda mütləq psixoloji məntiqə əsaslanırdı və üstünlüyü hərəkət plastikası ilə sifət ifadələrinə verirdi.

Təbiətən, ruhən romantik aktyor məktəbinin psixoloji ifadə vasitələrindən daha səylə bəhrələnirdi. Bununla belə, lirik-psixoloji rolları da şövq və ilhamla oynaya bilirdi. Komediya tamaşalarında dramatik yumordan məharətlə istifadə edirdi.

Yüksək səs texnikası vardı, sanki diafraqmanın «sükanı» onun boğazında deyil, əlində idi və onu istədiyi anda lazımi istiqamətə asanlıqla yönəldirdi.

Muxtar İbadov səhnə ehtirasını istədiyi ritmdə tənzimləməyi həssaslıqla bacarırdı.

İstedadlı aktyor 22 sentyabr 2013-cü ildə Bakıda vəfat edib.



## Xanlar Həşimzadə
(9 fevral 1955)

İfadəli və məzmunlu, səmimi və incə yumor keyfiyyətlərinə malikdir.

İfa etdiyi komediya obrazlarına xarakterik və tipik səciyyələr aşılaya bilir.

Əlvan yaradıcılığının bir qolunu dramatik rollar təşkil edir.

Xanlar Allahverdi oğlu Həşimzadə 9 fevral 1955-ci ildə Şəkidə doğulub. 1972-ci ildə şəhərdəki 7 saylı orta





məktəbi bitirib. Bir il ipək kombinatında işləyib. 1973 – 1975-ci illərdə hərbi xidmətdə olub. 1976-cı ilin ilk günlərində Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrının truppasına aktyor götürülüb. Teatrın nəzdindəki 2 illik studiyada peşəkarlıq təcrübəsinə yiyələnib. 30 dekabr 2015-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub. Azərbaycan Teatr Xadimləri İttifaqının «Qızıl Dərviş» mükafatı laureatıdır.

Klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Ohan və Arakel, Keçəl, Molla İbrahimxəlil, Mehtər Kərim («Hacı Qara», «Müsyö Jordan və dərviş Məstəli şah», «Molla İbrahimxəlil kimyagər» və «Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə), Hacı Qənbər («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Molla Abbas, Tanrıqulu («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Əmrah və İblis («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Kinto, Şeyx («Knyaz» və «İblis», Hüseyn Cavid), Surxay («Aydın», Cəfər Cabbarlı), Nəsirov («Xoşbəxtlər», Sabit Rəhman), Əli əbu Təvvab («Bir saat xəlifəlik», Abdulla Şaiq).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Fağır Bağır, Xudayar bəy («Adamın adamı» və «Sizi deyib gəlmişəm», Anar), Şahsuvar («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Qaçay, Gözətçi («Cəzasız günah» və «Dar ağacı», Bəxtiyar Vahabzadə), Həmid Həsənoviç

(«İkimərtəbəli adam», Fikrət Qoca), Professor («Onun iki qabırğası», Əli Əmirli), Mənsur («Şirinbala bal yığır», Salam Qədirzadə), Mehdiqulu («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Skripkaçı («Poçt şöbəsində xəyal», Elçin), Niftalı, Şənbə xanımın əri («Yayda qartopu oyunu» və «Uca dağ başında», Vaqif Səmədoğlu), Rəşad («Evlərin axşamları», Arif Abdullazadə), Zeynallı, Şahin («Yaşıl işıq» və «Hökm», Məmməd Şəkili), Kərim Çelentano, Münəccim («Toyda Çelentano oynayır» və «Hərənin bir ulduzu», Əli Səmədli), Mircəfər Bağırov («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Birinci əsgər («İmzalar içində», Nəriman Həsənzadə), İcraçı («Günəş küləyi», Ramiz Heydər), Şah, Siçan bəy, Məhərrəm, Şükür («Sindibadın xoşbəxtlik adasına səyahəti», «Tıq-tıq xanım», «Kəndimizin narları» və «Doğmalar», Rəhman Əlizadə), Adil («Xatalı Kabul», Məmməd Şəkili), İsmət («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Tanrıverdi («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Kamal («Gurultulu məhəbbət», Salam Qədirzadə), Əzrayıl («Dəli Domrul», Altay Məmmədov), Fərrux, Müdir («Buna da... şükür» və «Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Məmiş («Məni qınamayın», Hidayət), Kələntər («Kələntər hərəkatı», R.Xəlilzadə), Ziya («Tilsimli dairə», Eldəniz Quliyev), Atakişi Böyükkişiyeviç («Bankir adaxlı», Tamara Vəliyeva), Sultanqulu («Körpü», İsi Məlikzadə), Şahin («İstintaq başlanır», Məmməd Çələbiyev).





Əcnəbi ədiblərin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Jorj Danden, Lafleş («Aldadılmış ər», yaxud «Jorj Danden» və «Xəsis», Jan Batist Molyer), Fransa Kralı, Tibalt («Kral Lir» və «Romeo və Cülyetta», Uilyam Şekspir), Emanuel Lüts («Meteor», Fridrix Dürrenmatt), Aqnostos («Ezop», Gilerma Fiqeyredo), Udrya («Adsız ulduz», Mixail Sebastian), Vəli Əfəndi («Bayramın birinci günü», Nazim Hikmət), Gəlmə adam («Xoşbəxt hadisə», Slavomir Mrojek), Paskuale («Ruhlar», Eduardo de Filippo), Aqid və Xəlif («Napoleon», Ferdinand Brukner), Aqid və Xəlif («Teymurləng», Kristafor Marlo), O'Keyzi və Xuk («Arturo Uinin karyerası», Bertolt Brext), Don Severo («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Kroqstad («Oyuncaq ev», Henrik İbsen), Usta Qenço («Ustalar», Raço Stoyanov), Polis Komissarı («Tələ», Rober Toma), Bulat («Arvadımın əri», Georgi Xuqayev), Komissar, X, Qara («Toros canavarı», «Çox gülməli faciə» və «Sən Qara deyilsən», Əziz Nesin), Dərviş («Ay tutulan gecə», Mustay Kərim), Kuçqar («Dəmir qadın», Şərəf Başbəyov), Əziz («Duel», Mar Bayciyev), Qazdan Qazdanov («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Qara Zaim («Dərviş və ölüm», Meşa Səlimoviç), Meymun («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Ponti Pilat («Ustad və Marqarita», Mixail Bulqakov), Cəfər, Molla Nəsrəddin («Salam, Molla Nəsrəddin!» və «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).

Xanlar Həşimzadə «Həm ticarət, həm ziyarət» (Satıcı), «Yaddaş» (Müslüm), «Bir ovuc torpaq» (Div), «Odla qol-boyun» (Pişton), «Fosfor adam» (Məmiş) bədii filmlərinə çəkilib. Teatrın bir sıra xarici ölkələrə qastrol səfərlərinin iştirakçısıdır.



## Qənirə Məmmədova
(1 iyul 1956)

Qızlıq soyadı Mikayılovadır və bir sıra tamaşalarda həmin soyadla çıxış edib.

Teatrın peşə təhsili almayan aktrisalarından olan Qənirə Hilal qızı Məmmədova 1 iyul 1956-cı ildə Bərdə rayonunun Hacılar kəndində anadan olub. Kürdəmirdəki 13 saylı dəmiryol məktəbini bitirib. İki il Bakıda tikiş fabrikində işləyib. Məktəbəqədər Pedaqoji Texnikumunda qiyabi təhsil alıb.

1977-ci ilin noyabr ayından 2005-ci ilin sonuna kimi Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrında aktrisa işləyib.





Aktrisanın klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Xanpəri («Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Əminə («Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Sənubər, Zalxa («Xoşbəxtlər» və «Toy», Sabit Rəhman), Rəna («İblis», Hüseyn Cavid).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Ana («Dar ağacı», Bəxtiyar Vahabzadə), Şəlalə («İkimərtəbəli adam», Fikrət Qoca), Rəhimin arvadı («Axşam dərsi», Ramiz Rövşən), Nənə («Vəzifə», Əkrəm Əylisli), Bibi («Bala, başa bəla», Əli Əmirli), Türmə rəisinin gəlini («Günəş küləyi», Ramiz Heydər), Ağabacı («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Şəms-Qəmər, Mələk («Sindibadın xoşbəxtlik adasına səyahəti» və «Doğmalar», Rəhman Əlizadə), Tacmahal xala («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu), Münəvvər («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Laləzar («Gurultulu məhəbbət», Salam Qədirzadə), Ana («Dəli Domrul», Altay Məmmədov), Səkinə arvad («Toyda Çelentano oynayır», Əli Səmədli), Emma («Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Mədinə («Təhminə və Zaur», Anar), Haray xanım («Məni qınamayın», Hidayət), Təlatüm («Kələntər hərəkatı», R.Xəlilzadə), Maral («Bankir adaxlı», Tamara Vəliyeva), Gülüş («Yaşıl işıq», Məmməd Şəkili), Kəklik («Körpü», İsi Məlikzadə), Sevgili («İstintaq başlanır», Məmməd Çələbiyev).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Mariya Luiza («Napoleon», Ferdinand Brukner), Həbibə («Bayramın birinci günü», Nazim Hikmət), Karmelo və Armida («Ruhlar», Eduardo de Filippo), Madmazel Kuku («Adsız ulduz», Mixail Sebastian), Anna Mariya («Oyuncaq ev», Henrik İbsen), Donya Marsena («Mahir aradüzəldənlər», Xose Eceqaray).

Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Vardo («Çinari manifesti», Aleksandr Çxeidze), Şəfəq («Ay tutulan gecə», Mustay Kərim), Gülay («Toros canavarı», Əziz Nesin), Jaklin («Bahalı oğlan», Sergey Mixalkov), Əsgər şinelli qadın («Əsrə bərabər gün», Çingiz Aytmatov), Qadın («Avtobus», Stanislav Stratiyev), Praskovya Fyodorovna («Ustad və Marqarita», Mixail Bulqakov), Üm Əza («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Otun bibi, Arzu bibi («Salam, Molla Nəsrəddin!» və «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).





## Hikmət Nəbiyev
(20 sentyabr 1957)



Bəzi tamaşa proqram və afişalarında Nəbili soyadı ilə çıxış edib.

Hikmət Məmməd oğlu Nəbiyev 20 sentyabr 1957-ci ildə Şəkidə anadan olub. 1974-cü ildə rayondakı 12 saylı orta məktəbi bitirib. 1975-ci ildə Şəki Dövlət Dram Teatrına kütləvi səhnə aktyoru götürülüb. 1980 – 1984-cü illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Təhsilini başa vuran vaxtdan Şəki teatrının truppasında aktyordur. 12 aprel 2001-ci ildən həm də teatrın direktorudur.

Aktyorun klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Ohan və Sərkis, Molla İbrahimxəlil («Hacı Qara» və «Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə), Aşıq Vəli («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Məşədi Hacı və Həzrət Əşrəf, Kərbəlayı Mirzalı və Kərbəlayı İmamqu-

lu («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Təlxək əcinnə («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Cavanşir («Onun iki qabırğası», Əli Əmirli), Molla («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Oğru məhbus («Günəş küləyi», Ramiz Heydər), Murad («İkimərtəbəli adam», Fikrət Qoca), Gombul Vəli («Axşam dərsi», Ramiz Rövşən), İkinci sərbaz («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Kamal («Gurultulu məhəbbət», Salam Qədirzadə), Qoca («Dəli Domrul», Altay Məmmədov), Tərcüməçi oğlan («Toyda Çelentano oynayır», Əli Səmədli), Həsənağa («Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Qarınqulu («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Salman Tahirov («Cəzasız günah», Bəxtiyar Vahabzadə), Mirzəqulu («Məni qınamayın», Hidayət), Falçı («Kələntər hərəkatı», R. Xəlilzadə), Aslan («Bankir adaxlı», Tamara Vəliyeva), Mütəllim («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Kolen («Aldadılmış ər», yaxud «Jorj Danden», Jan Batist Molyer), Pepito («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Rafaello («Ruhlar», Eduardo de Filippo), Tivadar («Pələng və kaftar», Şandor Petefi), Vağzal naçalniki («Adsız ulduz», Mixail Sebastian).





Əcnəbi ədiblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Polis («Toros canavarı», Əziz Nesin), Ağabəy, Çopur keşikçi («Molla Nəsrəddinin sərgüzəştləri» və «Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Viktoviç), Sotne («Çinari manifesti», Aleksandr Çxeidze), İki minus bir Baş Rəhbər («Əsrə bərabər gün», Çingiz Aytmatov), Talpe («Kürən yabı», İon Drutse), Camal («Dərviş və ölüm», Meşa Səlimoviç), Dərviş («Ay tutulan gecə», Mustay Kərim), Vəzir («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus).

## Vahab Allahverdiyev

(15.8.1958 – 23.5.2012)



Vahab Paşa oğlu Allahverdiyev 15 avqust 1958-ci ildə Şəkinin Böyük Dəhnə kəndində anadan olub. Orta məktəbi 1975-ci ildə kənddə bitirib. İki il hərbi xidmətdə olub. 2 fevral 1979-cu ildə Şəki Dövlət Dram Teatrının kollektivinə qəbul edilib. Aktyor işləyə-işləyə

iki il teatrın studiyasında sənət dərsi alıb. 28 avqust 1997-ci ildə teatrdan işdən çıxıb. Bir müddət Rusiyada yaşayıb.

Aktyor Vahab Allahverdiyevin Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Kosa, Kərəməli, Xacə Məsud («Müsyö Jordan və dərviş Məstəli şah», «Hacı Qara» və «Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə), Sərsəm Heydər, Əsəd («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Müsafir («Knyaz», Hüseyn Cavid), Qiyas bəy («Komsomol poeması», İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), Birinci idmançı məhbus («Günəş küləyi», Ramiz Heydər), Fərəc («Doğmalar», Rəhman Əlizadə), Şeyda («Toy», Sabit Rəhman), Bülbül («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu), Slavyan taciri («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Həsən («Gurultulu məhəbbət», Salam Qədirzadə), Tacir («Dəli Domrul», Altay Məmmədov), Səyid («Toyda Çelentano oynayır», Əli Səmədli), Rəhman («Tilsimli dairə», Eldəniz Quliyev), Zeynallı («Yaşıl işıq», Məmməd Şəkili), Bilal («Körpü», İsi Məlikzadə).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Konduktor («Adsız ulduz», Mixail Sebastian), Yavər («Ağ xəstəlik», Karl Çapek), Divanə («Ay tutulan gecə», Mustay Kərim), Bəxtiyar («Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Viktoviç), Keşikçi («Əsrə bərabər gün», Çingiz Aytmatov), V («Çox





gülməli faciə», Əziz Nesin), İkinci polis («Dərviş və ölüm», Meşa Səlimoviç), Begemot («Ustad və Marqarita», Mixail Bulqakov), Cəllad («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus).

Vahab Allahverdiyev 23 may 2012-ci ildə Şəkidə vəfat edib.

## Əbülfət Salahov
(12 may 1962)



Sifətində və bədən quruluşunda meydan teatrı ifaçılarına xas olan xarakterik cizgilər var.

Bununla belə, dramatik obrazların ifasında təbii yumorunu psixoloji dərinliklə əvəz etmək üçün koloritli axtarışlar aparır.

İfa etdiyi obrazlarında maraqlı tipik səciyyələr olur.

Əbülfət Yusif oğlu Salahov 12 may 1962-ci ildə Şəkidə doğulub. Şəhərdəki 9 saylı beynəlmiləl məktəbi 1979-cu ildə bitirib. Orta məktəbdə oxuyarkən, 1977-ci ildə Sabit

Rəhman adına Şəki Dövlət Dram Teatrının truppasına təcrübəçi-aktyor götürülüb. Teatrın nəzdindəki 2 illik studiyada peşəkarlıq təcrübəsinə yiyələnib və truppanın əsas heyətinə keçib. 25 iyun 2013-cü ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Klassik Azərbaycan dramaturqlarının əsərlərində ifa etdiyi rollar: Hacı Qara və Heydər bəy («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Cəbi («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Şamama cadu («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Həmzad Qurban, Səbzəli («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Vasif («İblis», Hüseyn Cavid), Mürşüd («Xoşbəxtlər», Sabit Rəhman).

Çağdaş Azərbaycan müəlliflərinin müxtəlif janrlı pyeslərinin tamaşalarında oynadığı səhnə obrazları: Toğrul, Zabit («Cəzasız günah» və «Dar ağacı», Bəxtiyar Vahabzadə), Arıq Əli («Axşam dərsi», Ramiz Rövşən), «Devit «B» («Bala, başa bəla», Əli Əmirli), İkinci idmançı məhbus («Günəş küləyi», Ramiz Heydər), Rauf («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Eynal («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), İsrafil («Gurultulu məhəbbət», Salam Qədirzadə), Əzrayıl («Dəli´ Domrul», Altay Məmmədov), Molla Mahmud («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu), Şəyid («Toyda Çelentano oynayır», Əli Səmədli), Eynəkli, Şəkili («Buna da... şükür» və «Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Eşşək («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Murad («Kələntər hərəkatı», R.Xəlilzadə), Aslan («Bankir adaxlı», Tamara Vəliyeva), Şahin («Məni qınamayın», Hidayət), Sərvər («Yaşıl işıq», Məmməd Şəkili), İmran («Körpü», İsi Məlikzadə).

Dünya klassiklərinin faciə, dram və komediyalarında çıxış etdiyi bədii personajlar: Alfredo («Ruhlar», Eduardo de Filippo), Ernesto («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Qarpaqon («Xəsis», Jan Batist Molyer), Torvald («Oyuncaq ev», Henrik İbsen), Təlxək («Pələng və kaftar», Şandor Petefi), Marşal («Napoleon», Ferdinand Brukner), Müəllim («Adsız ulduz», Mixail Sebastian), Ər («Xoşbəxt hadisə», Slavomir Mrojek), Rüstəm («Bayramın birinci günü», Nazim Hikmət), Həkim və Gənc İnna («Arturo Uinin karyerası», Bertolt Brext).

Əcnəbi ediblərin səhnə əsərlərində oynadığı müxtəlif xarakterli surətlər: Qoqi («Çinari manifesti», Aleksandr Çxeidze), Ağyekət və Divanə («Ay tutulan gecə», Mustay Kərim), Ş.Müttəhim («Çox gülməli faciə» və «Toros canavarı», Əziz Nesin), Alimcan («Dəmir qadın», Şərəf Başbəyov), Corc Romson («Bahalı oğlan», Sergey Mixalkov), Növbətçi operator («Əsrə bərabər gün», Çingiz Aytmatov), Oğlan («Dərviş və ölüm», Meşa Səlimoviç), Çepena («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Ərkub («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus), Karovyev («Ustad və Marqarita», Mixail Bulqakov), Molla Nəsrəddinin eşşəyi, Bağdad oğrusu («Salam, Molla Nəsrəddin!» və «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).

Əbülfət Salahov «Fosforlu adam» (Saqqallı erməni), «Hökmdarın taleyi» (Casus), «O dünyadan salam» (Kəndli) filmlərinə çəkilib.



## Brilyant Babayeva
(25 may 1963)

Qızlıq soyadı İmaməliyevadır. Bir sıra tamaşalarda bu soyadla çıxış edib.

Brilyant Camal qızı Babayeva (İmaməliyeva) 25 may 1963-cü ildə Şəkidə anadan olub. 1970 – 1980-ci illərdə rayondakı 10 saylı orta məktəbdə oxuyub. Məktəbi bitirən ili Şəki Dövlət Dram Teatrına kütləvi səhnə aktrisası götürülüb. Teatrın nəzdindəki 2 illik aktyorluq kursunda oxuyub.

1983 – 1987-ci illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alaraq yenidən Şəki teatrına qayıdıb.





Aktrisanın Azərbaycanın klassik müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Şərəfnisə xanım, Tükəz («Müsyö Jordan və dərviş Məstəli şah» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Dilbər xanım («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Alman qızı («Knyaz», Hüseyn Cavid).

Çağdaş Azərbaycan dramaturqlarının əsərlərində oynadığı səhnə obrazları: Sona («Vəzifə», Əkrəm Əylisli), Fatma, Yengə, Mirvari, Şəfiqə («Sindibadın xoşbəxtlik adasına səyahəti», «Tıq-tıq xanım», «Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Ceyran, Ana («Onun iki qabırğası» və «Bala, başa bəla», Əli Əmirli), Səbinə («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Məsmə xanım («Gecə yarısından sonra elçilik», Novruz Cəfərov), Günay («Məni qınamayın», Hidayət), Səmayə («Bankir adaxlı», Tamara Vəliyeva), Arifə («İstintaq başlanır», Məmməd Çələbiyev).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Armida («Ruhlar», Eduardo de Filippo), Məktəbli qız və Naməlum qadın («Adsız ulduz», Mixail Sebastian), Frü Linne («Oyuncaq ev», Henrik İbsen), Xanım Sotanvil, Frozina («Aldadılmış ər», yaxud «Jorj Danden» və «Xəsis», Jan Batist Molyer), Ninka («Halallıq», Valentin Rasputin), Qız («Avtobus», Stanislav Stratiyev), Çefulyasa («Kürən yabı», İon Drutse), Poli («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Tanqabikə («Ay tutulan gecə», Mustay Kərim), Səadət («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).



İqrar Salamov
(5 noyabr 1970)

Şirin və ürəyəyatımlı muğam səsi var. Tamaşalarda yeri gələndə ifa etdiyi obrazın xarakterinə uyğun şəkildə yaradıcılığının bu cəhətindən bacarıqla istifadə edir.

İfasında təbii və səmimi cazibədarlıq var.

İqrar Zakir oğlu Salamov 5 noyabr 1970-ci ildə Şəkidə doğulub. 1985 – 1988-ci illərdə Bakı musiqi gimnaziyasında, 1988 – 1993-cü illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət Universitetinin musiqili komediya aktyorluğu fakültəsində təhsil alıb. 1993 – 1995-ci illərdə Şəki Dövlət Dram Teatrında aktyor işləyib. 1996 – 2013-cü illərdə Şuşa Dövlət Musiqili Dram Teatrının truppasında çalışıb. 2013-cü ildən yenə Şəki teatrının kollektivinə qayıdıb.

İqrar Salamov 9 may 2012-ci ildə Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Aktyorun Şəki teatrında ifa etdiyi səhnə obrazları: Elbrus («Arvadımın əri», Georgi Xuqayev), Divanə





(«Ay tutulan gecə», Mustay Kərim), Mətin («Toros canavarı», Əziz Nesin), Çayçı Sultan («Adamın adamı», Anar), Qığılcım, Şair («Körpü» və «Soltanqulu körpüsü», İsi Məlikzadə), Məhəmməd Cuvarlı («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Pepito («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Oğru («Oğru», Əhməd Orucəli-Orucoğlu), Şirvan («Toyda Çelentano oynayır», Əli Səmədli), Divanə («Ay tutulan gecə», Mustay Kərim), Mətin («Toros canavarı», Əziz Nesin), Həkim Murat («...Və dəyirman dönərdi», Haldun Taner).

İqrar Salamov «Sübhün səfiri» (Nuxalı), «Yoxlama» (Kişi) bədii filmlərinə çəkilib.



Sima Şabanova
(5 yanvar 1977)

Sima Aliko qızı Şabanova 5 yanvar 1977-ci ildə Şəkidə anadan olub. Rayondakı 8 saylı rus məktəbində 8 illik təhsil alıb. 1 sentyabr 2006-cı ildən Şəki Dövlət Dram Teatrının truppasındadır.

Aktrisanın Azərbaycanın klassik müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Şəhvət, Sona («Molla İbrahimxəlil kimyagər» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Yetər («Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov), Hafizə xanım («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev).

Çağdaş dramaturqların səhnə əsərlərində oynadığı rollar: Xanımana («Buna da... şükür», Novruz Cəfərov), Ceyran («Onun iki qabırğası», Əli Əmirli), İlan, Tıq-tıq xanım («Sindibadın xoşbəxtlik adasına səyahəti» və «Tıq-tıq xanım», Rəhman Əlizadə), Aysel («Cəzasız günah», Bəxtiyar Vahabzadə), Mehriban («Məni qınamayın», Hidayət), Gülbinə («Bankir adaxlı», Tamara Vəliyeva).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Nora («Oyuncaq ev», Henrik İbsen), Florans («Tələ», Rober Toma), Şərafət («Dəmir qadın», Şərəf Başbəyov), Mariya («Ruhlar», Eduardo de Filippo), Arvad («Xoşbəxt hadisə», Slavomir Mrojek), Eliza, Anjelika («Xəsis» və «Aldadılmış ər», yaxud «Jorj Danden», Jan Batist Molyer), Teodora («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Zarina («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Məktəbli qız («Adsız ulduz», Mixail Sebastian), Gülsüm («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).





## Lalə Məmməd
(18 fevral 1977)



Lalə Mirzəli qızı Məmmədova 18 fevral 1977-ci ildə Şəki rayonunun Qaratorpaq kəndində anadan olub. Orta təhsilini 1995-ci ildə Şəkidəki 19 saylı məktəbdə bitirib. 1995 – 2006-cı illərdə rayondakı təmir-tikinti idarəsində işləyib. 1 may 2006-cı ildən Şəki Dövlət Dram Teatrının truppasında aktrisadır.

Aktrisanın Azərbaycan müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Səlimə və Rəqqasə («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Teybə xanım («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Mədinə («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Anjelika («Aldadılmış ər», yaxud «Jorj Danden», Jan Batist Molyer), Şəfəq («Ay tutulan gecə», Mustay Kərim), Rəqqasə qız («Mahir aradüzəldənlər», Xose

Eçeqaray), Tamara («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Xanımana («Buna da... şükür», Novruz Cəfərov), Mariana («Xəsis», Jan Batist Molyer).

«Fosforlu adam» (Ana), «Mahmud və Məryəm» (Qulluqçu), «Hökmdarın taleyi» (Ana), «Qırmızı bağ» (Tibb bacısı) filmlərinə çəkilib.



## Pərviz İsmayılov
(3 avqust 1978)

Teatrın istedadlı gənc aktyorlarından olan Pərviz Ramiz oğlu İsmayılov 3 avqust 1978-ci ildə Şəkidə anadan olub. Şəhərdəki 19 saylı məktəbin 9-cu sinfini bitirərək Şəki 13 saylı texniki-peşə məktəbində oxuyub. Paralel olaraq Şəki Dövlət Dram Teatrı nəzdindəki aktyorluq kursunu keçib. 1997-ci ildən 2002-ci ilə kimi Şəki teatrında aktyor işləyib. 2002 – 2004-cü illərdə Şuşa Dövlət Musiqili Dram Teatrında çalışıb. 2005-ci ildən yenidən Şəki teatrına qayıdıb.





Pərviz İsmayılovun Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Molla Salman, Əsgər bəy («Molla İbrahimxəlil kimyagər» və «Hacı Qara», Mirzə Fətəli Axundzadə), Cəmil («Bala, başa bəla», Əli Əmirli), Mais Kazımov («Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev), Oğru, Xoruz («Sindibadın xoşbəxtlik adasına səyahəti» və «Tıq-tıq xanım», Rəhman Əlizadə), Zaur («Bankir adaxlı», Tamara Vəliyeva), Qələndər və Fərari («Buna da... şükür», Novruz Cəfərov).

Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Rueda və Gitaraçı oğlan («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Kleant, Lüben («Xəsis» və «Aldadılmış ər», yaxud «Jorj Danden», Jan Batist Molyer), Yalsıqul («Ay tutulan gecə», Mustay Kərim), Afanas («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Molla Nəsrəddinin eşşəyi («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç).



## Rəhim Qocayev
(10 avqust 1979)

Rəhim Xəlil oğlu Qocayev 10 avqust 1979-cu ildə Şəkidə doğulub. 9-cu sinifə kimi Şəki şəhər 10 saylı məktəbdə oxuyub. 1994 – 1997-ci illərdə 43 saylı texniki-peşə məktəbində təhsil alıb. 1997-ci ildə Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrına radist götürülüb. 1997 – 1999-cu illərdə hərbi xidmətdə olub. Qayıdandan sonra yenə teatrda radist işləyib. 2001-ci il dekabr ayının 1-dən aktyor truppasında çalışır.

Aktyorun Azərbaycanın klassik və çağdaş müəlliflərinin müxtəlif janrlı əsərlərinin tamaşalarında ifa etdiyi səhnə obrazları: Qurban («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Aşıq Sadıq («Tıq-tıq xanım», Rəhman Əlizadə), Qələndər və Fərari («Buna da... şükür», Novruz Cəfərov), Hacı Nuru («Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə), Hüquqçu («Cəzasız günah», Bəxtiyar Vahabzadə).





Tərcümə pyeslərinin tamaşalarında ifa etdiyi personajlar: Səid («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç), Valer, Klitandr («Xəsis» və «Aldadılmış ər», yaxud «Jorj Danden», Jan Batist Molyer), Ernesto («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Daniel («Tələ», Rober Toma), Hacı («Çiy yumurta, bişmiş məhəbbət», Georgi Xuqayev), Ağyegət («Ay tutulan gecə», Mustay Kərim).

---

Müxtəlif illərdə sənət ocağının truppasında çalışan və teatrın yaradıcılıq iqlimində müəyyən xidmətləri ilə yadda qalan aktyorlar olub. Həmin aktyorlardan bir neçəsinin ifa etdikləri əsas rolları oxucuların nəzərinə çatdırıram.

*Rövşən Almuradlı:* Dövlət bəy («Aydın», Cəfər Cabbarlı), Rəcəb («Şirinbala bal yığır», Salam Qədirzadə), Fənd Fərəc («Adamın adamı», Anar), Qaynar («Əks-səda», Nəbi Xəzri), Qasım («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Baba («Poçt şöbəsində xəyal», Elçin), Kral Lir («Kral Lir», Uilyam Şekspir), Fyodor Balyasnikov («Bir insan ömrü», Aleksey Arbuzov).

Rövşən Almuradlı «Dərviş və ölüm» (Meşa Səlimoviç) tamaşasının quruluşçu rejissoru olub.

*Ofeliya Nəzirova:* Pərzad («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Vəfa («İstintaq başlanır», Məmməd Çələbiyev), Almaz («Evlərin axşamları», Arif Abdullazadə), Vəfa («Hökm», Məmməd Şəkili), Olqa («Meteor», Fridrix Dürrenmatt), Gülgün («Hərənin bir

ulduzu», Əli Səmədli), Qumru («Aşnalar», Sabit Rəhman), Mehriban, Tamara («Doğmalar» və «Dadaşbala əməliyyatı», Rəhman Əlizadə), Lüsya («Halallıq», Valentin Rasputin), Nübar («Ömrün sorağında», Nahid Hacıyev), Alman qızı («Knyaz», Hüseyn Cavid), Nərminə («Xatalı Kabul», Məmməd Şəkili), Zabina («Teymurləng», Kristafor Marlo).

*Oqtay Əhmədov:* Kərbəlayı Fətəli («Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Molla («İblis», Hüseyn Cavid), Rafiq («Tilsimli dairə», Eldəniz Quliyev), Vəkil («Çələbi xan», Mahmud İsmayılov və Oqtay Salamzadə), Nemət («Gurultulu məhəbbət», Salam Qədirzadə), Qurban («Körpü», İsi Məlikzadə), Fərraş («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Cavanşir («Onun iki qabırğası», Əli Əmirli), Əczaçı («Romeo və Cülyetta», Uilyam Şekspir), Z («Çox gülməli faciə», Əziz Nesin), Orxan bəy («Bayramın birinci günü», Nazim Hikmət), Suban («Dəmir qadın», Şərəf Başbəyov).

*Cabir Əmrahov:* Məşədi Qurban («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Pirqulu («Aydın», Cəfər Cabbarlı), Xalid («Bir saat xəlifəlik», Abdulla Şaiq), Tormoz Əmircan («Şirinbala bal yığır», Salam Qədirzadə), Mirzə Ələkbər Sabir, Tərs Tahir («Sizi deyib gəlmişəm» və «Adamın adamı», Anar), Tufan («Əks-səda», Nəbi Xəzri), Toğrul («Uca dağ başında», Vaqif Səmədoğlu), Mehralı, Murad («Toy» və «Aşnalar», Sabit Rəhman), Osvald («Kral Lir», Uilyam Şekspir), Buçer («Arturo Uinin karyerası», Bertolt Brext), Şafrot («Meteor», Fridrix Dürrenmatt), Hafiz Məhəmməd («Dərviş və ölüm», Meşa Səlimoviç).





*Ruzigar Cəbiyev:* Ağa Bəşir («Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə), Mustafa bəy («Qonşu qonşu olsa, kor qız ərə gedər», Rəşid bəy Əfəndizadə), Zəfər («Əks-səda», Nəbi Xəzri), Nəsirov, Bilal kişi, Ağazadə («Xoşbəxtlər», «Toy» və «Aşnalar», Sabit Rəhman), Səməndər («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Hüseynov («Kəndimizin narları», Rəhman Əlizadə), Tərgəldi («Adamın adamı», Anar), Bahadır («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu), Samson («Romeo və Cülyetta», Uilyam Şekspir), Vaş («Pələng və kaftar», Şandor Petefi), Boul («Arturo Uinin karyerası», Bertolt Brext).

*Akif Mirzəyev:* Koxa («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Ağazadə, Umud («Aşnalar» və «Yalan», Sabit Rəhman), Bəhram Zeynallı («Şəhərin yay günləri», Anar), Qeybulla («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Professor («Poçt şöbəsində xəyal», Elçin), Fətəli xan Xoyski («İmzalar içində», Nəriman Həsənzadə), Məmməd («Kəndimizin narları», Rəhman Əlizadə), Uçitel Həsənov («Sizi deyib gəlmişəm», Anar), Bela («Pələng və kaftar», Şandor Petefi), Frenk («Bahalı oğlan», Sergey Mixalkov), Karuzer («Arturo Uinin karyerası», Bertolt Brext), Akim («Adsız ulduz», Mixail Sebastian), Xosrov («Teymurləng», Kristafor Marlo).

*İlham Əliyev:* Şahbaz bəy («Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə), Naçalnik («Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Qurban («Aydın», Cəfər Cabbarlı), Hacı Mürsəl («Qonşu qonşu olsa, kor qız ərə gedər», Rəşid bəy Əfəndizadə), Səttar («Axşam

dərsi», Ramiz Rövşən), Elbrus («Arvadımın əri», Georgi Xuqayev), Zaza («Çinari manifesti», Aleksandr Çxeidze), Oğlan («Dərviş və ölüm», Meşa Səlimoviç), Levin Matvey («Ustad və Marqarita», Mixail Bulqakov), Übeyd («Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus).

*Elman Şeydayev:* Novruz bəy və Surxay («Aydın», Cəfər Cabbarlı), Ağəmi («Şirinbala bal yığır», Salam Qədirzadə), Tərs Tahir («Adamın adamı», Anar), Səfər («Əks-səda», Nəbi Xəzri), Kişi («Poçt şöbəsində xəyal», Elçin), Qədir («Quşu uçan budaqlar», Əkrəm Əylisli), Toğrul («Uca dağ başında», Vaqif Səmədoğlu), Axşay («Kəndimizin narları», Rəhman Əlizadə), Hersoq Kornoul («Kral Lir», Uilyam Şekspir), Kuzma Balyasnikov («Bir insan ömrü», Aleksey Arbuzov).

*Niymət Ağabalayev:* Yavər («İmzalar içində», Nəriman Həsənzadə), Yavər («Napoleon», Ferdinand Brukner), Çayçı Əli («Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Viktoviç), Xidmətçi («Əhmədin vəfalı xoruzu», Əli Səmədli), İntim («Bala, başa bəla», Əli Əmirli), Arakel («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Rueda («Mahir aradüzəldənlər», Xose Eçeqaray), Vəzir («Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə), Nümayəndə («Məni qınamayın», Hidayət), Konduktor («Adsız ulduz», Mixail Sebastian), Məmmədəli («Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç), Şeyx Salah («Molla İbrahimxəlil kimyagər», Mirzə Fətəli Axundzadə).







«Komsomol poeması», İsgəndər Coşqun.
Molla Şirəli – Mustafa Əhmədzadə. 1976-cı il



Teatrın baş rejissoru Mirbala Səlimli məşq zamanı



«Ustalar», Raço Stoyanov.
Qena – Sovqat Səmədova, Nayden – Muxtar İbadov. 1978-ci il



«Yalan», Sabit Rəhman.
Soldan: Güllü xala – Sovqat Səmədova, Tərlan xanım – Gülşad Baxşıyeva, Bilal kişi – Ruzigar Cəbiyev. 1979-cu il





İkinci macar pyesləri festivalının qonaqları «Pələng və kaftar» (Şandor Petefi) tamaşasından sonra iştirakçılarla birlikdə. 1979-cu il



«Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə.
Soldan: Tarverdi – Cahangir Novruzov,
Namaz – Aydın Əlibalayev, Zalxa – Sovqat Səmədova.
1980-ci il



«Şəhərin yay günləri», Anar. Tamaşadan səhnə.
1979-cu il





«Kəndimizin narları»,
Rəhman Əlizadə.
1980-ci il



Tamaşadan səhnələr









«Arturo Uinin karyerası»,
Bertolt Brext.
1980-ci il





Tamaşadan səhnələr





«Meteor», Fridrix Dürrenmatt.
Tamaşadan səhnələr.
1981-ci il










«Aşnalar», Sabit Rəhman.
1981-ci il





Tamaşadan səhnələr



«Ezop», Gilerma Fiqeyredo. Kleya – Gülşad Baxşıyeva, Ksanf – Cahangir Novruzov. 1979-cu il







«Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə.
Tamaşadan səhnələr. 1982-ci il



«Lənkəran xanının vəziri»,
Mirzə Fətəli Axundzadə.
1982-ci il





Tamaşadan səhnələr





«Teymurləng»,
Kristafor Marlo.
1983-cü il





Tamaşadan səhnələr







«Romeo və Cülyetta», Uilyam Şekspir. 1984-cü il



Tamaşadan səhnələr





Yuxarıdan: Lafleş – Xanlar Həşimzadə, Qarpaqon – Əbülfət Salahov



Soldan: Qarpaqon – Əbülfət Salahov, Lafleş – Xanlar Həşimzadə



«Xəsis», Jan Batist Molyer. 2008-ci il

Soldan: Qarpaqon – Əbülfət Salahov, Jak – Akif Yusifov



Qarpaqon – Əbülfət Salahov



Frozina – Brilyant Babayeva, Lafleş – Xanlar Həşimzadə

«Xəsis», Jan Batist Molyer. 2008-ci il



Soldan: Qarpaqon – Əbülfət Salahov, Kleant – Pərviz İsmayılov







Zübərcət – Nəzrin Əhmədli, Ağyegət – Rəhim Qocayev

«Ay tutulan gecə», Mustay Kərim. 2009-cu il



Dərviş – Xanlar Həşimzadə, Şəfəq – Lalə Məmməd





Pəri – Yasəmən Malik,
Şamama cadu – Əbülfət Salahov

Pəri – Yasəmən Malik,
Qurban – Rəhim Qocayev

«Pəri cadu»,
Əbdürrəhim bəy Haqverdiyev.
2009-cu il



Səlimə – Lalə Məmməd





Cənab Sotanvil –
Akif Yusifov



Klodina – Nərmin Abbasova,
Lüben – Pərviz İsmayılov

«Aldadılmış ər» («Jorj Danden»),
Jan Batist Molyer.
2011-ci il





Jorj Danden –
Xanlar Həşimzadə



Cənab Sotanvil –
Akif Yusifov



Yuxarıdan: Don Severo –
Xanlar Həşimzadə,
Pepito –
İqrar Salamov

«Mahir aradüzəldənlər»,
Xose Eçeqaray.
2013-cü il



Mariana –
Qəmər Məmmədova



Ernesto –
Rəhim Qocayev





Ayaz –
Rəhim Qocayev



Bağırov –
Xanlar Həşimzadə



Səlim Babayev –
Akif Yusifov

«Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev.
2014-cü il



Tamaşadan səhnə



Küşat –
Rəhim Qocayev,

Tutuquşu –
Əbülfət Salahov,

Azat –
Pərviz İsmayılov



«...Və dəyirman dönərdi», Haldun Taner. 2015-ci il

Soldan:
Tutuquşu –
Əbülfət Salahov,
Küşat –
Rəhim Qocayev



«...Və dəyirman dönərdi», Haldun Taner. 2015-ci il



Tamaşadan səhnə



Fəhrünnisə – Çinarə Səmədova,
Küşat – Rəhim Qocayev


Aslan Mustafazadə


Günel Səlimli


Arzu Əhmədova


Gülbəniz Mustafayeva


İlham Musazadə


Elman Rəşidov


İlqar Orucov


Hafiz Əhədov


Günel Xasməmmədova




İradə Musayeva


İlham Əliyev


İlqar Saatov


Oqtay Əhmədov


Nərmin Abbasova


İlyas Əsədov


Laçın Abbasov


Niymət Ağabalayev


İradə Sadıqova


Samirə Bəbişova


Qurban Rəsulov


Xəyal Salahov


Yasəmən Malik


Rəşad Rüstəmov


Hikmət Rəsulzadə


Rəşadət Sadıqov


Fərahim Fətəliyev


Rəsul Məmmədrəhimov




Çinarə Səmədova


Orxan Həmidli


Elvin Mabudov


Hüseyn Hüseynli


İlkin Rüstəmov


Əsgər Əhmədov


Fəxri Abbasov


Anar Bəhlulov

Şəkillərdə teatrın aktyorları, yaradıcı və inzibati işçiləri

## REJİSSORLAR



### Həsən Əliyev
(1910 – 1971)

Rejissor və pedaqoq idi.

Şəki teatrının repertuarının formalaşmasında, aktyor truppasının inkişafında xüsusi xidmətləri olub.

Yaradıcılığı əsasən realist teatr prinsipləri ilə xarakterizə olunur.

Həsən Əbdülkərim oğlu Əliyev 1910-cu ildə Şəkidə doğulub. Burada 7 illik təhsil alıb. 1925 – 1928-ci illərdə Mirzə Fətəli Axundzadə adına Bakı Teatr Məktəbində





aktyorluq, 1928 – 1933-cü illərdə Leninqrad Dövlət Teatr İnstitutunda rejissorluq təhsili alıb. 1933 – 1946-cı illərdə (müəyyən fasilələrlə) Mirzə Fətəli Axundzadə adına Azərbaycan Dövlət Teatr Məktəbində, 1946 – 1968-ci illərdə fasilələrlə Azərbaycan Dövlət Teatr İnstitutunda dərs deyib. 1938 – 1942-ci illərdə Azərbaycan Dövlət Musiqili Komediya Teatrında bədii rəhbər, 1947 – 1951-ci illərdə Gənc Tamaşaçılar Teatrında baş rejissor işləyib.

1936-cı ildə Mirzə Ələkbər Sabir adına Nuxa (Şəki) Dövlət Dram Teatrının fəaliyyəti bərpa olunanda rəhbərlik etdiyi aktyor kursunun tələbələri ilə bura gəlib. Teatr öz pərdələrini onun hazırladığı tamaşa ilə açıb. Qısa fasilələrlə üç dəfə bu kollektivin baş rejissoru olub.

Şəki Dövlət Dram Teatrında Mirzə Fətəli Axundzadənin «Hacı Qara», Nəcəf bəy Vəzirovun «Hacı Qənbər», Cəfər Cabbarlının «Sevil», «1905-ci ildə», Mirzə İbrahimovun «Həyat», Üzeyir bəy Hacıbəylinin «Arşın mal alan» əsərlərinə səhnə quruluşu verib.

İstedadlı rejissor və bacarıqlı pedaqoq Həsən Əliyev Teatr Məktəbindəki pedaqoji fəaliyyətinə görə 17 iyun 1943-cü ildə Azərbaycan Respublikasının Əməkdar müəllimi fəxri adı ilə təltif olunub.

Həsən Əliyev 1971-ci ildə Bakıda vəfat edib.



Vaqif Abbasov
(27.6.1941 – 6.5.1981)

Ötən əsrin yetmişinci illərinin ikinci yarısında Azərbaycan rejissurasına təzə nəfəs, yeni üslub xüsusiyyətləri, estetik poetika səciyyələri, ifadə vasitələri, forma əlvanlığı, məzmun təravəti gətirən sənətkarlardan biri də Vaqif Abbasov olub.

Onun qurduğu tamaşalarda forma və məzmuna uyğun olaraq cəmiyyətin mürəkkəb sosial-ictimai, mənəvi-əxlaqi problemləri emosional psixologizmlə, lirik ahənglə, xalq məsxərə və şəbədə oyunlarının qroteskli çalarları, satirik hiperbola kimi müxtəlif estetik göstəricilər vasitəsilə səhnə təcəssümü tapırdı.

Janr təzadlarını bir estetik duyumda həll etməyi xoşlayırdı.

Fikir və fəlsəfi duyğularının əsasında realizmin cövhəri dururdu və hər təzə tamaşasında çağdaşlığın məzmunda, formada və aktyor oyununda yeni keyfiyyətlər daşımasına bacarıqla nail olurdu.





Vaqif Abbas oğlu Abbasov 27 iyun 1941-ci ildə İrəvanda doğulub. Atası müharibədə faşistlərlə döyüşdə həlak olub. Ailə anaları Şövkət xanımın ümidinə qalıb. 1948-ci ildə azərbaycanlıların kütləvi şəkildə Ermənistandan köçürüldüyü ildə Vaqif, anası və bacıları Ofelya xanım və Zərifə xanım Bakıda məskunlaşıblar. Burada əvvəlcə gündüz məktəbində oxuyub. Orta təhsilini isə axşam məktəbində başa vurub. Bunu ona görə etmişdi ki, gündüzlər işləyib (yaşı düşmədiyi üçün onu qanuni işə götürməyiblər) ailənin güzəranına kömək edə bilsin. Teatrla məktəb yaşlarından maraqlanıb. Elə həmin maraqla da Əbilov adına klubun dram dərnəyinə üzv olub. Orta məktəbi bitirəndən sonra tikinti materiallarının istehsalı və quraşdırılması idarəsində (16 noyabr 1961 – 5 mart 1962), Oktyabr rayonundakı (indiki Yasamal rayonu) 31 saylı məktəbdə dərnək rəhbəri (1 may 1962 – 16 iyun 1962), Sənaye Məşğulluğu Kombinatında foto retuşçusu (26 sentyabr 1962 – 1 mart 1965) işləyib. 16 mart 1965-ci ildə Binəqədi qəsəbə klubuna müdir təyin edilib və elə həmin il Azərbaycan Dövlət Teatr İnstitutunun mədəni-maarif fakültəsinin axşam şöbəsinə qəbul olunub.

Bir müddət Keşlə mədəniyyət evində direktor işləyən (1 iyun 1968 – 13 noyabr 1968) Vaqif Abbasov sonra işsiz qalıb və yenidən Binəqədi qəsəbəsinə çağırılıb. Artıq «Mərkəzi Mədəniyyət evi» statusu olan kollektivdə əvvəl bədii rəhbər işləyib (26 may 1969) və sonra dram

dərnəyi xalq teatrı adını aldığına görə həvəskar truppaya rejissor təyin olunub. Xalq teatrında o, Məmmədhüseyn Təhmasibin «Bahar» və Mehdi Hüseynin «Alov» dramlarını tamaşaya hazırlayıb.

«Alov» tamaşası Vaqif Abbasovun diplom işi kimi nəzərdə tutulmuşdu. Əsər 1970-ci il mart ayının 16-da Səməd Vurğun adına Azərbaycan Dövlət Rus Dram Teatrının səhnəsində göstərildi. Tamaşaya baxan imtahan komissiyasının üzvləri arasında xalq artisti, milli səhnəmizin Cülyettası adını qazanmış Barat xanım Şəkinskaya da vardı. Tamaşa gözlənildiyindən də uğurlu alınıb və diplomçunun işi «beş» qiymətə layiq görülüb. Barat xanım çıxışında Vaqif Abbasovu təbrik elədi, ona təşəkkürünü bildirdi və məsləhət gördü ki, Moskvaya gedib ali rejissor təhsili alsın. «Bacarmaram» deyən Vaqifə Barat xanım «lap yaxşı bacararsan, mən də sənə yazılı zəmanət verərəm» sözləri ilə cavab verib.

Vaqif Abbasov bir neçə ay sonra Anatoli Lunaçarski adına Moskva Dövlət Ümumittifaq Teatr Sənəti İnstitutunun rejissorluq fakültəsinə qəbul olunub. O, məşhur pedaqoq İosif Mixayloviç Tumanovun kursunda təhsil almağa başlayıb. İnstitutun Tədris teatrında Eduard Olbinin «Bessi Emitin ölümü» pyesinə quruluş verib və tamaşanın xoş sədası əyalət teatrlarına da gedib çatıb.

Fitrətən istedadlı olan Vaqif Abbasov tələbəlik illərində dəhşətli bir hadisə ilə üzləşib. Uşaqları aparan





avtobus qəzaya uğrayıb və maşında yanğın baş verib. Bir an belə düşünmədən Vaqif özünü alovun içinə atıb və bir neçə uşağı ölümün pəncəsindən xilas edib, eyni zamanda, iki ayağı şiddətli yanığa məruz qalıb. Elə bu zədə də onun ömrünə balta çalıb...

İnstitutu tələbə yoldaşlarından altı ay əvvəl bitirib və fövqəladə komissiyanın qərarı ilə ona qırmızı diplom verilib. Bu, sovet dövründə nadir hadisə idi. O, diplom tamaşasını Uralın Berezniki şəhərində hazırlayıb və «əla» qiymət alıb. Tamaşa üçün Vadim Ziminin «Taxta kral» nağıl-pyesi seçilmişdi.

Ali rejissor diplomu ilə Bakıya qayıdan Vaqif Abbasov Respublika Mədəniyyət Nazirliyinin əmri ilə Gənc Tamaşaçılar Teatrına quruluşçu rejissor təyin olunub (7 yanvar 1975). Bu teatrın rus bölməsində Maqsud İbrahimbəyovun «Bütün yaxşılıqlara görə ölüm» psixoloji dramını tamaşaya hazırlayıb.

Bu ərəfədə Azərbaycan hökumətinin əmrinə əsasən Mədəniyyət Nazirliyi 1949-cu ildə bağlanmış Şəki Dövlət Dram Teatrının bərpası ilə bağlı qərar qəbul etdi. Əmrdə göstərilirdi ki, teatrın aktyor truppası yerli həvəskarlardan və İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsinin son kurs tələbələrindən təşkil edilsin. Ancaq teatrın baş rejissor məsələsi hələ həll edilməmişdi. Vaqif Abbasovun «Bütün yaxşılıqlara görə ölüm» tamaşasının forma orijinallığı, üslub yeniliyi,

rejissorun novator estetik prinsiplər əsasında işləməsi Şəkiyə gedəcək tələbə-aktyorlara da çatmışdı.

Bir gün Vaqif Abbasov sonradan Şəki teatrının aktyoru olan, daha sonra Azərbaycan Dövlət Musiqili Komediya Teatrında işləyən Ağarəfi Rəhimovun işlədiyi kino həvəskarları klubunda məşq keçirdi. Otağa aktyorluq fakültəsinin dördüncü kurs tələbələri Hüseynağa Atakişiyev, Gülşad Baxşıyeva, Qəmər Məmmədova, Nəbi Qədirov və Ağalar Mehdiyev daxil oldular. Onlar bir növ bəyanat kimi bildirdilər ki, kollektivin qərarıdır: Vaqif müəllim baş rejissor kimi onlarla Şəkiyə getməlidir.

Tələbələr bu barədə Mədəniyyət naziri Zakir Bağırova müraciət etdilər və 26 iyun 1976-cı ildə Vaqif Abbasov Şəki Dövlət Dram Teatrına baş rejissor təyin olundu. Dramaturq Sabit Rəhmanın adı verilən Şəki Dövlət Dram Teatrı öz pərdələrini Vaqif Abbasovun bədii rəhbəri olduğu «Komsomol poeması» (İsgəndər Coşqun) tamaşası ilə açdı. Tamaşa 6 iyul 1976-cı ildə göstərildi.

Bundan sonra Vaqif Abbasov Şəki teatrında Anarın «Adamın adamı» (24 oktyabr 1976) satirik komediyasına, Uilyam Şekspirin «Kral Lir» (4 iyun 1977) faciəsinə, Nəriman Həsənzadənin «İmzalar içində» (1 aprel 1978) epik dramına quruluşlar verib.

1976-cı ilin may ayında Vaqif Abbasovun idarə etdiyi «Jiquli» maşınında Ağarəfi Rəhimov, Gülşad Baxşıyeva və Hüseynağa Atakişiyev Bakıya gəlirdilər. Məqsəd





o idi ki, İncəsənət İnstitutunun aktyorluq fakültəsinin diplom tamaşasına baxıb teatr üçün aktyor və aktrisalar seçsinlər. Şamaxı – Bakı yolunda, çiskinli havada maşınları qəzaya uğradı və ön şüşə çilik-çilik oldu. Maşını şəhərə şüşəsiz sürən Vaqif möhkəm xəstələndi və ayağındakı yaralar yenidən «oyandı». Həkimlər də məsləhət görürdülər ki, bu xəstəliklə ona Şəkidə işləmək olmaz. Ancaq o, inadından dönmədi ki, mən gənc fədailəri yarı yolda qoya bilmərəm.

Yaralar aybaay, günbəgün Vaqifə dəhşətli ağrılar verirdi. 3 mart 1979-cu ildə, Şəki teatrı qısa müddətdə bütün Azərbaycanda şöhrət tapdığı vaxtda məcburiyyət qarşısında Vaqif Abbasov nazirliyin köçürməsi ilə Azərbaycan Dövlət Musiqili Komediya Teatrına baş rejissor təyin olundu.

İlk gündən o, dramaturq Faiq Mustafayevlə bəstəkar Adil Bəbirovun «Yertutanlar» musiqili komediyasının məşqlərinə başlayıb. Paralel olaraq televiziya üçün üç iştirakçıdan ibarət Fridrix Dürrenmattın «Strindberqi oynayırıq» («Ölüm rəqsi») əsərini tamaşaya hazırlayıb (17 sentyabr 1979).

Yaraları günü-gündən ona əzab verdiyi üçün Vaqif Abbasov Moskvaya müalicəyə göndərilib. O, Bakıya bir ayaqsız qayıdıb və ağrıya-ağrıya, əsa ilə məşqlərə gəlib, «Yertutanlar» üzərində işini tamamlayıb. Əsəri müziklope1retta janrında hazırlayıb. Ancaq tamaşanın premye-

rasını görmək ona nəsib olmayıb. Tamaşa Vaqif Abbasov yataqda olanda, 1 mart 1981-ci ildə göstərilib.

Vaqif Abbasov Şəkidən Bakıya qayıdandan sonra Azərbaycan Dövlət İncəsənət İnstitutunun aktyorluq fakültəsində dərs deyib. Üçüncü kurs tələbələri ilə Eduard Olbinin «Dəyyuslar» («Hər şey bağda») pyesini tamaşaya hazırlayıb. Əsər 26 dekabr 1980-ci ildə Abbasmirzə Şərifzadə adına Aktyor evində göstərilib.

Altı illik rejissor yaradıcılığı dövründə canında sümüyə işləyən xəstəlik, qəlbində vulkan püskürən yaradıcılıq ehtirası ilə özünün sənət dəst-xəttini yaradıb. Formalaşdığını görməsə də, ilk addımlarına sevinən teatrın kollektivini ərsəyə gətirə bilib.

Mərd insan, qeyrətli vətəndaş Vaqif Abbasov isə 1981-ci il may ayının 5-də gözlərini əbədi yumub.





## Hüseynağa Atakişiyev
(8.9.1949 – 9.4.2006)



Hüseynağa Ağahüseyn oğlu Atakişiyev 1949-cu il sentyabr ayının 8-də Bakı şəhərində anadan olub. 1971-ci ildə Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsinə daxil olub. 1975-ci ildə isə oranı bitirib.

1975-ci ildə uzun fasilədən (təxminən 26 illik) sonra yenidən bərpa olunan Şəki Dövlət Dram Teatrında aktyor işləməyə göndərilib. Dramatik-psixoloji və zərif yumorlu personajları xüsusi məharətlə oynamağı bacaran Hüseynağa Atakişiyev teatrda bir sıra yaddaqalan rollar ifa edib.

Teatrın baş rejissoru Vaqif Abbasov onun rejissor səriştəsi olduğunu həssaslıqla duyub. Hüseynağa Atakişiyevə sərbəst quruluşçu rejissor kimi bir neçə əsər tapşırılıb. Uğurlu işlərindən sonra o, teatrda quruluşçu rejissor vəzifəsində çalışıb.

Hüseynağa Atakişiyev 1979-cu ildə həmin teatra baş rejissor təyin olunub. 1975 – 1985-ci illərdə hazırladığı tamaşaların bir neçəsi beynəlxalq mükafatlara layiq görülüb. Onun Şəki Dövlət Dram Teatrında quruluş verdiyi əsas tamaşalar.

2 iyul 1976-cı il. «Komsomol poeması», İsgəndər Coşqun.

10 iyul 1976-cı il. «Hacı Qara», Mirzə Fətəli Axundzadə.

13 oktyabr 1976-cı il. «Şirinbala bal yığır», Salam Qədirzadə.

30 noyabr 1976-cı il. «Adamın adamı», Anar.

3 yanvar 1977-ci il. «Əks-səda», Nəbi Xəzri.

30 iyul 1977-ci il. «Aydın», Cəfər Cabbarlı.

3 yanvar 1977-ci il. «Əks-səda», Nəbi Xəzri.

30 iyul 1977-ci il. «Aydın», Cəfər Cabbarlı.

25 dekabr 1977-ci il. «Bir insan ömrü» («Köhnə Arbatın nağılı»), Aleksey Arbuzov.

21 fevral 1978-ci il. «Ustalar», Raço Stoyanov.

12 oktyabr 1978-ci il. «Artıq adam» («Yollara iz düşür»), Bəxtiyar Vahabzadə.

10 noyabr 1978-ci il. «Bağdada putyovka var», Əkrəm Əylisli..

15 yanvar 1979-cu il. «Şəhərin yay günləri», Anar.

6 mart 1979-cu il. «Pələng və kaftar», Şandor Petefi.

8 aprel 1979-cu il. «Artıq tamah», Məmmədiyyə Yusifzadə.





14 iyun 1979-cu il. «Bahalı oğlan», Sergey Mixalkov.

16 dekabr 1979-cu il. «Ezop», Gilerma Fiqeyredo.

26 dekabr 1979-cu il. «Quşu uçan budaqlar», Əkrəm Əylisli.

12 fevral 1980-ci il. «Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə.

25 noyabr 1980-ci il. «Arturo Uinin karyerası», Bertolt Brext.

22 dekabr 1980-ci il. «İstintaq başlanır», Məmməd Çələbiyev.

30 mart 1981-ci il. «Meteor», Fridrix Dürrenmatt.

7 may 1981-ci il. «Hərənin bir ulduzu», Əli Səmədli.

7 noyabr 1981-ci il. «Vəzifə», Əkrəm Əylisli.

25 fevral 1982-ci il. «Ömrün sorağında», Nahid Hacıyev.

27 mart 1982-ci il. «Sizi deyib gəlmişəm», Anar.

29 iyul 1982-ci il. «Adsız ulduz», Mixail Sebastian.

13 sentyabr 1982-ci il. «Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə.

1 noyabr 1982-ci il. «Knyaz», Hüseyn Cavid.

16 dekabr 1982-ci il. «Ona keçəl deyərlər», Olqa Volozova.

10 mart 1983-cü il. «Xatalı Kabul», Məmməd Şəkili.

12 may 1983-cü il. «Teymurləng», Kristafor Marlo.

30 sentyabr 1983-cü il. «Ağ xəstəlik», Karl Çapek.

19 oktyabr 1983-cü il. «Dağlar dağımdır mənim», Camal Yusifzadə.

20 aprel 1984-cü il. «Romeo və Cülyetta», Uilyam Şekspir.

25 may 1984-cü il. «Tilsimli dairə», Eldəniz Quliyev.

28 oktyabr 1984-cü il. «Bəxt üzüyü», Vaqif Səmədoğlu.

21 dekabr 1984-cü il. «Hamam hamam içində», Rəhman Əlizadə.

İstedadlı rejissor bir neçə tamaşanı da Vaqif Abbasovla birlikdə hazırlayıb.

Əsasən rejissor kimi çalışan sənətkar Şəki teatrında Bəxtiyar («Komsomol poeması», İsgəndər Coşqun), Heydər bəy («Hacı Qara», Mirzə Fətəli Axundzadə), İsmayıl («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Knyaz («Knyaz», Hüseyn Cavid), Qaynar («Əks-səda», Nəbi Xəzri), Edqar («Kral Lir», Uilyam Şekspir), Aydın («Aydın», Cəfər Cabbarlı), Kuzma Balyasnikov («Bir insan ömrü», yaxud «Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), Qiyas Zeynallı («Şəhərin yay günləri», Anar), İsmayıl («Dağlar dağımdır mənim», Camal Yusifzadə), Murtuz müəllim («Uca dağ başında», Vaqif Səmədoğlu), Volfqan Şvitter («Meteor», Fridrix Dürrenmatt), Arturo Ui («Arturo Uinin karyerası», Bertolt Brext) rollarını ifa edib.

Hüseynağa Atakişiyev 1984-cü il mart ayının 24-də Akademik Milli Dram Teatrında Bəxtiyar Vahabzadənin «Fəryad» dramını tamaşaya hazırlayıb. Gənc sənətkar bir il sonra AMDT-na baş rejissor təyin olunub. Bu kollektivdə bir çox yaddaqalan tamaşalar hazırlayıb.





1989-cu ildə Dövlət Gənclər Teatrını yaradıb və ömrünün sonuna kimi bu kollektivə rəhbərlik edib.

«Üzeyir ömrü» (Üzeyir Hacıbəyli) filminə çəkilib.

Hüseynağa Atakişiyev forma əlvanlığına meyil göstərən rejissor idi.

O, klassik və müasir əsərlərin tamaşalarında mövzu-problematikaya uyğun olaraq cazibəli formalar tapa bilirdi.

Maraqlı tərcümə əsərlərini tamaşaya hazırlamaqla teatra yeni-yeni janr estetikası gətirib.

Bir sıra yazıçıların teatr sənətinə gəlməsi və dramaturgiya ilə məşğul olması üçün səylə çalışıb.

Hüseynağa Atakişiyev 1 dekabr 1982-ci ildə Azərbaycan Respublikasının Əməkdar incəsənət xadimi fəxri adı ilə təltif edilib.

İstedadlı aktyor və rejissor 9 aprel 2006-cı ildə Bakıda vəfat edib.



## Cahangir Novruzov
(31 iyul 1954)

Aktyor, rejissor, pedaqoqdur.

Cahangir Mütəllib oğlu Novruzov Azərbaycan realist aktyor məktəbinin banisi Cahangir Zeynalovun nəvəsi, məşhur komediya ustası Nəsibə Zeynalovanın oğludur. 1954-cü il iyul ayının 31-də Bakıda doğulub. 1971 – 1976-cı illərdə Azərbaycan Dövlət İncəsənət İnstitutunun rejissorluq fakültəsində təhsil alıb. Kurs rəhbərləri SSRİ xalq artisti Mehdi Məmmədov olub. Diplom işi Azərbaycan Dövlət Musiqili Komediya Teatrında hazırladığı «Qız anası» (Georgi Xuqayev və Ovanov) əsəri idi. Təyinatını bu teatra veriblər. Hərbi xidmətdən (1976 – 1977) qayıtdıqdan sonra 1979-cu ildə Şəki Dövlət Dram Teatrına quruluşçu rejissor təyin edilib. 1981 – 1983-cü illərdə Moskvadakı Malaya Bronnaya Teatrının





baş rejissoru Anatoli Efrosun yanında sənət təcrübəsi keçib. 1984-cü ildə Sankt-Peterburq Böyük Dram Teatrının baş rejissoru Georgi Tovstonoqovun yaradıcılıq laboratoriyasında çalışıb.

Belə zəngin təcrübə toplayan Cahangir Novruzov Şəki Dövlət Dram Teatrında (31 yanvar 1984 – 17 yanvar 1989), Musiqili Komediya Teatrında (18 yanvar 1989 – 28 aprel 1990), Gənc Tamaşaçılar Teatrının rus bölməsində (1990) baş rejissor işləyib. 1995-ci il dekabr ayının 4-dən Türkiyədə pedaqoji fəaliyyət göstərir. Uzun illərdir Adana şəhəri Çuxurova Universiteti Dövlət Konservatoriyasında aktyor və rejissor sənətindən dərs deyir.

Rejissor-aktyorun Şəki teatrında ifa etdiyi əsas rollar: Tarverdi («Xırs quldurbasan», Mirzə Fətəli Axundzadə), Kərəmov («Toy», Sabit Rəhman), Əhməd Biqəm («Adamın adamı», Anar), Aktyor və Şiyt («Arturo Uinin karyerası», Bertolt Brext), Möhtəşəm Müqeym («Meteor», Fridrix Dürrenmatt), Quqqulu müəllim («Uca dağ başında», Vaqif Səmədoğlu), Arçil Qavaşeli («Çinari manifesti», Aleksandr Çxeidze), Vaxtanq («İkimərtəbəli adam», Fikrət Qoca).

Şəki Dövlət Dram Teatrında baş rejissor işləyib (1 yanvar 1984 – 18 yanvar 1989). Cahangir Novruzovun Şəki teatrında quruluş verdiyi əsas tamaşalar.

30 iyun 1980-ci il. «Kəndimizin narları», Rəhman Əlizadə.

27 yanvar 1981-ci il. «Hökm», Məmməd Şəkili.

31 may 1981-ci il. «Aşnalar», Sabit Rəhman.

17 iyun 1983-cü il. «Toy», Sabit Rəhman.

20 fevral 1985-ci il. «Lunin və Jakın ölümü», Edvard Radzinski.

20 may 1985-ci il. «Mənim qaynanam və ya evlənmə əhvalatı», Georgi Xuqayev.

21 oktyabr 1985-ci il. «Xoşbəxtlər», Sabit Rəhman.

2 fevral 1986-cı il. «Çinari manifesti», Aleksandr Çxeidze.

28 dekabr 1986-cı il. «Dar ağacı», Bəxtiyar Vahabzadə.

23 may 1987-ci il. «Müsyö Jordan və dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə.

27 oktyabr 1987-ci il. «İkimərtəbəli adam», Fikrət Qoca.

27 dekabr 1987-ci il. «Axşam dərsi», Ramiz Rövşən.

21 aprel 1989-cu il. «Yayda qartopu oyunu», Vaqif Səmədoğlu.

Azərbaycan Televiziyasında hazırlanmış Vaqif Səmədoğlunun «Yaşıl eynəkli adam» (Cahangir), Üzeyir bəy Hacıbəylinin felyetonları əsasında «Ordan-burdan» (Salman bəy), Aqşin Babayevin «Dəvətnamə» (Əzizağa), Əbdürrəhim bəy Haqverdiyevin «Ac həriflər» (Aktyor və Dərviş) televiziya tamaşalarında oynayıb.

Cahangir Novruzov 4 iyul 2011-ci ildə Azərbaycan Respublikasının Əməkdar incəsənət xadimi fəxri adı ilə təltif edilib.





## Mərdan Feyzullayev
(3 fevral 1959)



Realist teatr estetikasında işləməyə üstünlük verir. Bəzi tamaşalarında çağdaş avanqard teatr poetikasının elementlərindən də istifadə edir.

Daha çox aktyor tamaşası hazırlamağa çalışır.

Mərdan Əhmədiyyə oğlu Feyzullayev 3 fevral 1959-cu ildə Şəkinin Kiş kəndində doğulub. 1973-cü ildən məktəbin dram dərnəyində çıxışlar edib. Kənd orta məktəbini bitirərək Şəki Dövlət Dram Teatrının yardım heyətində aktyor kimi çalışıb. 1977 – 1979-cu illərdə hərbi xidmətdə olub. 1979 – 1983-cü illərdə Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyorluğu fakültəsində təhsil alıb. Təyinatla Şəki teatrına göndərilib. Vasili Şukin adına Moskva Ali Teatr Məktəbinin rejissorluq fakültəsində qiyabi oxuyub

(1984 – 1989). 1989 – 1994-cü illərdə Şəki teatrının baş rejissoru işləyib.

İstedadlı rejissor 2011-ci il iyul ayının 4-də Azərbaycan Respublikasının Əməkdar artisti fəxri adı ilə təltif olunub.

Mərdan Feyzullayevin Şəki Dövlət Dram Teatrında quruluş verdiyi əsas tamaşalar.

29 dekabr 1985-ci il. «Kələntər hərəkatı», R.Xəlilzadə

12 fevral 1986-cı il. «Duel», Mar Bayciyev.

19 aprel 1986-cı il. «Əsrə bərabər gün», Çingiz Aytmatov.

28 dekabr 1986-cı il. «Dar ağacı», Bəxtiyar Vahabzadə.

30 dekabr 1986-cı il. «Biri vardı, biri yox idi», Namiq Abdullayev.

9 oktyabr 1987-ci il. «Sən Qara deyilsən», Əziz Nesin.

3 may 1988-ci il. «Kürən yabı», İon Drutse.

3 oktyabr 1988-ci il. «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə.

22 mart 1989-cu il. «Ustad və Marqarita», Mixail Bulqakov.

22 aprel 1989-cu il. «Yayda qartopu oyunu», Vaqif Səmədoğlu.

28 dekabr 1989-cu il. «Dəli yığıncağı», Cəlil Məmmədquluzadə.

26 sentyabr 1990-cı il. «Şah, ya qeyri-şah, şah elə şahdır», Saadalla Vannus.





20 aprel 1991-ci il. «Təhminə və Zaur», Anar.

7 mart 1992-ci il. «Gurultulu məhəbbət», Salam Qədirzadə.

10 dekabr 1992-ci il. «İblis», Hüseyn Cavid.

17 fevral 1993-cü il. «Dəli Domrul», Altay Məmmədov.

Mərdan Feyzullayev 1994-cü ildən Moskvada yaşayır. Moskva Komediya Teatrında, Simonov adına Moskva Dram Teatrında, «Səməndər quşu» Kukla Teatrında rejissor işləyib. 2009-cu ildə Moskvada «Dərviş» teatrı açıb. Bu teatrda Mirzə Fətəli Axundzadənin «Lənkəran xanının vəziri», Elçinin «Şekspir», Üzeyir bəy Hacıbəylinin «Arşın mal alan», Bəxtiyar Vahabzadənin «Gülüstan» (monotamaşa), Nizami Gəncəvinin və Məhəmməd Füzulinin eyniadlı poemaları əsasında «Leyli və Məcnun» əsərlərini tamaşaya hazırlayıb.

Dəvətlə Rusiya Federasiyasının müxtəlif teatrlarında tamaşalara rejissorluq edib. 4 noyabr 2010-cu ildə Rusiya Federasiyasının «Vətən qarşısında xidmətlərinə görə» medalına layiq görülüb.



## Mirbala Səlimli
(5 aprel 1963)

Yaradıcılığa aktyorluqla başlayan Mirbala Seyidəsgər oğlu Səlimli 1963-cü il aprel ayının 5-də indiki Hacıqabul rayonunun Qubalıbaloğlan kəndində doğulub. 2004-cü ilə kimi soyadı «Səlimov» yazılıb. 1970 – 1980-ci illərdə kənd orta məktəbində təhsil alıb. 13 yaşından dram dərnəyində həvəskar aktyorluq edib. 1978-ci ildən rayon xalq teatrının üzvü olub. Mirzağa Əliyev adına Azərbaycan Dövlət İncəsənət İnstitutunun dram və kino aktyoru fakültəsində təhsil alıb (1981 – 1985). Sənət müəllimi xalq artisti Şəfiqə Məmmədova olub. Ali məktəbi fərqlənmə diplomu ilə bitirərərək Sabit Rəhman adına Şəki Dövlət Dram Teatrına təyinat alıb. Boris Şukin adına Moskva Ali Teatr Məktəbində rejissor təhsilinə yiyələnib (1990 – 1995) və Şəkiyə qayıdaraq doğma kollektivdə quruluşçu rejissor işləyib. 1999 – 2001-ci





illərdə Moskva Ali Ssenaristlər və Rejissorlar kursunun kino rejissorluğu sinfini bitirib. Müəllimi məşhur rus kinorejissoru Aleksey German olub.

2000-ci ildən Moskvanın «Mir iskusstva» yaradıcılıq birliyi ilə əməkdaşlıq edir. 15-ə qədər sənədli film çəkib. 2002-ci ildə «Azərbaycanfilm»in «Debüt» studiyasında «Odla qol-boyun» qısametrajlı bədii filmini lentə alıb. «Yaddaş» sənədli filmlər studiyasında «Şəki – tarixin naxışları» (2007), Rusiyanın «Savonarola» studiyasında «Olviya – xoşbəxtlik misteriyası» sənədli filmini çəkib (2010). Rusiya («Vaytmedia») və Azərbaycanın («Azərbaycanfilm») birgə istehsalı olan «Qırmızı bağ» filmi üzərində yaradıcılıq işini 2015-ci ilin əvvəllərində tamamlayıb.

İstedadlı sənətkar 1997-ci ildən Şəki Dövlət Dram Teatrının baş rejissorudur. 9 may 2012-ci ildə Azərbaycan Respublikasının Əməkdar incəsənət xadimi fəxri adı ilə təltif olunub. Azərbaycan Teatr Xadimləri İttifaqının «Qızıl Dərviş» mükafatı laureatıdır (2009). Onun quruluş verdiyi «Sevgililərin cəhənnəmdə vüsalı» (İlyas Əfəndiyev) tamaşası Mədəniyyət və Turizm Nazirliyinin «Zirvə» mükafatına layiq görülüb (2015). «...Və dəyirman dönərdi» (Haldun Taner) tamaşasına görə dramaturqun adına təsis edilmiş medalla təltif olunub (2015).

Mirbala Səlimlinin Şəki Dövlət Dram Teatrında quruluş verdiyi əsas tamaşalar:

17 mart 1989-cu il. «Şirəbənzər», Rüstəm İbrahimbəyov.

20 oktyabr 1994-cü il. «Toros canavarı», Əziz Nesin.

2 iyun 1995-ci il. «Ay tutulan gecə», Mustay Kərim.

5 noyabr 1996-cı il. «Salam, Molla Nəsrəddin!», Leonid Solovyov və Viktor Vitkoviç.

2 oktyabr 1997-ci il. «Bayramın birinci günü», Nazim Hikmət.

28 fevral 1998-ci il. «Dəmir qadın», Şərəf Başbəyov.

4 sentyabr 1998-ci il. «Bala, başa bəla», Əli Əmirli.

31 avqust 1999-cu il. «Hacı Qara», Mirzə Fətəli Axundzadə.

30 aprel 2000-ci il. «Mahir aradüzəldənlər», Xose Eçeqaray.

30 aprel 2001-ci il. «Sindibadın xoşbəxtlik adasına səyahəti», Rəhman Əlizadə.

12 may 2002-ci il. «Ruhlar», Eduardo de Filippo.

14 mart 2003-cü il. «Xoşbəxt hadisə», Slavomir Mrojek.

2 oktyabr 2003-cü il. «Molla Nəsrəddinin sərgüzəştləri», Leonid Solovyov və Viktor Viktoviç.

28 fevral 2004-cü il. «Oyuncaq ev», Henrik İbsen.

11 mart 2005-ci il. «Yağışdan çıxdıq, yağmura düşdük», Nəcəf bəy Vəzirov.

16 mart 2008-ci il. «Xəsis», Jan Batist Molyer.





14 may 2009-cu il. «Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev.

23 noyabr 2009-cu il. «Ay tutulan gecə», Mustay Kərim.

19 sentyabr 2011-ci il. «Aldadılmış ər» («Jorj Danden»), Jan Batist Molyer.

1 iyun 2012-ci il. «Hacı Qara», Mirzə Fətəli Axundzadə.

14 fevral 2014-cü il. «Mahir aradüzəldənlər», Xose Eçeqaray.

22 iyul 2014-cü il. «Sevgililərin cəhənnəmdə vüsalı», İlyas Əfəndiyev.

19 dekabr 2015-ci il. «...Və dəyirman dönərdi», Haldun Taner.

Əsasən rejissor kimi çalışan istedadlı sənətkar Şəki teatrında Azad («Dağlar səsləyir məni», Gültəkin Bakıxanova), Oğlan («Avtobus», Stanislav Stratiyev), Rəhim («Axşam dərsi», Ramiz Rövşən), Yaralı zabit («İblis», Hüseyn Cavid), Məkkə Məhəmməd və Hacı İslam, Naçalnik və İnspektor («Dəli yığıncağı» və «Danabaş kəndinin məktəbi», Cəlil Məmmədquluzadə), Ryuxin («Ustad və Marqarita», Mixail Bulqakov), Şəkər («Körpü», İsi Məlikzadə), Əmir («Yayda qartopu oyunu», Vaqif Səmədoğlu) rollarını ifa edib.

Mirbala Səlimlinin rejissurası bitkin kompozisiyası və estetik cazibədarlığı ilə seçilir.

Fəlsəfi dərinliyə, psixoloji mükəmməlliyə, fikir aydınlığına meyillidir.

Komediya əsərlərinə verdiyi quruluşda milli gülüş estetikasından ustalıqla istifadə edir.

Mirbala Səlimli idrak rejissorudur. Onun tamaşalarında yaradıcılıq axtarışlarının mayasını təfəkkürün diqtəsi təşkil edir.

Rejissor konsepsiyasının əsasında psixoloji-realist teatr estetikası durur.

Çox romantik faciə və kəskin mövzulu dramların tamaşalarında da rejissor kimi psixoloji məntiqi güclüdür və aparıcılığı öz üzərinə götürür.

Janr əlvanlığına meyilli sənətkardır. Amma və di gəl ki, hər janrın öz estetikasına və öz poetika səciyyələrinə tam tələbkarlıqla yanaşır. Bəzən qarışıq janrda da tamaşa hazırlayır və bu prosesdə ölçü hissini həssaslıqla qoruyur.

Quruluş verdiyi əsərlərin sırf rejissor, ya sırf aktyor tamaşası olduğunu dəqiq söyləmək çətindir. Çünki bu iki estetik prinsipin tarazlığını quruluş verdiyi tamaşalarda həssaslıqla saxlaya bilir.

Mirbala Səlimlinin tamaşalarında, janrından asılı olmayaraq, poetik ciddiliyin ahəngdar cazibəsi var.

Pyes üzərində yaradıcılıqla və janrın tələb etdiyi estetik prinsiplərin xarakterik səciyyələri ilə işləməyə üstünlük verir.

Təhlilə tam çəkmədiyi, səhnə obrazını dəqiq müəyyənləşdirmədiyi, janr estetikasını məntiqi əsaslarla təsdiqləmədiyi əsərin məşqinə başlamır.





Məşq prosesində aktyorlarla bədii materialın psixoloji təhlilinə xeyli vaxt ayırır. Aktyorlar onun fikrini və müəyyənləşdirdiyi ali məqsədi mənimsədikdən sonra tamaşanın ayrı-ayrı səhnələrini məşq edirlər.

Mirbala Səlimlinin tamaşalarında həmişə bütövlük, fikir tamlığı, obrazlılıq hakimdir. O, tamaşanın rəssamı, bəstəkarı və ya musiqi tərtibatçısı ilə də həmin prinsipdə işləyir.

# RƏSSAMLAR



Qüdrət Məmmədov
(12 dekabr 1936)

Obrazlı düşüncə qabiliyyətinə malikdir. Tərtibatlarında rejissor ideyasının, tamaşanın ali məqsədinin estetik səciyyələri özünün ifadəli təcəssümünü tapır. Səhnədə məkan və zaman xronotopunun əsas prinsiplərini həssaslıqla gözləyir.

Rəssam səhnəqrafiyanın klassik milli ənənələri ilə avanqard teatr estetikasını həssaslıqla qovuşdura bilir.





Qüdrət Hacıbəy oğlu Məmmədov 12 dekabr 1936-cı ildə Şəkidə doğulub. Yeddinci sinfi bitirərək 1952 – 1957-ci illərdə Əzim Əzimzadə adına Bakı Rəssamlıq Məktəbində oxuyub. 1957 – 1964-cü illərdə Xarkov Dövlət Rəssamlıq İnstitutunda ali ixtisas təhsili alıb. Gəncə Dövlət Pedaqoji İnstitutunda assistent (1964 – 1965), müəllim (1970 – 1973), Gəncə şəhərinin baş rəssamı (1965 – 1970), Şəkidəki Füzuli adına parkda baş rəssam (1973 – 1975) işləyib. 4 iyul 1975-ci ildə Şəki Dövlət Dram Teatrına baş rəssam götürülüb. Son illərdə təqaüdə çıxana kimi bu vəzifədə çalışıb.

Rəssam Qüdrət Məmmədovun klassik və çağdaş Azərbaycan dramaturqlarının əsərlərinin tamaşalarına verdiyi bədii tərtibat: «Müsyö Jordan və dərviş Məstəli şah», «Hacı Qara», «Lənkəran xanının vəziri» (Mirzə Fətəli Axundzadə), «Dəli yığıncağı» (Cəlil Məmmədquluzadə), «İblis» (Hüseyn Cavid), «Yalan», «Nişanlı qız», «Toy», «Xoşbəxtlər» (Sabit Rəhman), «Qonşu qonşu olsa, kor qız ərə gedər» (Rəşid bəy Əfəndizadə), «Bağdada putyovka var», «Vəzifə», «Quşu uçan budaqlar» (Əkrəm Əylisli), «Təhminə və Zaur», «Adamın adamı» (Anar), «Ömrün sorağında» (Nahid Hacıyev), «Əks-səda» (Nəbi Xəzri), «Körpü» (İsi Məlikzadə), «Dar ağacı» (Bəxtiyar Vahabzadə), «Komsomol poeması» (İsgəndər Coşqun. Səməd Vurğunun eyniadlı poeması əsasında), «Şirinbala bal yığır» (Salam Qədirzadə), «İstintaq» (Rüstəm İbrahimbəyov), «Onun iki qabırğa-

sı» (Əli Əmirli), «Hərənin bir ulduzu» (Əli Səmədli), «Uca dağ başında», «Yayda qartopu oyunu», «Bəxt üzüyü» (Vaqif Səmədoğlu), Sindibadın xoşbəxtlik adasına səyahəti», «Hamam hamam içində», «Dadaşbala əməliyyatı» (Rəhman Əlizadə), «Çələbi xan» (Mahmud İsmayılov və Oqtay Salamzadə), «İmzalar içində» (Nəriman Həsənzadə), «Hökm» (Məmməd Şəkili), «Bankir adaxlı» (Tamara Vəliyeva).

Tərcümə pyeslərinin tamaşalarına verdiyi səhnə tərtibatı: «Pələng və kaftar» (Şandor Petefi), «Avtobus» (Stanislav Stratiyev), «Ustad və Marqarita» (Mixail Bulqakov), «Toros canavarı» (Əziz Nesin), «Napoleon» (Ferdinand Brukner), «Salam, Molla Nəsrəddin!» (Leonid Solovyov və Viktor Viktoviç), «Bayramın birinci günü» (Nazim Hikmət), «Teymurləng» (Kristafor Marlo), «Ağ xəstəlik» (Karl Çapek), «Kral Lir», «Romeo və Cülyetta» (Uilyam Şekspir), «Aldadılmış ər» («Jorj Danden». Jan Batist Molyer), «Ezop» (Gilerma Fiqeyredo), «Əsrə bərabər gün» (Çingiz Aytmatov), «Dərviş və ölüm» (Meşa Səlimoviç), «Çiy yumurta, bişmiş məhəbbət» (Georgi Xuqayev), «Adsız ulduz» (Mixail Sebastian), «Bir insan ömrü» («Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Ustalar» (Raço Stoyanov), «Meteor» (Fridrix Dürrenmatt), «Adsız ulduz» (Mixail Sebastian), «Tələ» (Rober Toma).





## Söhrab Ərəbov
(10 oktyabr 1945)



Tamaşa üçün seçdiyi formalarda sadəliyə və rəmzi ifadə vasitələrinə üstünlük verir.

Onun rəssamı olduğu istər monumental-romantik klassik, istərsə də məişət mövzulu çağdaş əsərlərin tamaşalarında səhnə aktyorlara ən mürəkkəb mizanları da həssaslıqla icra etmələri üçün geniş imkanlar yaradır.

Tərtibat aktyorlara mane olmur və eyni zamanda, rejissorun fikrini obrazlı reallıqla ifadə edir.

Söhrab Əfəndi oğlu Ərəbov 10 oktyabr 1945-ci ildə Şəkidə anadan olub. 1965-ci ildə şəhərdəki 10 saylı orta məktəbi bitirib. Üç il hərbi xidmətdə olub. 1971-ci ildə Əzim Əzimzadə adına Bakı Rəssamlıq Məktəbinə daxil olub. 1973-cü ildə təhsilini yarımçıq qoyub. 16 oktyabr 1976-cı ildən Şəki Dövlət Dram Teatrında rəssam işləyir.

Rəssam Söhrab Ərəbovun klassik və çağdaş Azərbaycan dramaturqlarının əsərlərinin tamaşalarına verdiyi

bədii tərtibat: «Xırs quldurbasan», «Molla İbrahimxəlil kimyagər», «Hacı Qara» (Mirzə Fətəli Axundzadə), «Yağışdan çıxdıq, yağmura düşdük» («Hacı Qənbər», Nəcəf bəy Vəzirov), «Pəri cadu» (Əbdürrəhim bəy Haqverdiyev), «Danabaş kəndinin məktəbi» (Cəlil Məmmədquluzadə), «Aydın» (Cəfər Cabbarlı), «Bir saat xəlifəlik» (Abdulla Şaiq), «Knyaz» (Hüseyn Cavid), «Cəzasız günah» və «Artıq adam» («Yollara iz düşür», Bəxtiyar Vahabzadə), «Sizi deyib gəlmişəm», «Şəhərin yay günləri» (Anar), «Sevgililərin cəhənnəmdə vüsalı» (İlyas Əfəndiyev), «Poçt şöbəsində xəyal» (Elçin), «Dağlar dağımdır mənim» (Camal Yusifzadə), «Artıq tamah» (Məmmədiyyə Yusifzadə), «Axşam dərsi» (Ramiz Rövşən), «Dağlar səsləyir məni» (Gültəkin Bakıxanova), «İstintaq başlanır» (Məmməd Çələbiyev), «Evlərin axşamları» (Arif Abdullazadə), «Günəş küləyi» (Ramiz Heydər), «Tilsimli dairə» (Eldəniz Quliyev), «İkimərtəbəli adam» (Fikrət Qoca), «Xatalı Kabul» (Məmməd Şəkili), «Doğmalar», «Kəndimizin narları» (Rəhman Əlizadə), «Aşnalar» (Sabit Rəhman), «Şirəbənzər» (Rüstəm İbrahimbəyov), «Gurultulu məhəbbət» (Salam Qədirzadə), «Dəli Domrul» (Altay Məmmədov), «Toyda Çelentano oynayır» (Əli Səmədli), «Bala, başa bəla» (Əli Əmirli), «Gecə yarısından sonra elçilik» (Novruz Cəfərov), «Məni qınamayın» (Hidayət).

Tərcümə pyeslərinin tamaşalarına verdiyi səhnə tərtibatı: «Ruhlar» (Eduardo de Filippo), «Xoşbəxt hadisə» (Slavomir Mrojek), «Halallıq» (Valentin Rasputin), «Bahalı oğlan» (Sergey Mixalkov), «Sən Qara deyilsən» (Əziz Nesin), «Kürən yabı» (İon Drutse), «Mahir aradüzəldənlər» (Xose Eçeqaray), «Ayı» (Anton Çexov), «Lunin və Jakın ölümü», (Edvard Radzinski), «Elbrus evlənir», (Georgi Xuqayev), «Duel» (Mar Bayciyev), «Çox gülməli faciə» (Əziz Nesin), «Dəmir qadın» (Şərəf Başbəyov), «Molla Nəsrəddinin sərgüzəştləri» (Leonid Solovyov və Viktor Viktoviç), «Oyuncaq ev» (Henrik İbsen), «Xəsis» (Jan Batist Molyer), «Kral ölür...» (Ejen İonesko), «Ay tutulan gecə» (Mustay Kərim).





* * *

Rayon teatrları içərisində Şəki kollektivi bəstəkarlarla işləməyə üstünlük verən, tamaşalara daha çox orijinal musiqi yazdıran sənət ocaqlarındandır. Teatr bərpadan sonrakı dövrdə xüsusən Emin Sabitoğlu, Aydın Əzimov və Cavanşir Quliyevlə daha sıx yaradıcılıq əlaqələri saxlayıb. Şəki teatrının əksər tamaşalarına bəstələnən musiqi səhnə əsərinin atribut-obrazına çevrilir. Nəticədə tamaşadan alınan estetik təəssürat daha da dərinləşir.

*Emin Sabitoğlunun musiqi bəstələdiyi tamaşalar:* «Aşnalar», «Yalan», «Xoşbəxtlər», «Toy» (Sabit Rəhman), «Adamın adamı» (Anar), «Artıq tamah» (Məmmədiyyə Yusifzadə), «İmzalar içində» (Nəriman Həsənzadə), «Uca

dağ başında» (Vaqif Səmədoğlu), «Kəndimizin narları» (Rəhman Əlizadə), «İkimərtəbəli adam» (Fikrət Qoca).

*Aydın Əzimovun musiqi bəstələdiyi tamaşalar:* «Lənkəran xanının vəziri» (Mirzə Fətəli Axundzadə), «Knyaz» (Hüseyn Cavid), «Bəxt üzüyü», «Yayda qartopu oyunu» (Vaqif Səmədoğlu), «İblis» (Hüseyn Cavid), «Toyda Çelentano oynayır» (Əli Səmədli), «Artıq adam» («Yollara iz düşür», Bəxtiyar Vahabzadə), «Quşu uçan budaqlar», «Bağdada putyovka var» (Əkrəm Əylisli), «Hamam hamam içində» (Rəhman Əlizadə), «Dağlar dağımdır mənim» (Camal Yusifzadə), «Bir insan ömrü» («Köhnə Arbatın nağılı», Aleksey Arbuzov), «Ustalar» (Raço Stoyanov), «Pələng və kaftar» (Şandor Petefi), «Arturo Uinin karyerası» (Bertolt Brext), «Meteor» (Fridrix Dürrenmatt), «Teymurləng» (Kristafor Marlo), «Ağ xəstəlik» (Karl Çapek), «Ayı» (Anton Çexov), «Romeo və Cülyetta» (Uilyam Şekspir), «Arvadımın əri», «Elbrus evlənir» (Georgi Xuqayev), «Əsrə bərabər gün» (Çingiz Aytmatov), «Avtobus» (Stanislav Stratiyev), «Napoleon» (Ferdinand Brukner).

*Cavanşir Quliyevin musiqi bəstələdiyi tamaşalar:* «Xırs quldurbasan», «Müsyö Jordan və dərviş Məstəli şah» (Mirzə Fətəli Axundzadə), «Bir saat xəlifəlik» (Abdulla Şaiq), «Sizi deyib gəlmişəm», «Şəhərin yay günləri» (Anar), «Poçt şöbəsində xəyal» (Elçin), «Evlərin axşamları» (Arif Abdullazadə), «Hökm» (Məmməd Şəkili),





«Hərənin bir ulduzu» (Əli Səmədli), «Tıq-tıq xanım», «Sindibadın xoşbəxtlik adasına səyahəti», «Doğmalar», «Dadaşbala əməliyyatı» (Rəhman Əlizadə), «İstintaq» (Rüstəm İbrahimbəyov), «Gurultulu məhəbbət» (Salam Qədirzadə), «Axşam dərsi» (Ramiz Rövşən), «Bahalı oğlan» (Sergey Mixalkov), «Halallıq» (Valentin Rasputin), «Adsız ulduz» (Mixail Sebastian), «Lunin və Jakın ölümü» (Edvard Radzinski), «Dərviş və ölüm» (Meşa Səlimoviç), «Ustad və Marqarita» (Mixail Bulqakov), «Ay tutulan gecə» (Mustay Kərim), «Adsız ulduz» (Mixail Sebastian).

Adil Bəbirov «Kral Lir» (Uilyam Şekspir), «Aydın» (Cəfər Cabbarlı), «Danabaş kəndinin məktəbi» (Cəlil Məmmədquluzadə), Eldar Mansurov «Dar ağacı» (Bəxtiyar Vahabzadə), «Kürən yabı» (İon Drutse), «Çələbi xan» (Mahmud İsmayılov və Oqtay Salamzadə), Soltan Hacıbəyov («Dəli yığıncağı», Cəlil Məmmədquluzadə), Xəyyam Mirzəzadə «Məni qınamayın» (Hidayət) pyeslərinin tamaşalarına musiqi yazıblar.

* * *

Şəki teatrı, ayrı-ayrı illərdə müəyyən yaradıcılıq tərəddüdlərinə, axsamalarına baxmayaraq, həmişə müasirliyə, repertuar əlvanlığına, kollektivin sanballı tərkibinə can atmışdır. Teatrın kollektivinin yaradıcılıq ehtirası bu gün də güclüdür, coşqundur, məqsəd-

yönlüdür. Səmərəli forma və məzmun, janr və üslub axtarışlarında qətiyyətli və inamlıdır. Təbii ki, bu inamın əsasında sənətə münasibətləri ehtiram və məhəbbət üzərində köklənən səmimi truppa və onun da önündə kollektivin bədii rəhbəri durur.

*11.11.2015 – 29.12.2015*





## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT


1. Tamaşaçı. «Həyat». – «Nuxa fəhləsi», 14 mart 1938.
2. S.Məmmədzadə. «Həyat». – «Nuxa fəhləsi», 23 noyabr 1939.
3. B.Sadıq. «Hacı Qara». – «Nuxa fəhləsi», 30 iyul 1938.
4. İki tamaşaçı. Gülər üzlü xalqımızın şən operettası. – «Nuxa fəhləsi», 16 aprel 1938.
5. «Nuxa fəhləsi», 20 iyul 1938.
6. Cəmil Ağalarov. «Vətən namusu». – «Nuxa fəhləsi», 11 dekabr 1938.
7. Z.Zeynallı. Nuxa Dövlət Dram Teatrı yeni mövsümdə. – «Nuxa fəhləsi», 3 iyun 1938.
8. M.Cabbarov. «Toy» hazırlanır. – «Nuxa fəhləsi», 27 yanvar 1940.
9. «Toy» komediyası Nuxa Sabir adına DDT-da. – «Nuxa fəhləsi», 23 fevral 1940.

10. Sadıq Babayev. «1905-ci ildə» pyesasının yeni quruluşu haqqında. – «Nuxa fəhləsi», 15 yanvar 1941.

11. «1905-ci ildə» pyesinin yeni quruluşu. – «Nuxa fəhləsi», 15 yanvar 1941.

12. Ə.Rəşidov «Aşnalar». – «Nuxa fəhləsi», 11 yanvar 1946.

13. M.Arif. «İntizar». – «Kommunist», 3 noyabr 1945.

14. Rza Şahvələd. Nuxa Dövlət Dram Teatrında. – «Kommunist», 17 iyul 1946.

15. Ə.Rəşidov, Z. Zeynallı. «Qız qalası». – «Nuxa fəhləsi», 24 aprel 1946.

16. Z.Zeynallı. «Gözün aydın». – «Nuxa fəhləsi», 17 aprel 1947.

17. Z.Zeynallı. «Bayram günü». – «Nuxa fəhləsi», 14 noyabr 1948.

18. Cəfər Xəndan. Xalq teatrının ilk addımları. – «Kommunist» qəzeti, 31 yanvar 1960.

19. Əsəd Məmmədov. Şəki teatrının «dörd» sirri... – «Ədəbiyyat və incəsənət», 16 oktyabr 1976.





BAŞLIQLAR

